# AZƏRBAYCAN KLASSİK ƏDƏBİYYATINDAN SEÇMƏLƏR

ÜÇ CİLDDƏ

III CİLD

**XVII-XVIII ƏSRLƏR AZƏRBAYCAN ŞERİ**

"ŞƏRQ-QƏRB"
BAKI-2005

*Bu kitab "Azərbaycan klassik ədəbiyyatı kitabxanası.*
*XVII-XVIII əsrlər Azərbaycan ədəbiyyatı. İyirmi clddə. VI cild"*
(*Bakı, Elm, 1988*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Cahangir Qəhrəmanov**

Redaktoru: **Araz Dadaşzadə**

**894.361 - dc 21**
**AZE**
**Azərbaycan klassik ədəbiyyatından seçmələr.** Üç cilddə. III cild. Bakı, "Şərq-Qərb", 2005, 456 səh.

XVII-XVIII əsrlər Azərbaycan ədəbiyyatı əvvəlki dövrlər poeziyasından bir sıra özünəməxsus cəhətləri ilə seçilir. Bu dövr poeziyası bir tərəfdən klassik ədəbiyyatın mütərəqqi ənənələrinə bağlılığı, digər tərəfdən də tükənməz xalq yaradıcılığının zəngin təcrübəsinə əsaslanaraq həyata, insana, ictimai mühitə aydın münasibət göstərməsi, sadəliyi və xalq həyatına daha dərindən nüfuz edə bilməsi ilə səciyyələnir.

"Azərbaycan klassik ədəbiyyatından seçmələr"in təqdim olunan cildinə Saib Təbrizi, Vaqif, Vidadi, Qövsi Təbrizi və digər şairlərin əsərlərindən ən yaxşı nümunələr daxil edilmişdir.

**ISBN 9952-418-54-7**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# MÜQƏDDİMƏ

XVII-XVIII əsrlər Azərbaycan ədəbiyyatı bir sıra özünəməxsus xüsusiyyətləri ilə əvvəlki dövrlər poeziyasından fərqlənir. Bu əsrlərdə ədəbiyyat bir tərəfdən klassik poeziyanın mütərəqqi ənənələrilə, digər tərəfdən isə tükənməz xalq yaradıcılığının zəngin təcrübəsinə və xüsusən milli zəminə əsaslanaraq, sadəliyə, realizmə, xalq həyatına daha dərindən nüfuz edə bilməsi ilə seçilir.

XVI əsrin əvvəllərində yaranmış güclü Azərbaycan Səfəvilər dövləti sonrakı yüzillikdə müəyyən mənada tənəzzülə uğrayır və öz əvvəlki simasını, qüdrət və nüfuz dairəsini itirir.

Bu dövrdə Azərbaycan torpaqları Səfəvilər dövləti ilə qonşu Türkiyə arasında gedən uzunmüddətli müharibələr meydanına çevrilir. Azərbaycan bir vaxt İranın əyaləti halına düşsə də, ayrı-ayrı vilayətlərdə yerli xanlar tez-tez baş qaldırırdılar. Belə bir zamanda geniş kütlələrin yaşayış şəraiti çətinləşir, xalq çox ağır və məşəqqətli həyat keçirirdi. Sözsüz ki, əməkçi xalq kütlələri buna uzun müddət dözə bilməzdi; onların bir qismi üsyançı dəstələr düzəldərək dağlara çəkilir, digər qismi onlara hər cəhətdən yardım göstərirdi.

Müharibələr və feodal çəkişmələri ölkənin iqtisadi vəziyyətini ağırlaşdırdığı kimi, mədəniyyət, ədəbiyyat və elmin inkişafına da mənfi təsir göstərirdi.

Azərbaycan dilini yaratdığı Səfəvilər dövlətinin rəsmi dövlət dili kimi qəbul edən Şah İsmayıl Xətayinin hakimiyyəti ərzində bu dilə, onun adət və ənənələrinə ehtiramın artması, xalq şerinin, xüsusilə aşıq sənətinin hörmət qazanması dövrün çox əlamətdar hadisələrindən idi. Sonrakı Səfəvi hökmdarları vaxtında isə Azərbaycan dili Səfəvilər sarayında əvvəlkinə nisbətən az işlənsə də, yenə də xalq danışıq dilində ondan əsas ünsiyyət vasitəsi kimi istifadə edilirdi. Xanlıqlarda isə şifahi rəsmi dil Azərbaycan dili olmuşdur. Həm də bu dil daha çox folklor üslubuna arxalanırdı. Bu dövrdə daha nüfuzlu bir üslub kimi sürətlə inkişaf edərək yazılı ədəbi dilə də böyük təsir göstərirdi.

Dövrün ümumi ədəbi mənzərəsinə nəzər salarkən o vaxta qədərki ədəbiyyatla müqayisədə xeyli yeniliklərlə yanaşı, klassik şeir üslubunun və ilk növbədə Füzuli ənənələrinin davamı diqqəti daha çox cəlb edir. Belə səpkili əsərlərdə yeni bədii vasitələrin artmasına baxmayaraq, onlar yenə də orta əsrlər formasında yazılmış şeirlər olaraq qalırdı. Cəmiyyətin savadlı hissəsini əsrlər boyu əldən-ələ gəzən ədəbi əsərlər maraqlandırırdı. Ədəbiyyatın cəmiyyət həyatında yerinə yetirməli olduğu vəzifələr, əvvəlki kimi, yenə əsasən, poeziyanın üzərinə düşürdü. Etik, didaktik, dini-sufi məzmunlu əsərlər, qəsidələr yazılır, məhəbbət və fəlsəfi lirika, romantik və fəlsəfi xarakterli poemalar geniş şöhrət tapır, maddeyi tarix, müəmma, nəzirə və s. Şeir forma və janrlarından istifadə edilirdi.

Əsrin ortalarından Səfəvi saray ədəbiyyatı yenidən canlansa da, buraya toplaşan şairlər ədəbiyyatın ümumi inkişafına təsir göstərə bilmirdilər. Məsihi

və Saib Təbrizi kimi şairlər yalnız saray həyatından uzaqlaşdıqdan sonra öz qiymətli əsərlərini yaradırdılar. Sarayda yaranan mədhlər, qəsidələr, onların məzmunca quru, üslubca təmtəraqlı dili həm ədəbiyyata, həm də orada olan bəzi istedadlı sənətkarların yaradıcılığına bir yeknəsəqlik gətirmişdi. Çox zaman boş pafos, mübaliğəli təriflərlə dolu beytlər yazmaqla öz ilhamını boğan istedadlı şairlərdən adi məddahları fərqləndirmək də çətin olurdu.

XVIII əsrin ortalarından artıq az-çox müstəqil xarakter alan xanlıqların mərkəzinə çevrilmiş Təbriz, Quba, Şamaxı, Gəncə, Şəki, Şuşa kimi şəhərlərdə doğulub yetişmiş Saib Təbrizi, Qövsi Təbrizi, Əmani, Tərzi Əfşar, Məsihi kimi bir çox şairlər Füzulinin poetik ənənələrini davam etdirirdilər. Onlar çox zaman bir yerə toplaşaraq ədəbi məclislər düzəldir, yaratdıqları əsərlərin şəkli xüsusiyyətləri ilə yanaşı, məna gözəlliklərini də müzakirə edir, şerin ictimai məzmununa xüsusi əhəmiyyət verirdilər.

Hələ XV əsrdən əsası qoyulmuş, xüsusilə Füzulinin "Leyli və Məcnun" əsəri ilə xeyli inkişaf etdirilmiş və sabitləşdirilmiş olan mənəvi səpkili poema janrı dövrün ədəbiyyatında geniş yayılmış janrlardan sayılırdı. Belə əsərlərdən Sadiq bəy Əfşarın "Fəthnameyi-Abbasi-namdar", Məsihinin "Vərqa və Gülşa", Fədainin "Bəxtiyarnamə", Saib Təbrizinin "Qəndəharnamə" poemalarını, Əmaninin mənzum hekayələrini göstərmək olar[1].

Bu müəlliflərin yaradıcılığında Füzulinin təsiri qabarıq nəzərə çarpır. Lakin onlar böyük sələflərinin ənənələrini yaradıcı surətdə davam və inkişaf etdirirdilər. Bu xüsusilə klassik üslubda yazılmış əsərlərin dilinin sadələşməsində, xalq danışıq dilinə yaxınlaşmasında özünü göstərirdi. Belə şeirlərdə ərəb, fars tərkibləri o qədər də çox deyildir. Bütün bunlar sübut edir ki, XVII əsrdən başlayaraq yazılı poeziyada folklora meyl güclənmiş və şifahi dil ünsürlərinin yazılı ədəbi dilə köçürülməsi prosesi getdikcə artmışdır.

Məhəmməd Şəmsi, Məhəmməd Əmani, Əzizi və b. şairlərin yaradıcılığında klassik şeir ənənələri ilə yanaşı, şifahi ədəbiyyatın təsiri həm forma, həm də məzmun baxımından qabarıq idisə, Saib, Qövsi, Məsihi kimi şairlərin sənətində klassik şeir forması əsas olsa da, xalq ədəbiyyatının təsiri özünü məzmun baxımından daha artıq dərəcədə göstərməkdə idi.

İkinci qrupa daxil olan şairlər arasında XVII əsrin əvvəllərindən bədii yaradıcılığın qoşma qolu üzrə yaradılan nümunələrinə oxşar şeirlər yazan şairlər də olmuşdur. O cümlədən, Qövsi də bu cür şeirlər yazmışdır:

Könlümü əvvəl alırsan,
Axırı gözdən salırsan.
Qibləgahım, sən bilirsən,
Ev sənin, mehman sənindir.

[1] Dövrün epik əsərləri haqqında bax: *Ə.Səfərli*. XVII-XVIII əsrlər Azərbaycan epik şeri. Bakı, 1982.

Qeyd etmək lazımdır ki, XVII əsr Yaxın və Orta Şərq şeri üçün çox səciyyəvi olan və forma gözəlliyi xatirinə poetik əsərin mənasını dolaşıq, çətin anlaşılan bir hala salan "hind üslubu" ("səbki-hindi") anadilli poeziyamıza o qədər də sirayət edə bilməmişdir. Bu cərəyanın təsirinin azaldılmasında sadəliyi ilə seçilən folklor üslubunun xüsusi qeyd edilməlidir. Bununla belə, farsdilli poeziyada hind üslubunun rolu ən böyük nümayəndəsi öz dövrünün ən görkəmli şairi kimi şöhrətlənən və xeyli müddət Hindistanda yaşayıb yaratmış Saib Təbrizi idi. Ümumi həcmi 300 min beytə çatan bədii əsərlərində o, bir çox həyat həqiqətlərini bu üslubun xüsusiyyətləri ilə əlaqədar olaraq dərin mühakimələr əsasında ifadə edə bilmişdi.

Dövrün ədəbiyyatının ideya-bədii keyfiyyətlərini Qövsi, Saib, Məsihi, Əmani kimi, əsasən, klassik üslubda yazan sənətkarların şeirləri ilə yanaşı, Tufarqanlı Abbas, Sarı Aşıq kimi aşıqların qoşma və bayatıları, xalq təfəkkürünün incisi olan "Koroğlu" dastanı və s. əsərlər müəyyən edirdi. Məhz bu zamandan başlayaraq əsrlər boyu yanaşı inkişaf edən, lakin estetik xüsusiyyətləri ilə bir-birindən xeyli fərqlənən klassik ədəbiyyat və şifahi xalq poeziyası arasında qarşılıqlı əlaqə və təsir xeyli qüvvətlənir.

Sadə insani hisslər və səmimi duyğularla dolu olan el ədəbiyyatının orijinal milli xüsusiyyətləri, koloriti klassik üslubda yazan bir sıra şairləri xalq şeri janrlarına müraciət etməyə təşviq etdiyi kimi, həmin üslubun özündə də folklora məxsus yeni meyllərə yol açırdı. Bu əlaqələrin güclənməsi sayəsində şerin janr və obrazlar sistemi də zənginləşirdi.

El ədəbiyyatının təsiri ilə yaranan poeziya öz məzmunu etibarilə saray şerindən fərqləndiyi kimi, forma cəhətdən də yeniləşmişdi. Bu poeziyanın ilham mənbəyi şəhər sənətkarları və kənd yoxsulları içərisindən çıxan xalq qəhrəmanlarının həyatı idi. Eyni zamanda, şifahi xalq ədəbiyyatında və aşıq poeziyasında işğalçılara nifrət və mübarizlik, vətənpərvərlik ruhu şerin təbliğ etdiyi əsas ideyalardan idi. Belə şeir nümunələrində istilaçılara qarşı mübarizədən, el birliyindən, el gücündən söz açılırdı. Əsrin qabaqcıl arzularını ifadə edən bu ədəbiyyat şəkli xüsusiyyətləri ilə də feodal, tacir və ruhani mühitində sevilən şeirlərdən fərqlənirdi. Onun poetik quruluşu heca vəzninə əsaslanırdı. Bədii təsvir və ifadə vasitələri canlı həyatdan, kənd və şəhər yoxsullarının məişətindən alınır, təşbih və istiarələri ənənəvi qəzəl, qəsidə ifadələrindən fərqli olaraq canlı həyat, məişət ilə bilavasitə əlaqədar olurdu.

Xalq yaradıcılığı üslubuna uyğun, bəzən isə heca vəznində yazılan qəzəlləri şəhərlərdə şairlər yaradır, məclislərdə isə xanəndələr nümayiş etdirirdilərsə, aşıqlar el-obada dolaşır, sazla-sözlə dastanları və qoşmaları ifa edirdilər.

Bir qayda olaraq aşıqlar əməkçi xalq kütlələrinin istək və arzularını, sevinc və kədərlərini, nifrət, qəzəb və hüsn-rəğbət hisslərini ifadə edən xalq nəğməkarları idilər. Onlar xalq qəhrəmanlarının şəninə şeirlər qoşur, dastanlar yaradırdılar. Bu şeirlər və dastanlar tez bir zamanda dillər əzbəri olur,

ağızdan-ağıza keçdikdə, nəsildən-nəsilə verildikcə daha da təkmilləşir, nəticədə kollektivin malına, el ədəbiyyatına çevrildi.

Beləliklə, XVII-XVIII əsrlərdə Azərbaycan folkloru çox inkişaf etmiş və məzmunca zənginləşdiyi, dolğunlaşdığı kimi, nüfuz dairəsini də xeyli genişləndirmiş, yazılı ədəbiyyata ciddi, həlledici təsir göstərmişdir. El ədəbiyyatımızın ən gözəl və şah əsərlərinin çoxu – "Koroğlu", "Əsli və Kərəm", "Aşıq Qərib", "Şah İsmayıl" dastanları və minlərlə qoşmalar, təcnislər, bayatılar, ağılar məhz bu dövrün məhsuludur. XVII əsrdə dastanların daha çox yaranması və geniş yayılması dövrün ictimai-siyasi hadisələri ilə bilavasitə bağlı idi. Bəzən xalq romanı kimi qiymətləndirilən dastan janrı nağıl və xalq əfsanələri əsasında formalaşmışdır. Dastan janrının başlıca xüsusiyyəti bundan ibarətdir ki, burada nəsrlə söylənilən əhvalatlardan əlavə şeirdən də geniş istifadə edilir. Qəhrəmanların deyişməsi, onların keçirdiyi müxtəlif hisslər, ən mühüm hadisələrə olan münasibətləri bir qayda olaraq qoşma və yaxud gəraylı formasında yazılan şeirlərlə ifadə edilir. Dastanın nəsr hissəsini aşıqlar məclislərdə təhkiyə üsulu ilə söyləyir, şeirlərini isə saz havaları üzərində oxuyurlar.

Azərbaycan folklorunda dastan janrının iki əsas növü – qəhrəmanlıq və aşiqanə (məhəbbət) növləri vardır. XVII əsrdə Azərbaycan xalqının yaratdığı ən səciyyəvi qəhrəmanlıq dastanı kimi onun yadelli işğalçılara qarşı mübarizəsi, nifrət və qəzəbini parlaq şəkildə ifadə edən "Koroğlu" dastanını göstərmək olar. Bu dastanın müxtəlif variantları bir sıra başqa Yaxın və Orta Şərq xalqları arasında da geniş yayılmışdır. Dastanda real tarixi hadisələrin izləri ilə yanaşı, çoxlu əfsanəvi nağıllar da vardır.

Məhəbbət dastanlarının əsas məzmunu sadə insanların təmiz və yüksək hisslərinin təsvirindən, onların mənəvi ləyaqətinin, sevib-sevilmək hüququnun təsdiqindən ibarətdir. Əgər xoşbəxt sonluqla bitən "Aşıq Qərib" dastanında sevgi hisslərinə rəğbət və humanist dünyagörüşü köhnə adətlərə üstün gəlirsə, "Şah İsmayıl", "Abbas və Gülgəz" dastanlarında ağıl və xeyirxahlıq kifayət etmir və qəhrəmanlar öz arzularına çatmaq üçün silaha əl atmalı olurlar. Faciəli sonluqla qurtaran "Əsli və Kərəm" dastanında isə beynəlmiləlçilik ruhu, xalqlar dostluğu motivləri tərənnüm edilmişdir. Klassik üslubda, əruz vəznində yazılan əsərlərdən fərqli olaraq, dastanlar və başqa folklor nümunələri bir qayda olaraq yazıya alınmamış, əlyazmaları vasitəsilə deyil, həmdəmi olduqları, zövqlərini oxşadıqları sadə insanların hafizəsi sayəsində şifahi yolla – ağızdan-ağıza keçmək yolu ilə bizim günlərə qədər gəlib çatmışdır.

Məlumdur ki, orta əsrlər şəraitində əlyazmaların hazırlanması böyük zəhmət və vəsait tələb edirdi və yalnız cəmiyyətin varlı təbəqələri katiblərin köməyindən istifadə edə bilərdilər. Şerə, sənətə əyləncə vasitəsi kimi baxan həmin təbəqələr isə yuxarıda qeyd edildiyi kimi, yalnız klassik üslubda yazılan şeirləri "həqiqi sənət əsərləri" hesab edir, folklor yaradıcılığına istehza ilə yanaşır, onu bədii ədəbiyyat saymırdılar. Ona görə də onların sifarişi ilə

hazırlanan və yüksək səviyyədə bəzədilən əlyazmalar yalnız klassik poeziya nümunələrini əhatə edirdi. Xalq yaradıcılığının incilərindən və bu üslubda yazan aşağı təbəqələrin nümayəndələrinin əsərlərindən bəzi nümunələr isə yalnız xalqla bağlı olan ziyalıların və tələbələrin yazdıqları cünglərdə öz əksini tapa bilmişdir. Belə bir şəraitdə el ədəbiyyatının mühafizəsi, inkişafı və zənginləşməsi, dastan, nağıl, xalq mahnılarının ideya-bədii xüsusiyyətlərinin daima təkmilləşməsi işində hələ çox qədim zamanlarda "ozan", təxminən XVI-XVII əsrlərdən isə "aşıq" adlandırılan xalq nəğməkarları müstəsna rol oynayırdılar. Toylarda, bayram və şənliklərdə həmişə xalqla birlikdə olan aşıqlar, onun sevinc və kədərinə şərik olur, ağır günlərdə xalqı mübarizəyə ruhlandırırdılar. Sadə, zəhmətkeş xalq kütlələri arasında böyük hörmət və rəğbət qazanmış peşəkar aşıqlar təklikdə və ya onları müşayiət edən musiqiçilərlə birlikdə bütün ölkəni gəzib dolaşır, bayram və şənliklərdə öz sədəfli saz, füsunkar nağıl və mahnıları, həmçinin incə rəqsləri ilə xalqı sevindirir, əyləndirir, ona həmdəm olurdular. Məşhur aşıqların adları, şeirləri bütün ölkədə dillər əzbəri idi. Aşıqların çoxu yalnız ifaçılıq sənəti ilə məşğul olurdularsa, onların ən istedadlı nümayəndələri eyni zamanda bədii yaradıcılığa da müraciət edir, xalq kütlələrinin ürəyindən xəbər verən şeirlər qoşurdular. XVII əsrdə yetişən belə aşıqlardan ən görkəmliləri Tufarqanlı Abbas və Sarı Aşıq idi. Bu aşıqların xalq yaradıcılığında, onun inkişafında tutduqları yeri klassik poeziya korifeylərinin yazılı ədəbiyyatdakı mövqeyi ilə müqayisə etmək olar.

Bunu da qeyd etmək lazımdır ki, göstərilən aşıqların əsərləri bir sıra başqa görkəmli el sənətkarlarının (məsələn, XVI əsrdə Qurbani, XVIII əsrdə Aşıq Valeh və Xəstə Qasım, XIX-XX əsrlərdə Aşıq Alı, Aşıq Ələsgər, Aşıq Hüseyn Bozalqanlı və b.) yaradıcılığı kimi ümumiyyətlə, şifahi ədəbiyyat ənənələri əsasında inkişaf edib formalaşsa da, keyfiyyətcə, kollektivin malı olan folklordan aşkar şəkildə təzahür olunan fərdi xüsusiyyətləri ilə seçilir. Bu böyük ustadların hər birinin əsərləri poetika, dil və üslub baxımından orijinaldır. Maraqlıdır ki, əvvəlki dövrlərdən fərqli olaraq, bu xalq nəğməkarları öz şeirlərinin sonunda adlarını da qeyd edirdilər.

Fərdi poetik xüsusiyyətlərin inkişafı ilə birlikdə yaranan müəlliflik prinsiplərinin başa düşülməsi xalq yaradıcılığında yazılı ədəbiyyatda olduğundan tamamilə fərqlidir. Böyük rus mütəfəkkiri V.Q.Belinski bu barədə çox düzgün olaraq yazır: "Xalq yaradıcılığı sahəsində məşhur adlar yoxdur, çünki el ədəbiyyatının müəllifi həmişə xalqdır. Heç kəs bilmir ki, yeniyetmə xalqın və ya tayfanın daxili və xarici həyatının təbii və parlaq şəkildə əks olunduğu adi və sadəlövh mahnılarını kim yaratmışdır. Körpəlik dövründə xalq özünün ilk şairlərinin adının qeydinə qalmadığı kimi, şairlərin özləri də adlarının gələcək nəsillərdə saxlanılması qayğısında olmur. Bu dövrlərdə poeziya xidmət yox, qeyri-iradi tələbatdır: insan oxumağa ehtiyac hiss edir və o, oxuyur, bu zaman özü də zənn etmir ki, oxuyur. Mahnı qəbilədən-qəbiləyə, nəsildən-

nəslə keçir, get-gedə dəyişilir: gah qısaldılır, gah uzadılır, gah yenidən işlənilir, gah başqa mahnı ilə birləşdirilir, gah onun özünə başqa mahnı əlavə olunur; nəticədə mahnıdan poemalar yaranır ki, bunların da müəllifi ancaq xalqın özü ola bilər”[1].

Bu qiymətli sözləri bütünlüklə bizim el ədəbiyyatımıza da aid etmək olar. Azərbaycan şifahi ədəbiyyatı aşıqların, nağıl söyləyənlərin və el xanəndələrinin süjet və əhvalatları, parlaq poetik obrazları, cilalanmış dil və ifadə vasitələrini yadda saxlamaq bacarığından asılı olaraq ağızdan-ağıza keçib yaşayır və sonrakı nəsillərə verilirdi. Sözsüz ki, onların bir qismi tamamilə unudulmuş, xeyli hissəsi isə bizə təhrif olunmuş halda gəlib çatmışdır. Ancaq bu gün belə yaşaması və sevilməsi göstərir ki, onlar uzun əsrlər boyu xalqın istər xoş, əziz günlərində, istərsə də çətin və qadalı çağlarında ona həmdəm olmuş, onun zövqünü oxşamış, onu xoşbəxt həyat uğrunda mübarizəyə ruhlandırmışdır. El ədəbiyyatının bütün bu xüsusiyyətləri XVIII əsr yazılı ədəbiyyatımıza həlledici təsir göstərərək, onun poetik quruluşunda, dil-üslub çalarlarında və estetik görüşlərində ciddi dəyişikliklərə səbəb olmuş və yüksəlişinin təməl daşlarından birini təşkil etmişdir.

* * *

XVIII əsrin birinci yarısında Azərbaycanın ictimai-siyasi vəziyyəti əvvəlki yüzillikdən o qədər də fərqlənmirdi. Ölkə yenə də Türkiyə ilə zəifləmiş və gözdən düşmüş İran şahlığı arasında çəkişmələr meydanı olaraq qalmaqda idi. Bunun nəticəsində sənaye və ticarət məhdudlaşır, təsərrüfat sahələrində durğunluq hökm sürür, əhalinin məişət şəraiti ağırlaşırdı. Geniş xalq kütlələri arasında narazılıq artır, tez-tez üsyanlar baş verirdi.

Məhz belə bir şəraitdə yerli feodallar da şahlıq və sultanlıq əsarətindən xilas olmağa çalışan zəhmətkeş kütlələrin azadlıq hərəkatına qoşuldular. Nəticədə Qarabağ, Gəncə, Şəki, Şirvan, Quba, Bakı, Naxçıvan, Dərbənd, Lənkəran, Təbriz, Xoy, Maku xanlıqları yarandı ki, bunların da arasında Quba, Şəki, Qarabağ və Gəncə xanlıqları iqtisadi gücü və ərazi böyüklüyü ilə seçilirdi.

Bu xanlıqlar arasında bəzən çəkişmələr, döyüşlər baş versə də, əsrin ikinci yarısında onların bir-birilə təsərrüfat, ticarət və mədəni əlaqələri xeyli artmışdır. Dövrün görkəmli şairləri olan Vidadi və Vaqifin müxtəlif xanlıqlara səfərləri də buna misal ola bilər. S.Mümtaz Vaqiflə Şəki və Şirvan bəylərbəyisi olan Məhəmməd Hüseyn xan Müştaq arasında yaxın və səmimi dostluq əlaqələri olduğunu qeyd edir[2].

İran şahlığının əsarətinə son qoyulması və xanlıqlar arasında iqtisadi, ticarət və mədəni əlaqələrin genişlənməsi, xanlıqlarda yaşayan əhali arasın-

[1] *Белинский В.Г.* Собрание сочинений в 3-х томах, т, 2-М., 1948, с.89.

[2] *Mümtaz S.* Azərbaycan ədəbiyyatı, c. 2, “Molla Pənah Vaqif”. Bakı, 1925, s.23

dakı gediş-gəliş Azərbaycan dilinin nəinki geniş xalq kütlələri içərisində, həm də xanlıqlarda rəsmi danışıq və bir çox hallarda isə yazı vasitəsinə çevrilməsinə səbəb olmuşdur. Həmin dövrdən qalmış bir sıra əlyazmalardan görünür ki, o zaman Azərbaycan dilində rəsmi sənədlər yazılmış və hətta mədrəsələrdə rəsmi vəsiqələrin yazılması üçün təlim verilmişdir.

Əsrin ikinci yarısında bəzi xanların təşəbbüsləri nəticəsində Şuşa, Gəncə, Bakı, Naxçıvan, Şəki və Quba kimi şəhərlər abadlaşmış, həmin şəhərlərdə bir sıra yeni memarlıq abidələri tikilmiş, böyük şəhərlərdə və iri kəndlərdə bir neçə məktəb və mədrəsə açılmış, xüsusilə musiqi sənəti inkişaf edərək xeyli zənginləşmişdir.

Həmişə olduğu kimi, mədəni həyatda aparıcı mövqe yenə də ədəbiyyata məxsus idi. Xalqın qabaqcıl nümayəndələri cəmiyyət həyatındakı böhranlı hadisələrin kəskinləşməsini ürək ağrısı ilə duyur, baş verən hadisələri başa düşməyə çalışır, çətinlikləri aradan qaldırmaq üçün yollar axtarırdılar. Bununla bərabər, qorxu və çaşqınlıq hissləri mühafizəkar fikirli şairlərdə mövcud həyatdan uzaqlaşmaq, keçmişə qayıtmaq kimi mistik meyllər də doğururdu. Mütərəqqi yazıçılar hakim təbəqələrin ədalətsizliyini, ruhanilərin saxtakarlığını, sxolastik elmlərin zərərini göstərdikləri halda, mürtəcelər dini mövhumat təbliğ edir, ruhaniləri müqəddəsləşdirir, çıxış yolunu şəriət qanunlarında axtarırdılar. Lakin qabaqcıl fikirli, xalqın mənafeyini müdafiə edən şairlər çoxluq təşkil edirdilər. Onların yaratdığı ədəbi əsərlərdə işıqlı humanist ideyalar irəli sürülür, mistik-asketik ruh, tərki-dünyalıq motivləri əvəzinə həyata, insana, ictimai mühitə aydın bir münasibət görünürdü.

Ardı-arası kəsilmədən davam edən siyasi-ictimai və iqtisadi böhranlar, hərbi çaxnaşmalar ədəbiyyatda konkret tənqidi meylləri gücləndirir, şairlər həyatda olan mənfiliklərə daha çox diqqət yetirir, xalqın ağır vəziyyətində bilavasitə günahkar olanları tənqid etməyə başlayırdılar.

Artıq folklor şerində öz ənənələrinə malik olan satiranın da imkanlarından istifadə edilirdi. Klassik poeziyada qabaqlar da çox təsadüf edilən şikayətnamə janrında taleyin zülmündən, həyatdakı ədalətsizliklərdən, sənətə, şerə qiymət verilməməsindən danışan əsərlər yazılırdı.

Lakin qeyd edildiyi kimi, orta əsrlər poeziyasının müəyyən etdiyi qanun-qaydalardan uzaqlaşma, xalq yaradıcılığına məxsus poetik xüsusiyyətlərin yazılı ədəbiyyatda geniş tətbiqinə meyl bu dövrün ədəbiyyatı üçün daha səciyyəvi bir haldır. Özü də belə meyllər həm bədii ədəbiyyatın məzmun və ideya xüsusiyyətlərində, həm də şəkli cəhətlərində əksini tapır. Məsələn, klassik poetika qaydalarına əsasən şeirdə qafiyə sərbəstliyinə yol vermək şair üçün qəbahət sayılırdı. El ədəbiyyatımızın qədim nümunələrində isə, məlum olduğu kimi, qafiyə olmamışdır və onun funksiyalarını alliterasiya və assonans kimi poetik vasitələr yerinə yetirmişdir. Daha sonralar klassik poeziyanın təsiri ilə sözlərin və sətirlərin əvvəlində işlənən səs təkrarlarını qafiyə əvəz etmişdir.

Hətta XV əsrdə belə türk xalqlarının folklor şeri üçün dəqiq qafiyə məcburi sayılmamışdır. Bunu Əlişir Nəvainin "Məcalis ün-nəfais" əsərində XV əsr özbək şairi Ətainin yaradıcılığı haqqında dediyi sözlərdən də aydın görmək olar: "Mövlana Ətai... türkcə yazırdı. Onun şeirləri türklər arasında geniş şöhrət tapmışdı. Onun qafiyələrində nöqsanlar vardı. O, türk üsulunda yazdığından qafiyə qayğısına qalmırdı"[1]. XVIII əsrdə isə bəzən klassik janrlarda yazılmış şeirlərdə belə qafiyə sərbəstliyinə rast gəlmək mümkündür. Hətta, Vaqif kimi yüksək poetik zövqə malik şair belə bəzən şerin qafiyə quruluşunda olduqca sərbəstliyə yol verir. Belə qafiyə sərbəstliyinə, həmçinin məlum ənənəvi müstəzadlardan fərqlənən yeni formalara malik müstəzadlara XVIII əsrin başqa şairlərinin bədii irsində də rast gəlmək mümkündür.

Beləliklə, orta əsrlər poeziyasının, onun əsrlər boyu dəyişilməz sayılan qayda-qanunlarının el ədəbiyyatının güclü təsiri ilə sarsılması dövrün başlıca ədəbi prosesinə çevrilir. Klassik poeziyaya məxsus normativlik prinsiplərinin istər ideya-tematik, istərsə də vəzn sistemi, kompozisiya quruluşu və s. cəhətlərdən pozulması, yeni poetik xüsusiyyətlərin yaranması nəticəsində köhnə və yeni prinsiplərin daim sonuncunun xeyrinə dəyişən kəmiyyət nisbəti yavaş-yavaş keyfiyyət dəyişikliyinə çevrilməyə başlayır. Xalqın başa düşdüyü, onun istək və arzularını ifadə edən, estetik görüşlərinə və fəlsəfi təfəkkür tərzinə çox yaxın olan bu ədəbiyyat "baş verən gündəlik siyasi hadisələri" belə əks etdirə bilirdi[2].

Bu poeziyada məhəbbət mövzusu mühüm yer tutsa da, qəzəllərdə, qoşmalarda əsasən məhəbbətdən bəhs edilsə də, günün zəruri ictimai-siyasi məsələlərini qələmə almaq, gündəlik tarixi hadisələrlə səsləşən əsərlər yaratmaq meyli də qüvvətlənirdi.

Baş verən tarixi hadisələri olduğu kimi təsvir edən tarixi mənzumələr yaratmaq cəhdi ədəbiyyatda yeni bir hadisə idi. Şakir Şirvaninin "Əhvali-Şirvan" əsərində, Ağa Məsih Şirvaninin müxəmməslərində, Vidadinin "Müsibətnamə"sində ictimai-tarixi həyatın canlı, bədii lövhələri yaradılmışdır.

XVIII əsrdə şifahi xalq ədəbiyyatı ilə yazılı poeziya ənənələri arasındakı qarşılıqlı əlaqə o qədər güclənmişdi ki, yazılı ədəbiyyatda bu iki cərəyan ənənəvi və yenilikçi meyllərin müəyyən müsbət bir sintezinə gətirib çıxarmışdı. Mütərəqqi ziyalıların çoxu el ədəbiyyatı nümunələrini toplamağa və şifahi xalq şeri tərzində əsərlər yazmağa meyl göstərirdi. Peşəkar aşıqlar öz sələflərinin və müasirlərinin əsərlərini toylarda, məclislərdə ifa etdikləri kimi, xalq şeri təsirilə yazan, realizmə meyl göstərən şairlərin əsərlərini də ifa edirdilər. Azərbaycan xanlarının çoxu mənşə etibarilə el ədəbiyyatını xoşlayan köçəri tayfalara mənsub olduğundan, aşıq şeri əyan-əşrəf məclislərinə də yol tapmışdı. Klassik üslubda şeir yazan şairlər də aşıq şeri tərzində qoşmalar

[1] *Əlişir Nəvai*. Məcalis ün-nəfais. Tehran, 1333 (şəmsi), s.78, (*fars dilində*).
[2] *Araslı H.* XVII-XVIII əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1956, s.179.

yazmağa çalışırdılar. Məhəbbət və qəhrəmanlıq mövzuları ilə yanaşı məişət məsələlərindən bəhs edən "Novruz", "Abdulla və Cahan", "Əmrah və Səlminaz", "Şah Abbas və pinəçi" kimi yeni-yeni dastan və nağıllar yaradılırdı. Bütün bunlar yazılı ədəbiyyata da qüvvətli təsir göstərir, "Seyfəl-müluk", "Yusif və Züleyxa" kimi poemaların meydana gəlməsinə səbəb olurdu.

Azərbaycan şairləri heca vəznində şeirlər yazmağa, Qurbani, Tufarqanlı Abbas və Sarı Aşığın ədəbiyyata gətirmiş olduğu xüsusiyyətləri davam etdirməyə çalışırdılar. Cavan şairlərin çoxu qoşma və bayatı yazmağa cəhd edirdilər. Xalq ədəbiyyatına olan bu meyl getdikcə qüvvətlənir, ədəbi dil sadələşir, şifahi xalq şerinin forma və janr xüsusiyyətləri ədəbiyyatda vətəndaşlıq hüququ qazanmağa başlayırdı.

Qoşma, gəraylı və bayatı yazan şairlər klassik poeziyanın da bir sıra şəkli xüsusiyyətlərindən istifadə edərək yeni və maraqlı folklor növləri yaradır, çarpaz zəncirləmə, müstəzad qoşma və s. kimi yeni şeir şəkilləri meydana çıxarırdılar. Aşıqların müxəmməs adlandırdıqları, lakin hər bəndi on misradan ibarət olan şeirlər heca ilə əruz vəznlərinin şəkli bir sintezi kimi səciyyələndirilə bilər.

Əruz vəznində yazan şairlərin xeyli hissəsi bu vəzni danışıq dilinin xüsusiyyətlərinə daha çox uyğunlaşdırır, canlı xalq dilində işlənməyən ərəb-fars sözlərini tədricən şeir dilindən çıxarır, onların əvəzinə şifahi xalq ədəbiyyatından gətirilən obrazlı ifadələr işlədirdilər. Əruzun heca vəzninə yaxın yeni bəhrləri meydana gəlir ki, bunlar heca vəzninin xüsusiyyətlərindən fərqləndiyi kimi, əruzun da klassik bəhrlərindən seçilir.

Bizim günlərədək gəlib çıxmış əsərlər göstərir ki, dövrün mahir şairləri şeir texnikasına mükəmməl yiyələnmiş, onu daha da inkişaf etdirmişlər. Şeir dili canlı xalq dilindən gələn sözlər, ifadələr hesabına zənginləşmişdir. XVIII əsrin ikinci yarısında Azərbaycan şerində janrların işlənmə dairəsi baxımından da bir sıra yeniliklər baş verir. Qəsidə janrı öz əvvəlki mövqeyini əldən verir. Əruz vəznində yazan şairlər qəzəl janrını davam etdirirlər. Ancaq qəzəldən çox müxəmməs yazmağa əhəmiyyət verilir. Müstəzad janrı da az işlənmir. Tarixi mənzumələr, həcvlər, mədhlər, mərsiyələr müxəmməs şəklində yazılır. Məsnəvi formasından isə poema və mənzum hekayələrdə istifadə olunur. Köhnə janrlarda baş verən şəkli dəyişikliklərlə yanaşı, yeni janrlar da yaranırdı. Bu, dövrün yeni yaranan nəsr əsərlərində daha aydın nəzərə çarpırdı[1]. Bütün bu dəyişikliklər ədəbiyyatın məzmunca yeniləşməsindən və daha geniş oxucu kütlələrinin tələblərini ödəmək ehtiyacından irəli gəlirdi. XVII-XVIII əsrlərdə baş verən tarixi hadisələr ədəbiyyat qarşısında yeni və daha mühüm vəzifələr qoyurdu.

---

[1] Nəsr əsərləri haqqında bax: Azərbaycan ədəbiyyatı tarixi. Üç cilddə, I c. Bakı, 1960, s.449-450; *Dadaşzadə* A. XVIII əsr Azərbaycan lirikası. Bakı, 1980, s.18-21.

Bu dövrdə də, keçmişdə olduğu kimi, məhəbbət mövzusu ədəbiyyatda mühüm yer tutur, azadlıq hissləri ilə yanaşı tərənnüm edilirdi. Böyük Füzulinin ecazkar sənətinin qüdrəti yenə də öz təsirini göstərməkdə idi. Füzuli ədəbi məktəbini davam etdirən sənətkarlar içərisində Nişat Şirvani, Şakir Şirvani, Məhcur Şirvani, Zülali, Ağdaşlı Zari, Arif Təbrizi, Ağa Məsih Şirvani, Arif Şirvani, Hüseyn xan Müştaq, Saleh Şirvani kimi şairlər xüsusilə seçilirdi.

Klassik üslubda yazılmış lirik əsərlərdə "ümumən orta əsr poeziyası üçün səciyyəvi olan bəzi motivləri axtarmaq əbəsdir. Məsələn, elmi bilik və təsəvvürlərə aid fikirlər, xüsusi fəlsəfi-ideoloji, dini-təbliği ruh XVIII əsr şeri üçün yabançı idi. Sufi simvollar və obrazlar, əsasən, zahiri, ənənəvi bədii vasitə kimi işlənirdi. Bu dövrdə xüsusilə xalq aşıq tərzinin təsirilə konkret həyati hadisələrin təsvirinə meyl güclənirdi"[1]. Hələ XVIII əsrin birinci yarısında Azərbaycan poeziyasında açıq-aydın nəzərə çarpan yeni meyllər əsrin ikinci yarısında daha da qüvvətlənmiş və demək olar ki, yeni ədəbi cərəyan halını almışdı. Bu poeziyanın mövzu dairəsi geniş və çoxcəhətli idi. Konkret ictimai-tarixi hadisələrin və insanların təsviri, feodal dünyasında hökm sürən ədalətsizliklərə, eybəcərliklərə etiraz, xeyirxahlıq və humanizmin təbliği, həyatın mənası haqqında fəlsəfi düşüncələr, mübarizlik və qəhrəmanlıq hisslərinin, romantik və dünyəvi məhəbbətin tərənnümü kimi motivlər dövrün bədii əsərlərində rəngarəng surətdə əks olunmuşdur. Bütün bunlar ədəbiyyata yeni bir ruh gətirir, yeni bir istiqamət verirdi.

Ədəbiyyatın yeni istiqamət alması prosesi bir tərəfdən köhnə ədəbiyyatın əsaslarını təşkil edən xüsusiyyətlərdən (janr sistemi, qəhrəman tipi, dil və üslub, şeir texnikası və s.) uzaqlaşmaq, digər tərəfdən isə bədii sənətdə yeni hadisə və ədəbi amillərin yaranması və get-gedə güclənməsi yolu ilə baş verirdi. Bu əsaslar üzrə də yeni ədəbi sistemin özünəməxsus fəlsəfi-estetik görüşləri, xalq yaradıcılığına arxalanan bədii təfəkkür tərzi formalaşırdı. Yeni ədəbi sistemin nümayəndələri Füzulinin humanist ənənələrini davam etdirərək, xalq ədəbiyyatının realist və demokratik, milli və xəlqilik prinsiplərini həmin ənənələrin dayaq nöqtəsinə çevirirdilər.

El ədəbiyyatından gələn sadəlik və müdriklik yeni ədəbi istiqamətin geniş xalq kütlələri tərəfindən anlaşılmasına və sevilməsinə ciddi kömək edirdi.

Realizmə və sadəliyə meyl edən bu yeni ədəbi sistemin Vaqif, Vidadi, Hamidi, Saleh Şirvani, Baba Şirvani, Şikəstə Şirin kimi nümayəndələri əsas qüvvəni xalqdan, sadə adamların məişətindən, el ədəbiyyatından alırdılar. Onlar xalq şerinin ideya-bədii xüsusiyyətlərini üstün tutur, əsasən heca vəznində yazırdılar.

Azərbaycan şerinə yeni ruh gətirən bu ədəbi cərəyan genişlənir, yaranan sadə və aydın şeirlər aşıqlar və xanəndələr tərəfindən məclislərdə oxunur və

[1] *Dadaşzadə A.* Göstərilən əsəri, s.51-52.

xalq içərisində yayılırdı. Lakin insanın daxili aləminə, ictimai həyatın müxtəlif mürəkkəb cəhətlərinə nisbətən az diqqət yetirdikləri üçün bu şairlərin çoxunda realizm hələ məhdud olub, təsviri səciyyə daşıyırdı.

Yeni ədəbi cərəyanın formalaşmasında dövrünün görkəmli şairi və dövlət xadimi kimi şöhrət tapan Molla Pənah Vaqifin yaradıcılığı həlledici rol oynamışdır.

Yeni Azərbaycan poeziyasının banisi kimi tanınan Vaqifin klassik poeziyaya olan rəğbətini qəzəl və müxəmməsləri vasitəsilə sübut etsə də, öz istedadını qoşma janrında daha aydın göstərə bilmişdir. Bu yeni janrda Vaqif dünyəvi məhəbbəti, sadə həyatdan doğan sevinc və fərəh hisslərini tərənnüm edirdi. Onun vəsf etdiyi gözəllər real həyatda olan ağıllı, mərhəmətli, xeyirxah, müəyyən qədər də işvəli və qəmzəli qadınlar idi.

Şairin yaradıcılığında vətəndaşlıq və vətənpərvərlik motivləri də öz parlaq ifadəsini tapmışdır. Onun lirikasında nikbinlik və həyata vurğunluq olduqca güclüdür.

Yaradıcılığındakı xəlqilik və həyatilik Vaqifə Azərbaycan ədəbiyyatında realizm cərəyanının ilk nümayəndələrindən biri sayılmaq hüququ vermişdir. Şair öz dövrünün ictimai həyatının bir sıra səciyyəvi cəhətlərini təsirli bədii boyalarla əks etdirmişdir.

Vaqif Azərbaycan ədəbiyyatı tarixinə ən böyük yenilikçi şairlərdən biri kimi daxil olmuşdur. O, Azərbaycan şeir dilinin böyük "islahatçısıdır". Səmimi və real həyati hisslər onun əsərlərində olduqca sadə və melodik bir dillə tərənnüm edilir. Şairin poetik dilinin ən mühüm cəhətlərindən biri də canlı həyatın bədii qavrayışı və onu zəngin boyalarla, səmimi ifadələrlə əks etdirməsindən ibarətdir. Vaqif xalq dilinin bədii ifadə vasitələrindən, onun leksik zənginliklərindən istifadə yolu ilə həyat həqiqətlərinin konkret xüsusiyyətlərini çox dəqiq şəkildə ifadə edir. Əvvəllər şeir sənətinə "yaraşmaz" hesab edilən bir çox sadə söz və ifadələri ilk dəfə şeir dilinə gətirən Vaqif əsərlərində onların nə qədər dərin mənalar verə bildiyini, necə poetik ifadə gücünə malik olduğunu inandırıcı surətdə sübut edə bilmişdir.

Gözəlliyi dilin sadəliyində axtaran şair sözlərin seçilməsində əvvəlki yazılı ədəbiyyatda mövcud olan ənənələrdən yox, sözlərin poetik mənaya uyğunluğu prinsiplərindən çıxış edir. Ona görə də şairin əsərlərindəki poetik simvollar, məcaz və təşbehlər, epitetlər öz həyatı gücü ilə seçilir. Vaqifin poetikası üzvi şəkildə milli xalq estetik görüşləri ilə bağlı olsa da, şair klassik poeziya ənənələrindən də bacarıqla, yaradıcı surətdə istifadə etmişdir.

Yeni realist ədəbiyyatın formalaşmasında, Azərbaycan şeir dilinin inkişaf edib, zənginləşməsində Vaqifin bir çox müasirlərinin, o cümlədən onun yaxın dostu Vidadinin də böyük rolu olmuşdur. Bu şairlərin yaradıcılığı Azərbaycan poeziyasının sonrakı inkişafına, onun ərəb-fars təsirindən qurtarmasına və daha artıq dərəcədə milli zəminə əsaslanmasına, demokratik və realist istiqa-

mətdə irəliləməsinə təkan vermişdir. Beləliklə, bədii söz sənətinin istər xalq yaradıcılığı, istərsə də klassik poeziya qollarının əsrlər boyu toplanmış zəngin təcrübəsindən istifadə edən XVIII əsr şairləri Azərbaycan şeir sənətini daha da təkmilləşdirmiş, xalq həyatının bədii təsvirinə uyğun gələn cəhətlərini daha da inkişaf etdirmişlər. İlk dəfə olaraq ədəbiyyatda sadə xalq üslubu ədəbiyyatın ümumi simasını müəyyən edən bir istiqamətə çevrilmişdir. Xalq üslubunda yazan şair və aşıqlar Azərbaycan ədəbiyyatına və dilinə elə bir vüsət verirlər ki, Azərbaycan mədəniyyəti təkcə Qafqaz hüdudlarında deyil, ondan kənarda belə müəyyən mənada "beynəlxalq" xarakter alır. Belə ki, gürcü, kürd və erməni aşıqları da məclislərdə azərbaycanca yazılmış qoşmaları oxuyurlar. Erməni şairləri Miran və Sayat Nova özləri Azərbaycana gözəl şeirlər qoşurlar. Məlumdur ki, Gürcüstan çarı II İraklinin sarayında azərbaycanlı aşıqlar və aşıq tərzində şeir yazan şairlər yaşamışlar[1]. Bu zaman "Gürcü aşıqları adətən dastanın ("Koroğlu") şeirlərini türk dilində oxuyurlar, qəhrəmanların başına gələn hadisələri isə gürcü dilində söyləyirlər". Kürd məclislərində isə "bu dastanların süjeti kürd dilində nəsrlə nağıl edilir, qəhrəmanın lirik hiss və fikirlərini, şəxsi duyğularını, sevinc və kədərini, fərəh və qəzəbini bildirən ayrı-ayrı mahnılar azərbaycanca oxuyur"[2].

Azərbaycan dilinin özü də xüsusi ahəngdarlığı sayəsində qonşu xalqlar arasında böyük rəğbət qazanır. V.Qersenşteyn XIX əsrin sonlarında rus dilində nəşr etdirdiyi "Zaqafqaziya almanaxı" adlı kitabında Zaqafqaziya xalqlarının etnik tərkibindən danışarkən onlar arasında Azərbaycan dilinin geniş yayılmasını qeyd edərək göstərir ki, bu dilin hədsiz şirinliyi nəticəsində bir çox Dağıstan xalqları ailədə və məişətdə belə öz ana dilində yox, Azərbaycan dilində danışırlar.

Belə bir ictimai-mədəni mühitdə ədəbiyyat xalq həyatı ilə getdikcə daha sıx bağlanır, onun mövzu dairəsi genişlənir və müasirləşirdi; əsərlərdə yeni motivlər, xalqdan gələn yeni insan surətləri özünü göstərir, satira güclənir, XIX əsrdə yaranacaq yeni bədii ədəbiyyatın bünövrəsi qoyulurdu. Köhnə Şərq poetikası qanun-qaydaları tədricən öz mövqeyini itirir, yeni ədəbi sistemə keçid prosesi gedirdi. Məhz bu səbəbdən də çox vaxt eyni bir əsərdə köhnə ənənələrlə yeni bədii amillər yanaşı işlənir, bir-birini tamamlayırdı. Ədəbiyyat get-gedə cəmiyyətin, mənəvi həyatın daha geniş sahələrini əhatə edərək, öz dairəsini genişləndirirdi. Bütün bunlar isə ədəbi əsərlərdə öz ictimai mənşəyi, dil və üslub xüsusiyyətləri və psixologiyası ilə seçilən yeni tipli qəhrəman surətlərinin yaranmasına səbəb olurdu. Ədəbiyyatla real həyat, canlı insanların məişəti arasında məsafə getdikcə azalır, həyat özünəməxsus

[1] *Araslı H.* Göstərilən əsəri, s.212.

[2] Sitatların mənbəyi haqqında bax: *Богатырев П.Г.* О языке славянских народных песен в его отношении к диалектной речи. "Вопросы языкознания", 1962, №3, с.75.

əlamətləri və rəngarəngliyi ilə bədii əsərlərə daxil olurdu. Qəhrəmanın və onun yaşadığı mühitin, təbiətin təsvirində də milli cəhətlər, xalq bədii təfəkkürü, dünyagörüşü özünü daha artıq dərəcədə göstərirdi.

XVII–XVIII əsrlər Azərbaycan poeziyası orta əsrlər ədəbiyyatı xarakteri daşısa da, onda baş verən yeni keyfiyyətlər tədricən artaraq orta əsrlər ədəbiyyatından yeni tipli ədəbi sistemə çevrilməyə başlamışdı. Bu keçid prosesi əsasən, klassik poeziyanın mütərəqqi ənənələri ilə xalq yaradıcılığı amillərinin birləşməsi formasında təzahür etmişdir. "Keçid dövrü" ifadəsini heç də təsadüfi bir istilah kimi yox, haqqında söhbət gedən dövrün ədəbiyyat tariximizdə tutduğu yerin səciyyəvi xüsusiyyəti kimi başa düşmək lazımdır. Yuxarıda göstərilən dəyişikliklər, yeniliklər həmin dövrün ədəbi inkişafı üçün ən səciyyəvi əlamətlər sayılmalıdır. Nəticə etibarilə sonrakı əsrdə yeni tipli ədəbiyyatın yaranmasına gətirib çıxaracaq bu keyfiyyət dəyişikliklərin formalaşmasının sürəti və səviyyəsi baş verən yeniliklərin xarakterindən, səmərəliliyindən və ədəbi janrların əhatə dairəsindən asılı olmuşdur. Ona görə də keçid dövrünün mahiyyət və qanunauyğunluqlarını öyrənərkən az təsadüf edilən yenilikləri belə nəzərdən qaçırmaq olmaz. Bu, bir də ona görə vacibdir ki, bu dövrün ədəbiyyatının öyrənilməsində başlıca çətinliklərdən biri həmin "dövr nümunələrini bizim günlərə pərakəndə, səliqəsiz və çox natamam şəkildə gəlib çatması ilə əlaqədardır. Onu demək kifayətdir ki, XVIII əsrdə yaşamış şairlərdən heç birinin küll halında divanı hifz edilməmişdir... Bütün bunlar əsrin obyektiv şəraitinin meydana çıxardığı təbii hallar olsa da, ədəbi mənzərənin dolğun lövhəsini yaratmağı çətinləşdirir"[1].

Nəhayət, demək lazımdır ki, bu dövrdə yaşamış bir çox görkəmli şair və ədiblərin yaradıcılığı hələlik ayrıca tədqiq edilməmişdir. Bununla belə, bu əsrlərdə baş verən ədəbi meyllər, onların əhəmiyyəti və s. haqqında Həmid Araslının və Araz Dadaşzadənin göstərilən əsərlərində verilmiş məlumatlar diqqətəlayiqdir.

Keçid dövründə ədəbiyyatda realist və demokratik meyllərin güclənməsi, söz sənətinin əhatə və təsir dairəsinin genişlənməsi XIX əsrdə yeni tipli ədəbiyyatın, realizm və maarifçilik ideyalarının formalaşıb bərqərar olması üçün ilkin şərtlər yaratmış, əlverişli zəmin hazırlamışdır.

***Cahangir Qəhrəmanov***
1988

[1] *Dadaşzadə A.* Göstərilən əsəri, s.17–18.

# M Ə H Ə M M Ə D   Ə M A N İ

*XVII əsrdə yaşamış, uzun bir ömür yolu keçmişdir. Əsərlərindən və Sadiq bəy Əfşarın "Məcməül-xəvas" təzkirəsindən məlum olur ki, Əmani Səfəvi sarayına yaxın əmirlərdən olub. Şairin Azərbaycan dilində yazdığı şeirlər "Divan"ının yeganə məlum nüsxəsi Londonun Britaniya muzeyində saxla-nılır. Klassik şeir üslubunda yazdığı şeirlərdən başqa Əmani bir sıra xalq şeri üslubunda yazdığı qoşma, gəraylı və bayatıların müəllifidir.*

## BAYATILAR

Bağça barın arzular,
Aşiq yarın arzular.
Hər nə kim, dünyada var
Öz miqdarın arzular.
Məhəbbət meydanidə
Mənsur darın arzular.

* * *

Cananum tək can az var,
Aramızda min raz var.
Anda ərkü naz varsa,
Məndə əczü niyaz var.
Həzrət et, könül quşu,
Kəmində şahbaz var.

* * *

Yüzün göz rövşənidir,
Zülfün can cövşənidir.
Xəyalın ilən könlüm
Məhəbbət kövşənidir.

* * *

Yüzün gül xülasəsi,
Ləbin mül xülasəsi,
Ənbərfəşan kakilin
Tər sünbül xülasəsi.
Yazılmışda zatın
Cüzvü küll xülasəsi.

## GƏRAYLILAR

Eşq odunda yandı bağrım,
Yarəb, görəmmi didarın?
Dağdan ağır oldu ağrım,
Yarəb, görəmmi didarın?

Ey adı zikrül-lisanım,
Yadından qut tapan canım,
Vaqifi-razi-nihanım,
Yarəb, görəmmi didarın?

Qaçıbdır gözlərdən xabım,
Gecə-gündüz yoxdur xabım,
Mətləbi-şeybü şəbabım,
Yarəb, görəmmi didarın?

Çünki bəzmindən irağəm,
Ölüyəm, noldu gər sağəm,
Qayətul-qayət müştağəm,
Yarəb, görəmmi didarın?

Əm etməkdən ötrü yarəm,
Daxi qalmadı mədarəm,
Səndə özgə yoxdur çarəm,
Yarəb, görəmmi didarın?

Tazədir hüsnun gülşəni,
Can bülbülü istər səni,
Fanidir şu dünya, fani,
Yarəb, görəmmi didarın?

Kilki-qəza rəqəm çaldı,
Məni səndən ayrı saldı,
Fələk intiqamın aldı,
Yarəb, görəmmi didarın?

Hicri canıma kar edən,
Könlümü biqərar edən,
Bimarinə timar edən,
Yarəb, görəmmi didarın?

Əmaniyəm, sənin zarın,
Əzəlindən kiriftarın,
Həddin ötdü intizarın,
Yarəb, görəmmi didarın?

* * *

Fələk rəğminə bir nəzər
Görsəm yüzün cananımın,
Qalmaz dərdü ğəmdən əsər,
Görsəm yüzün cananımın.

Həddin ötdü intizarı,
Qalmadı könlüm qərarı,
Canü dil olsun nisarı,
Görsəm yüzün cananımın.

Edibdir ənduhi-hicran –
Gərçi könlümü pərişan,
Hər müşkülüm olur asan,
Görsəm yüzün cananımın.

Topu meydandan qapardım,
Yıxılanımı yapardım,
Könül istəgin tapardım,
Görsən yüzün cananımın.

Dəvasız dərdin dəvasın,
Binəva könlüm nəvasın,
Tapam canım müddəasın,
Görsəm yüzün cananımın.

Dövləti-vəslinə fürsət –
Tapıban məhv olsa firqət,
Əmani, çəkməzdim həsrət,
Görsəm yüzün cananımın.

* * *

Qəddü yüzün mənsux etdi –
Qədrini sərv ilə gülün.
Verdi badə mişkin zülfün –
Ətrin reyhanü sünbülün.

Ey sevgili sərvinazım,
Məhrəmi hər gizli razım,
Çarəsazım, dilnəvazım,
Sən gülsən, mənəm bülbülün.

Təbəssümlə qönçən açdın,
Xəndan olub güllər saçdın,
Əql aparıb gözdən qaçdın,
Pərişan edib kakilün.

Bilmən nə cövhərsən, ey can,
Heyranındır mələk insan,
Gərçi nihandasan nihan,
Aləmə düşmüş ğülğülün.

Hədsiz bitabı olmuşam,
Suzan kəbabı olmuşam,
Məstü xərabı olmuşam –
Ləli-ləbindən ol mülün.

Ta əsər var candan təndə,
Əmani qapında bəndə.
Mövcud etmiş çün həq səndə
Əslini cüzv ilə küllün.

* * *

Fürsət olıcaq hər dəmdə
Qənimətdir səfa sürmək.
Könül əylənməsə qəmdə,
Qənimətdir səfa sürmək.

Suri-yarı həmraz edib,
Müğənnilər dəmsaz edib.
Mütrüblər həmavaz edib,
Qənimətdir səfa sürmək.

Söhbət olcaq əzmi-cəzma,
Əcnəbini qoyma bəzmə,
Keyfiyyətsiz bir dəm gəzmə,
Qənimətdir səfa sürmək.

Yenə gəldi bahar fəsli
Eyş etməkdir anın əsli,
Müyəssərin olsa vəsli,
Qənimətdir səfa sürmək.

Dürüst olıcağız yəqin,
Taparsan könül istəyin.
Seyr eylə məhəbbət bağin,
Qənimətdir səfa sürmək.

Eşq bimarının timarı
Kam ilə görkəmdir yarı.
Asan edər hər düşvarı,
Qənimətdir səfa sürmək.

Eşq oduna yanan sönməz,
Gedən günlər geri dönməz,
Ömrün quşu uşdu qonmaz,
Qənimətdir səfa sürmək.

Dünyanın yoxdu vəfası,
Zahir degil müddəası,
Hər bəqanın hər fənası,
Qənimətdir səfa sürmək.

Varlığını saygil fani,
Məhəbbət məqamın tani,
Əhli-hal ilə, Əmani,
Qənimətdir səfa sürmək.

* * *

Hicran kar etdi canıma,
Bilmən nolacaqdır halım,
Dövran susadı qanıma,
Bilmən nolacaqdır halım.

Bari-qəm qəddim xəm etdi
Səbrü aramım kəm etdi,
Xarü zari-aləm etdi,
Bilmən nolacaqdır halım.

Füzun cünunəm Məcnundan,
Seyli-müjganım Ceyhundan,
Əfqanım ötdü gərdundan,
Bilmən nolacaqdır halım.

Halətim ibrət olubdur,
Rahətim möhnət olubdur,
Adətim riqqət olubdur,
Bilmən nolacaqdır halım.

Göz görmək istər cəmalın,
Könüldə daim xəyalın,
Müyəssər olmaz vüsalın,
Bilmən nolacaqdır halım.

Ayrılıq yulduzu batmaz,
Gecə vayimdən el yatmaz,
Sənsiz könül nəstə çatmaz,
Bilmən nolacaqdır halım.

Firqətindən, canım cani,
Ahum tar etdi cəhani,
Zarəm manəndi-Əmani,
Bilmən nolacaqdır halım.

* * *

Lütfi-pərvərdigarimdən
Könül istədigin tapdım.
Əsəri-ahü zarimdən
Könül istədigin tapdım.

Çəkdim gərçi dərdi-hicran,
Hədsiz edib ahü əfğan,
Mədəd olub feyzi-sübhan,
Könül istədigin tapdım.

Rəvan olurdu gözdən nəm,
Çəkər idim dərdü ələm.
Bihəmdilləh, rəf olub qəm,
Könül istədigin tapdım.

Mənəm, yarəb, səubətdən,
Yüz dürlü dərdü möhnətdən,
Qurtulub çəngi-firqətdən,
Könül istədigin tapdım.

Rəvan olğac qəddi-dalım,
Səmərlər verdi nihalım,
Müddəaca olub halım,
Könül istədigin tapdım.

Təqribsiz irir beğayət
Etmək taledən şikayət,
Çün befeyzi-binəhayət
Könül istədigin tapdım.

Tökülən gərçi dolmadı,
Düşmən deyən həm olmadı,
Məhəbbət gülü solmadı,
Könül istədigin tapdım.

Əmani, məqsədi-mühsəl,
Oldu həsbül-vəchi-əshəl,
Bu səadət yetər mücməl,
Könül istədigin tapdım.

* * *

Ahü əfğandır həmdəmim
Sevgili yarımdan ayrı.
Nəhayətsiz oldu qəmim
Sevgili yarımdan ayrı.

Giriftarəm əcəb halə,
Sevdam yoxdur mülkümalə,
Ney dək bilmən qeyri-nalə
Sevgili yarımdan ayrı.

Tabü təvanım qalmadı,
Bədəndə canım qalmadı,
Ahü fəğanım qalmadı
Sevgili yarımdan ayrı.

Nə yuxlaram, nə oyağam,
Nə sayruyam, nə xud sağam.
Qəm zindanında dustağam
Sevgili yarımdan ayrı.

Bisərü saman olmuşam,
Saralmış xəzan olmuşam,
İyəsiz filan olmuşam
Sevgili yarımdan ayrı.

Fələk, eylədin bildigin,
Canıma qoydun min düğün,
Zarlığdır işim dünü gün
Sevgili yarımdan ayrı.

Lal olmuş bülbülə döndüm,
Pərvanə dək yandım, söndüm,
Filməsəl, düz yurda qondum.
Sevgili yarımdan ayrı.

Yoxdur, Əmani, səri-mu,
Mehrim olsa gər yüz məhru,
Cənnət gülün eyləmən bu
Sevgili yarımdan ayrı.

* * *

İxtiyarım əldən alan,
Şükrülillah, gördüm səni.
Məni hicr oduna salan,
Şükrülillah, gördüm səni.

Məşğul olub xəyalına,
Müştaq idim camalına,
Şərəf tapıb vüsalına,
Şükrülillah, gördüm səni.

Məlahət övcünün mahi,
Könül kişvərinin şahi,
Məhəbbət püştü pənahi,
Şükrülillah, gördüm səni.

Könül yetişdi kaminə,
Dan atdı möhnət şaminə.
Rüxsətdir hicr əyyaminə,
Şükrülillah, gördüm səni.

Bitaqət olub qayətsiz,
Müştaq idim nəhayətsiz,
Təkəllifsiz, hekayətsiz,
Şükrülillah, gördüm səni.

Vəslin könül müddəası,
Dəvasız dərdin dəvası,
Mehrü məhəbbət səfası,
Şükrülillah, gördüm səni.

Sirdaşımız olan qardaş,
Könül istədigi yoldaş,
Fəda yoluna canü baş,
Şükrülillah, gördüm səni.

Göz, könül yüzün heyrani,
Sənsən canımın canani,
Rahəti-ruhi-Əmani,
Şükrülillah, gördüm səni.

## QOŞMA

Bahar oldu, təzə güllər açıldı,
Sərvinazım, sallanıban seyr elə.
Şükufə övrağı hər yan saçıldı,
Sərvinazım, sallanıban seyr elə.

Can bəslənir etidali-həvadan,
Dərdli olan çəkməz minnət dəvadan,
Hər məqamda qulaq dolar nəvadan,
Sərvinazım, sallanıban seyr elə.

Müəssərdir əndəlibdən nalələr,
Saçmış incu səbzə üzrə jalələr,
Eşq odundan dağlar qoymuş lalələr,
Sərvinazım, sallanıban seyr elə.

Hər səhfəsin tərtib etmiş gülün ğeyb,
Öylə kim heç tapmaq olmaz anda eyb,
Qənimətdir yetişməgəy vəqti-peyb,
Sərvinazım, sallanıban seyr elə.

Yaz fəslində səhər quşlar əlhani
Mədhuş edər idrak edər insani,
Bitəkəllüf xürrəm olsun Əmani,
Sərvinazım, sallanıban seyr elə.

Ağzın sirrin qönçə güya eyləmiş,
Qəmzən sehrin nərgis peyda eyləmiş,
Laləni rüxsarın rüsva eyləmiş,
Sərvinazım, sallanıban seyr elə.

Xürrəm olmuş səbzələrdən hər vadi,
Əndəlibi nalan etmiş gül yadi,
Xəcil etgil ərər ilə şimşadi,
Sərvinazım, sallanıban seyr elə.

## QƏZƏLLƏR

Bir təbəssüm birlə huşum aldı duş ol nuşləb,
Valehü şeydayi olsam ta əbəd irməs əcəb.

Canü dil qurban ona kim, bir nəzərdə fəhm edər
Müddəanı nüktədanlıq birlə bihüsnü-tələb.

Bisəbəb irməs başımla gəlməgim pabus içün,
Astanınğa ğədəm basmaq irir tərki-ədəb.

Bu səadət ikki aləmdə yetər min zarğə –
Kim, vəfa əhli səgi-kuyin qoyubdurlar ləqəb.

Aşiqi-dilxəstənin baliniğə canan qədəm
Bassa, sidq ilən nisar edər rəvanin bitəəb.

Kim ki, məsti-peyxumari-badeyi-vəhdət olur,
Mütləqa meyli iməs kim, şürb edə mai-inəb.

Ey Əmani, bir nəfəs aramım olmassa, nə tan,
Hicr bimarı olan bolmas dəmi bitabü təb.

* * *

Məni dövrani-fələk eylədi bimarü qərib,
Əcəbüm bar kim, ola dövləti-didar nəsib.

Könlümün dərdini bilmən nə mərəzdir, ya rəb –
Kim, əlacını anın tapmadı heç növ təbib.

Ey rəfiq, eyləmə rüsvalığımı mən ki, bar
Afəti-dinü dil ol qəmzeyi-pürməkrü fərib.

Eşq divanəliğin tərk edə bilmən hərgiz,
Boldu Məcnunğə cünun haləti çün zinətü zib.

Müşfiqa, sakini-beytül-həzənəm, peyvəstə,
Bidilü zarü həzin bolduğumu sanma əcib.

Hiç bab ilə könül, qəm yemək irməs hacət,
Səhl irür cümlə günəh bolsa əgər lütfi-həbib.

Müğtənim bilgil, Əmani, ğəmi-eşqi təğyir
Tapmadı, hər necə səy eylədi bidilğə ədib.

* * *

Sabitqədəm olsa aşiqi-zar,
Didarını görsədir ana yar.

Hicran qəmi aşiqə degil səb,
Gər tapsa vüsali-bəzmiğə bar.

Məşuq ilə aşiqin adasın
Eşq eylədi aləm içrə izhar.

Ol kimsə bilir nədir təəşşüq,
Mənzuri-nəzərğə bar giriftar.

Qayib olalı yüzü gözümğə
Mehr ənvarı dolubdurur tar.

Ol aşiqə eşq irir müsəlləm,
Öz halətidin degil xəbərdar.

Ya rəb, qəmi-hicrdin, Əmani,
Barmola sənin kibi diləfgar?

* * *

Könül əfqan edib cananın istər,
Beqayət dərdi bar, dərmanın istər.

Gözün giryanlığı irməs əcəb kim,
Şüküftə qönçeyi-xəndanın istər.

Kəməndi-mürği-ruh içün dili-zar
Şikənci-türreyi-piçanın istər.

Yürək qanı təəşşüq aləmidən
Səhami-qəmzənin peykanın istər.

Zəmirim müttəsil can ərsəsidə
Səməndi-nazının cövlanın istər.

Güli-rənayə bax kim, bülbülünün
Həmişə naləvü əfqanın istər.

Zəvali-möhnəti-hicran görüb can
Vüsal əyyamının tüğyanın istər.

Xəyali-zülfidə əjdər kibi dil
Məhəbbət gəncinin viranın istər.

Təəllüqsüz iməs heç kim cahanda
Əmani nəzminin divanın istər.

* * *

Bu fənadə beş gün üçün başda yüz sevda nədir?
Çün degil baqi, xəyali-məskənü məva nədir?

Ey xoş ol şeyda ki, canan eşqinin sevdasidən
Etməmiş idrak kim, dünya bilən üqba nədir?

Əksi-mirati-cəmalın hər nəfəs bir vəch ilə
Cilvəgər edər, günahi-aşiqi-şeyda nədir?

Öylə müstəğrəq bolubmən eşq istilasiğə –
Kim, könül məllahı bilməz sahilü dərya nədir?

Silki-əhli-eşqə sayılmaq dilərsən, ey könül,
Dərdə xürsənd ol, dəmadəm ahü vaveyla nədir?

Yox çü ümmidi-əsər nəşvü nümadən danlaqa,
Bülbüli-şeydayə, ey gül, munca istiğna nədir?

Qürb ümidi birlə canan kuyinin ətrafidə
Xakə yeksan ol, Əmani, özgə istida nədir?

* * *

Xoşvəqt bol, ey dil, yenə canan gələcəkdir,
Nabud olan cism eviğə can gələcəkdir.

Hicran ələmidən, könüla, olma pərişan,
Çün aqibət ol nadiri-dövran gələcəkdir.

Bitab irir zərrə sifət can quşu daim,
Ol zövqə ki, xurşidi-dirəxşan gələcəkdir.

Hicran gecəsi tirəliğidən yemənəm qəm,
Axır yanıma çün məhi-taban gələcəkdir.

Bu qönçəsifət könlümə qəmxarı irir səhl,
Xürrəm yenə çün ol güli-xəndan gələcəkdir.

Pünhan neçük olğay tələbim qeyridən, ey dil,
Rəğmiğə anın yar-nümayan gələcəkdir.

Rəhm eylə Əmaniğə, əcəl, alma rəvanın,
Çün yaniğə ol sərvi-xuraman gələcəkdir.

* * *

Yüz tuman möhnət ilən qalmışam, ey can, sənsiz,
Dünü gün könlüm edər naləvü əfqan sənsiz.

Tanriçün, ey qədi tuba, yüzü gül, zülfi səmən,
Yetə gör, göydü məni atəşi-hicran sənsiz.

Hicr vadisidə qəmxarləridən, ey gül,
Yürəgim qönçəsifət boldu, tola qan sənsiz.

Könülə lalə tügün, didəğə gül boldu tikən,
Seyri-bağ etməsəm, ey sərvi-xuraman, sənsiz.

Ömr yüz möhnət ilən keçdi, vəli bilməsmin,
Aqibət necə bolam bidilü nalan sənsiz.

Şərh edər cənnəti vaiz, vəli bilməs anı kim,
Eyləməs meyl ana aşqi-heyran sənsiz.

Etməsən rəhm Əmaniğə, anı hicr qəmi,
Varlığından yox edər, ey məhi-taban, sənsiz.

* * *

Ey səba, halımı qıl yarıma ərz,
Dilimin dərdini dildarıma ərz.

Çəkdigim möhnəti-hicran sitəmin
Edə gör qəmzəsi xunxarıma ərz.

Necə bir şərh qəmimni eləsin
Cani-nalan dili-əfgarıma ərz?

Bu məratibğə fələkdən yetdim
Halım iqbal edər idbarıma ərz.

Ey Əmani, mana bu fəxr yetər,
Edərəm sirrimi səttarıma ərz.

* * *

Bu fəsli-baharın yenə xoş çağına bax,
Bağ içrə-şükufələnin iğraqına bax.

Bir sərvqəddi-səmənü bir laləüzar,
Naz ilə xuraman olıcaq sağına bax.

Ol şuxi-pəripeykəri-gülruxsarın
Divanə olan aşiqi-müştağına bax.

Mehrabi-könül eyniğə bolğan əzəlidən,
Göz ucidə əbrulərinin tağına bax.

Rəngin yürəgim qanı bilə etmişdür,
Ol şuxi-kamandar oxunun fağına bax,

Bəzm əhlini məstü naşəkiba eyləgən,
Şol badə verən saqinin iqrağına bax.

Kəm eyləmədi mərhəmətni halimdən,
Xublar şəhnin, Əmani, işfağına bax.

* * *

Xoşhal bol, ey dil, yenə cananə irişdik,
Fərsudə bolan cism kibi canə irişdik.

Dərdü qəmi-hicranə dəxi tab yox irdi,
Əlminnətülillah ki, dərmanə irişdik.

Ol bülbülü-dey zülmünü görgən kibi nagəh
İmdadi-bahar ilə gülüstanə irişdik.

Ğəvvas oluban daldıq əgər bəhri-sirişkə,
Əcr olmadı zaye, düri-ğəltanə irişdik.

İstəklərimiz cümləsi mövcud olacaqdır,
Çün bəzmgəhi-işrətə rindanə irişdik.

Can nəqdini isar edəlim gəlgil, Əmani,
Şəmi-rüxi-cananə çü pərvanə irişdik.

* * *

Eynim yüzünə olalı heyran,
Əqlim çaşıb, olmuşam pərişan.

Lölö dişinə demək xətadır,
Ləli-ləbinə həm abi-heyvan.

Ya rəb, gün irirmi ya tolu ay
Yüzün ki, ziyasın eylər ehsan?

Qaşü gözü xəttü xal birlə
Qıldın dilü könlümü şitaban.

Lazım məni-tilbəğə bolupdur
Leyl ilə nəhar ahü əfğan.

Yoxdur çü mənim kibi diləfgar,
Yalğızca qalan əsirü nalan.

Bu halətə xoşdiləm kim, irməs
Bitablığım yanında pünhan.

Yeksan elədi təəşşüqi-eşq
Yadınla könülğə vəslü hicran.

Gözümğə iki cəhan görünməs
Gərmi-nəzərin olanda, ey can.

Oldu səni görgəli Əmani
Avarə miyani-küfrü iman.

* * *

Ey könül, çün heç kimə qılmaz vəfa axır cəhan,
Öylə san gördün mükərrər min bəhar ilən xəzan.

Arifə fərq eyləməz ömrün çoxü az olduğu,
Çün müyəssər bolmas insanğa həyati-cavidan.

Hatifi-lareybdən yetdi nida can guşiğə:
Məhmili-məqsud keçdi, yatma, ey qafil, oyan.

Çünki rəzzaq eyləmiş məqsum hər şey rizqini,
Minnəti-dunan neçün çəkmək gərək bəhrü-dü nan?!

Bir səri-mu eyləmək bolmaz bəyani-şükrünü,
Hər səri-mu bolsa şükrün etməgə yüz min zəban.

Ömr anın yadı bilə sərf et, sağın əğyardən,
İstəsən kim, ikki aləmdə bolasın kamran.

Ey Əmani, yardan bir ləhzə ğafil bolmagil –
Kim, ötər ömrü yetər səngi-əcəl, berməs aman.

* * *

Gəlgil, ey dərdi-dilə dərman edən,
Vəsli birlə müşkülüm asan edən.

Mən əsiri-zarni pərvanə dək
Nuri-rüxsarınğa sərgərdan edən.

Bəhri-qəmdə eşq ğəvvası üçün
Daneyi-əşkim düri-ğəltan edən.

Sünbülü nərgis bilə oldun, büta,
Canü dil aşüftəvü heyran edən.

Aqibət tapğay həyatı-cavidan
Sidq ilə canın sana qurban edən.

Gülşəni-hüsniğə könlüm mürğini
Əndəlibi-valehi-nalan edən.

Dün gecə növhəm eşitgəc dedi kim:
Bu Əmanidir yenə əfğan edən.

## RÜBAİLƏR

Sənsiz nəfəsi səbrü qərarım yoxdur,
Nəzzarədən özgə intizarım yoxdur.
Bitablıqımda ixtiyarım yoxdur,
Təşrif gətir ki, qəmküsarım yoxdur.

* * *

Əfsus ki, yar getdi, qaldım bikəs,
Məhcurü əsir mən kibi heç kim iməs.
Könlümdə irir həsrəti-yüz növhəvəs,
Cüz nalə iməs daim işim misli-cərəs.

* * *

Nə lütf idi nagəhan ki, bünyad etdin,
Bir namə bilə Əmanidən yad etdin.
Hicr içrə pozuq könlünü abad etdin,
Əlqissə ki, qəmdən anı azad etdin.

* * *

Görmək yüzini ki, bihəd irir həvəsim,
Heç növ ilə neylə iməs dəstrəsim.
Qorxum bu ki, nagəh əcəl alğay nəfəsim,
Həsrət bilə könlümdə qalay mültəməsim.

* * *

Dövran məni etgüncə cüda canandan,
Ey kaş, iraq salaydı cismim candan.
Görgən sitəmi dəli könül hicrandan,
Nə şərh edim, ötüpdürür imkandan.

* * *

Yüz şükr ki, gəldik, yenə kaşanəmizə,
Yetdik şərəfi-vüsali-cananəmizə,

Hərçənd qılırsa naz ol fərzanə,
Minnətlər irir bu dili-divanəmizə.

* * *

Hərçənd ki, yar bizni yad eyləmədi,
Qəmdən edibən xilas, şad eyləmədi,
Lakin nəfəsi xüfyəvü izhardə dil,
Bidadidə heç növ ilə dad eyləmədi.

* * *

Əlminnətülilləh, yenə canan gəldi,
Hicranğə şikəstü vəslə tüğyan gəldi,
Dərdi-dili-nalanimə dərman gəldi,
Fərsudə bolan cism eviğə can gəldi.

# MƏSİHİ

*XVI–XVII əsrlərdə yaşamış ən görkəmli şairlərdən biri "Vərqa və Gülşa" poemasının müəllifi Məsihidir. 1580-ci ildə anadan olmuş, gəncliyində Kaşanda yaşamış, İsfahan şəhəri Səfəvilər dövlətinin mərkəzinə çevriləndən sonra təhsilini orada tamamlamışdır. Təbibliklə ömür keçirən şair xalq içərisində Həkim Rüknəddin adı ilə də məşhur olur. 1655-ci ildə Kaşan şəhərində vəfat edib.*

*Azərbaycan və fars dillərində yazdığı əsərlərinin ümumi həcmi 100 min beytə yaxındır. Daha çox "Vərqa və Gülşa" poeması ilə tanırır. Poemanın sonundakı qeydindən məlum olur ki, onun "Danəvü Dam", "Zənburü əsəl" əsərləri də olub.*

## VƏRQA VƏ GÜLŞA

(*poemadan parçalar*)

Bu, Gülşən Xud Təmaşagahi –
Bəzmi-Suri-Gülşadır
Əsbabi-təhəmmüli-ərusi,
Qıldıqda hilalə paybusi,
Buyurdu düzün yəraqi-suri
Tərtib edin aləti-süruri.
Söz yolda hənuz kam fərsa,
Əsbabi-nikah olub mühəyya.
Ol gülbünə verdilər bəşarə,
Ta necə xəyali-intizarə.
Batıb yürəginə qoyasan dağ
Ey laleyi-bağü səbzeyi-rağ.
Dur, yetdi həvayi-novbəharın,
Dəmdir açıla güli-bəharın.
Pəs anası gəldi ol miyanə,
Ta mürğinə verə abü danə.
Təqrib ilə söylədi həqiqət,
Verdi rüxi-nəqlə zibü zinət.

Gülşa dutuban təriqi-nazi,
Nə nazki, eyni-karsazi
Dedi ona: Ey əzizim ana,
Qəm oduna abrizim ana!
Qılma məni oxlara nişanə,
Minbəd mənü bu künci-xanə.
Ol nəşəni anlamaz məzacım,
Yox məndə həvayi-izdivacım.
Qoygil məni başın içün əldən,
Nə sud mənə de ol əməldən?!
Məndən sənə yox bu işdə təmkin,
Qanı, degil ol əvvəlki ayin?!
Heç gəldin olub mənimlə həmdəm,
Dedin nə durur bu vəzi matəm.
Qoygil bu məni siyah bəxti,
Niyli qıləyim müdam-rəxti.
Mən qandənü zinəti-ərusi,
Ya meyl libasi-rumü rusi.
Hala zərurin oldu malə,
Saldın məni-xəstəni xəyalə.
Az eylə məni cəfayə həmsər,
Sən talibi-malsan nə düxtər!
Ol rəmzdə göstərib cəladət,
Tiği-süxən ilə min cərahət.
Urdu anasına ol siyahbəxt,
Dilrənclərin olur sözü səxt.
Durdu anası rəhi-əlacə,
Möhtac idi çün ol ehtiyacə.
Əfsun nəqdin töküb miyanə,
Ol vəhşiyə qıldı damü danə.
Ahəstə der, ey gözüm qərasi,
Can rahəti, xatirim səfasi.
Sən söylə olurmu, söz bərabər?!
Sən söylə olurmu, ey səmənbər,
Bu ikidə fikrü söz bərabər?!
Mən aqilənin sözü həqiqət,
Sən cahilə yox məgər nəsihət?!

Çün bilməz idin məali-kari,
Qorxum bu idi olub şikari,
Cəhl-abi verəydi şüstü şuyin,
Qalmazdı bu gündə rəngü buyin.
Ey cismi-zə ifimin rəvani,
İnsaf ver anla bu bəyani.
İslahına eylədim cəsarət,
Namusuna yetməsin xəsarət.
Oldun neçə gün əgər həsari,
Saldın yüzə pərdeyi-əyari,
Açdın yüzə babi-niknami,
Aldın qəmudən xəti-qulami.
Zəbt eylədügündə nəqdi-məqsud,
Həm mayə bu gün əlində, həm sud,
De olduğuma bu əmrə mane,
Nə mayə əlindən oldu zaye?
Bəlk oldu bu yüzdə etizalın,
Cananına rəğbəti-vüsalın.
Gər bağlamasam rəhi-təmənna,
Tez verməz idi nəticə sövda.
Hərçənd ki, az olursa rəğbət,
Mən artırır arzuvü həsrət.
Vəqt oldu dur imdi, ey xiridar,
Tök nəqdini al vüsali-dildar.
Şəbxanədə neçə bir qünudin
Dəmdür doğa neyyəri-şühudin.
Axır bu vücudə çün ədəmdir,
Dur eyş keçirmə dəm bu dəmdir.
Hiç istəmiş ola der nişanın,
Durub ana qızının ziyanın?!
Ey iki gözüm, özün qıl iqrar,
Səndən özgə mənim kimim var?!
Çün dövr edə növbeyi-cəvani.
Yüz göstərə ruyi-natəvani.
Üzdən gedə görəsən özümni
Sən yumasan ağzımı, gözümni.
Çün mərg iyidin dola dəmağım,

Sən uzadasan əlü ayağım.
Cismim ola xakə çün nəvalə,
Gəh-gah məni salıb xəyalə,
Gəh göndərəsən mənə dualar,
Gəh lütf ilə edəsən ətalar,
Güm olmaya xəlq içində namım,
Baqi ola səndən ehtiramım.
Əfsaneyi-bülbüli-köhən sal.
Çün qönçə o gülün eylədi lal.
Gördü dolu cami-müddəasın,
Ayineyi-təbinin səfasın,
Fəhm eylədi rəmzi-qalü qili,
Pəs qıldı nəvaziş ol əlili.
Dedi ona ey qəmim ənisi,
Atə-anədir qızın vəlisi.
Yox məndə bir iş xilafi-rayın,
Eylə nə ki vardır ixtiyarın.
Qıldı o sənəm çü nikxuliq,
Dildarliqü güşadə ruliq.
Pəs anəsi dilgüşad durdu,
Qəmnak oturdu, şad durdu.
Bir cəşni-zənanə qıldı tərtib,
Yetdi ona çeşmi-zəxmi-asib.
Cəm etdi gülün o büstanın,
Xatununu hər hərəmsəranın.
Təklif edib evbəev ulusi,
Çağırdı qəmu qızı ərusi.
Bir nəch ilə qurdu bəzm o məşku,
Firdovs ani gördü gizlədi ru.
Firdovs o məhfili-sururi,
Bakirələr anda düxti-huri.
Nə ism təamə qoydu rəssam,
Hazir qəmu qılmış anda münam.
Gər məşrəfi-tir edə hesabi,
Xəm eyləyə qövsi iztirabi.
Bin naz ilə ol pəriliqalər,
Diul riştəsi din girehgüşalər.

Bir-birinə eyləyib sədaqət,
Göstərdilər oynamaqda halət.
Ol məcmə içində aşkarə,
Gülşa məh idi, olar sitarə.
Hərçənd durub o nazəninlər,
Xatirləri, özləri əminlər,
Səy ilə düzüb səfayi-tiynət,
Bir-birinə artırırdı ziynət.
Şayəd olalar o mahə həmqədr,
Pərvin necəsi olur məhi-bədr.
Ol hüsn ilə aləmin xəraci,
Ol məhfili-surin ibtihaci.
Bir rəng ilə qıldı ərzi-surət,
Məşşateyi-əqlə yetdi heyrət.
Doğduqda o kövkəbi-nəhari,
Yetdikdə o şahidi-bəhari,
Gizləndi şüaidə kəvakib,
Güm eylədi qönçələr məratib,
Odğazəyə saldı rəngi-ruyi,
Xəm sünbülə urdu piçi-muyi.
Mirvari yetişmədi vüsalə,
Dün safda olmaz ayə halə.
Sürmə gözidən olub siyəh ruz,
Vəsmə qaşın rəngidin cigər suz.
Dil vermədi ol səfid abə,
Tən etdi o girdi-asiyabə.
Anınilə der səfa tələfdir,
Məh ruyinə qeyri-məh kələfdir.
Dövr etdi otağə atdı pəncə,
Der bu səri-hüsnədir işkəncə.
Xatir sevməz bu ixtiyari,
Sər necə yetər xurə şüayi.
Rəngi-rüxi-ol büti-pərivəş,
Gülzari-cəhanə saldı atəş.
Yüz xaneyi-Kəbənin misali,
Şəbə həcər oldu yüzdə xali.
Gördükdə dişin zəmani-göftar,

Saldı suya özünü dürri-şəhvar.
Ta ağzına baxdı qönçə bitab,
Şərməndə olub buraxdı təbbab,
Kuyi zəğənində çahi-hirman,
Gülzar bulanda babi-zindan.
Ol zülfi-siyahi-tabdərtab,
Gündüz gecədir kəsincə təvvab,
Hər kim ki, girəm desə o bağə,
Meyl eyləsə seyri-bağü rağə.
Əvvəl sala ölüçə cəmalə,
Axır çəkə zirveyi-kəmalə.
Əvvəl duruban asa o çahə,
Axır çəkə övci-məhrü mahə.
Əvvəl qıla dəstü paybəndi,
Axır ola yarlıq kəməndi.
Yox-yox o xülasədir əyarə,
Kimin düşə nəqdi etibarə.
Məşşatəsiz ol qəmə giriftar,
Açdıqda o cəmə ruyi-rüxsar.
Kim gördü dedi o məhzi-nuri,
Həqqa ki, degil məgər bu huri?!
Ol saxtə vəzə vermədi dil,
Kamil olan istəməz mükəmmil.
Çün hüsn özidin bula rəvaci,
Məşşatəyə qalmaz ehtiyaci.
Saət-saət o kani-təmkin,
Ol bəzmə düzərdi tazə ain.
Bir növ əsasi-eyşi-möhkəm,
Qıldı özünü güm-eylədi qəm.
Leyk ol gülə iştiyaqi-bülbül,
Düşmüş getmiş olan təhəmmül.
Xatirdə xəyali-yar-mehman,
Başında həvayi-vəsli-canan.
Der necə əsir olam xəyalə,
Ola yetişəm şəbi-vüsalə.
Sur əl ura daməni sürurə,
Bu zülməti yetirə o nurə,

Gəh səbr ilə eylər ittifaqi,
Kim səhl ola iki gün fəraqi,
Bilməz güya ki, əksər ovqat,
Təxirə durur nəticə afat.
Çox kimsə içəm dedi müdami,
Əldən düşübən uşandi cami.
Gər aqil isən eşit nəsihət,
Bir əldəki fürsəti qənimət.
Bu amileyi-həzar didə,
Səy ilə qəd eyləmiş xəmidə.
Təhrir edə çərx ruznamə,
İltə o hesab gah şamə.
Təğyir verə səfayi-halə,
Edə qəmə baqisin həvalə.
Bir vəz ilə yox anın mədari,
Əhbabə nəqiz karü bari.

## BU, GÜLŞAYİ-HƏZİNİN ANASİLƏ MACƏRASIDIR

Çün sağəri-badeyi-vüsalın,
Yəni anası o məh xisalın.
Pünhan qəmu düzdü dəstgahi,
Ol gecə ki, edər idi rahi.
Yıqdırdı cəhazi bir zəminə,
Ərz etdi qəmu o nazəninə.
Şayəd ki, malə ola mayil,
Özün bəzəyib düzə şəmayil.
Ol vaqiədən qılıb xəbərdar,
Dedi ona: Dəxi çəkmə azar.
Hərçənd ola səndə sərgiranlıq,
Lazım mənədir bu mehribanlıq.
Şadiyi zahir qəm oldu axir,
Təqdiri-xudayə olma kafir.
Dur vergil özünə ziynətü-zib,
Sən yarə bu şivə eybdir eyb.
Çəkmə dəxi qüssəvi-məlali,

Al ayinə düzgilən cəmali.
Bu surətə qılma tirə mirat,
Bəlkəm durub eyləgil mübahat,
Bilgil muni, ey rəvani-madər,
Dövlət oldu sənə müyəssər.
Nahidə müqarin oldu ol mah,
Yəni sənə həmsər oldu bu şah.
Yetdikdə bu bürcə aftabi,
Qıldı səni Şam mahtabi.
Çün yandı bu nurdən çirağın,
Ol camilə tazə qıl dəmağın.
Ol kim sənə qoymuş idi əngüşt,
Olmadı durub səninlə həmpüşt.
Tərk eylədi getdi bu diyari,
Yığ xatirü çəkmə intizari.
Bir kişi ki, istəməz vüsalın,
Sən dəxi kəs andan ittisalın.
Mundan gedəli bəsi zamandır,
Məchul işi sud ya ziyandır,
Vərqayə əgər biteydi məqsud,
Bu canibə qayıdırdı ol zud.
Ya bitmədi vardığında kami,
Yaxud aradən güm oldu nami.
Ya bir gözəlin görüb cəmalın,
Aldandı ona verib xəyalın.
Həqqa ki, dəlildir xəyalə,
Əglənməgi bu üç ehtimalə.
Həm qıldığı vədə oldu axir,
Göstərmədi məhmil ol müsafir.
Əhli-Yəmənə yetən bəlanı,
Əntər olara qılan cəfanı.
Şərh etdi qəmu o mah ruyə,
Rəh bağladı anda göftguyə.
Gülşa ki, xəbərdən oldu agah,
Kim neyləmiş ona bəxti-gümrah.
Düşdü tənü cani iztirabə,
Aciz qaldı durub cəvabə.
Bəs eylədi firqəti bəhanə,

Durdu o vəsilədən fəqanə.
Dedi anaya: Nədir bu tədbir?
Məndən nişə oldu xatirin sir?
Yenglə məni dilfigar qıldın,
Qürbətdə zəlilü xar qıldın.
Bu mülkdə yek mənə gədalıq,
Yox Şam elində padşahlıq.
Tənha düşdüm mən ol diyarə,
Möhtac oldum ənisü yarə.
Gər dərdi-dilə olam giriftar,
De kimə qılam o dərdi izhar.
Başımda mənim yox ər həvasi,
Canə qəmu dərddir dəvasi.
Cayizmi durur bu, ey müsəlman?
Heç kimsəyə aşkarü pünhan.
Bir vəqtdə edələr müqərrər,
Bir övrətə sahib iki şövhər?!
Bir seydə quran bu iki dami,
Qanda aparır o nəngü nami?
Mal oldu sənin bu gün vəbalın,
Beytülmala qala bu malın!
Oldun mənü yar səddi-rahi,
Dutsun səni bu ikin ahi!
Axir ki, bu fikri-xanəzadın.
Verdi duruban sənin muradın.
Avarə ani qılıb cəhanə,
Atdın məni dəxi bir kəranə.
Biz xud verdik riza qəzayə,
Sən həm yetəcəksən ol cəzayə!
Bu sözdə idi hənuz o məhcur,
Nakamlıq etdi ani rəncur.
Döndərdi ətiqi kəhrübayə,
Söz fürsəti qalmadı ol ayə.
Zəhrə bədəl oldu nuşi anın,
Düşdi yerə getdi huşi anın.
Keçdi neçə saət ol Hümayə,
Ta saldı ona şüur sayə.

## BUDUR, GÜLŞAYİ-NAKAMIN VƏSİYYƏT QILDIĞI SƏRVƏ

Çün gəldi özünə ol vəfadar,
Bildi yoxdur əlaci-bimar.
Möhkəm dutuşubdur ol şərərdən,
Qurtulmağı yox durur zərərdən.
İbram ona yetirir qəramət,
Fəryadə nəticədir məlamət.
Yox əldə inani-ixtiyari,
Etmiyə qəbul olan qərari.
Hərçənd ki, yox idi rizasi,
Lal eylədi şiveyi-həyasi.
Tapşırlı özin verib cəfayə,
Ol ürzdə irzini xudayə.
Fikr eylədi ol qəm aşinası,
Gər xaneyi-dərd kədxudasi.
Gəldikdə bu rəmzə ola qafil,
Olmuya rəhi-əlacə acil.
Novmid olub eyləyə cüdalıq,
Nisbət mənə ola bivəfalıq.
Görməz dəxi göz anın cəmalın,
Bulmaz dəxi can anın vüsalın.
Hərçənd mahal ola ümidi,
Kəsməz andan könül nəvidi.
İstərdi birini ol cigərxar,
Ol dərddən eyləyə xəbərdar.
Saxliyə bu nəngü arın anın.
Ərz eyləyə görsə yarın anın.
Həmtaşlar içrə mundan əqdəm,
Qılmışdı birin özünə həmdəm.
Sərv adı o sərvi-bustanın,
Həmrazı idi bu dilsitanın.
Agah idi cümleyi-cəfadən,
Cangah idi ol çəkən bəladən.
Ol həmqəmdən degildi xali,
Bağlı idi birinə xəyali.

Bilmişdi nə suzi-atəşi-eşq,
Zahiri-batini müşəvvəşi-eşq.
Təqribi-vida ilə o sərvi,
Bu kəbkin ənis ol təzərvi.
Çağırdı ona o macərani,
Dedi qəmu nolduğu cəfani.
Pəs söylədi, ey qəmimdə qəmxar,
Bu dərdimi eyləməkdən izhar.
Oldur qərəzim ki, gözlə yari,
Qəmxarına eylə qəmgüsari,
Fürsət mənə yox yığıb xəyalım,
Vərqayə yazam nə oldu halım?
Gər görsən ani yetir dualər,
Məndən ona ərz qıl sənalər.
Pəs söylə ki, ey mənim rəvanım,
Vey qibleyi-ruhü cismü canım.
Bu şivə degildi ixtiyari,
Döndərməmiş əm olan qərari.
Yox gövhərə ixtiyari-bazar,
Əmma ki, təsərrüfindədir kar.
Sağınmagil, ey büti-şəkər ləb,
Əlmasə təsərrüf edə məsqəb.
Olmamış o zur zirdəsiti,
Gər olsa qəbul edər şikəsti.
Bu şüğlidə məndən ol nigarə,
Bir faidə yox məgər nəzarə?
Gər nuri-çirağə olsa qane,
Bu istəkdən ona nə mane?!
Həm mən qalamü həm ol səlamət,
Heç birə yetişməyə nədamət.
Məğrur ola gər o şanü cahə,
Olmiyə qənaəti nigahə.
Alam ələ tünd qəmzə tiğin,
Tökəm yerə xuni-bidirğin.
Gər əl uzadam deyə vüsalə,
Yaxam ani atəşi-cəmalə.
İşvəm oxu kim dilər bəhanə.

Anı ona eylərəm nişanə.
Ta ola ona dəlik-dəlik tən,
Can mürğin uçmağınə rövzən.
Şanın buraxa görəndə şanım,
Güm ola gər istəsə nişanım,
Cahın caha qılam həvalə,
Ol guşədə döndərəm Hilalə,
Zülfüm kimə eyləsə kəməndi,
Necə açar ol kişi bu bəndi?!
Sunam ona vəqti-kamrani,
Bir növ şərabi-həmzəbani.
Yox ola şüuri, çarəsindən,
Bəlkəm xəbəri nəzarəsindən.
Bir növ ona füsun edəm saz,
Həmraz sənə ola, nə ənbaz!
Eylə alayım ələ rizasın,
Xuni-dilin eyləyə qəzasın.
Yadın dəvirəm, pozub məzacın,
Bir ahilə cümlə təxtü tacın.
Gəl ver güli, çəkmə gəl gəm, ey yar,
Yetməz gülzarə dəsti-əğyar.
Məhsulunu ver girib bu bağə,
Bu meyvə degil nəsib o zağə.
Görsəm qalmaz əlimdə mayə,
Asan düşmək rəhi-fənayə,
Sənsiz mənəm, ey niku şəmayil,
Qucmaz qədimi məgər həmayil?!
Məhrəm mənə sayeyi-qədimdir,
Həmxabə türabi-mərqədimdir.
Çoxlar istər əgər vüsalım,
Leyk ayinədir görən cəmalım.
Zülfüm əgər etsə meyli-bazi,
Söylər duruban səbayə razi.
Açmaz ləbimi məgər kitabım,
Dutmaz əlimi məgər xəzabım?!
Fikr etmə səni unutdu xatir,
Gəl gör məni lafım ola zahir.

Əğyar qurursa dami-hiylə,
Zinhar uyma o qalü qilə.
Bu dövrdə axtəri-zəvalım,
Saldı məni Şamə pozdu halım.
Qıldıqda vəsiyyət ol cigərxar,
Bəs Sərvə dedi ki, ey vəfadar,
Al bu üzügü dəxi nişanə,
Ta rəf ola şiveyi-bəhanə.
Var qazılı bu niginə adım,
Ol ad salır zəmirə yadım,
Vərqa gəlir olsa bu diyarə,
Anıb məni düşsə ahü zarə,
Vergil muni dərdü dil bəyan et,
Əsrari-nihanımı əyan et.
Gər gəlməsə, anmasa, o dilxah,
Ol günü mənü hicrü naləvü ah.
Əmr ilə çəkib bu dərdü suzi,
Səbr eyləyəlim bu idi ruzi.
Pəs içdi durub vida camın,
Bu şeir ilə xətm edib kəlamın:

**QƏZƏL**

Hiç kim ya rəb, mənim tək didə pürxun olmasın,
Duzəqi-ümmid sınsış, qərqi-Ceyhun olmasın.

Rütbeyi-idbar ali, payeyi-iqbal-pəst,
Şərtəsi kəm, taleyi dun, bəxti varun olmasın.

Xərməni-səyin yığıb, silabə vermişlər kimi,
Hasili-ömri ziyanü mayə məğbun olmasın.

Bu siyəh bəxti-əzəl getdikcə oldu müstəmənd,
Kimsəni əhvalı əvvəldən digərgun olmasın.

Kim təami xuni-dil olsa, şərabi dərdü qəm,
Nigər üçün, naseha, ol necə məhzun olmasın.

Görsən ər bu bağara, ey Sərv, o gül rüxsarımı
Söyləgil kim bağban keydinə məftun olmasın.

Çün Məsihi, güşeyi-qəmdə bəla ərbabıyam,
Mülkəti-Cəm, təxti-Dara, gənci-Qarun olmasın.

## BUDUR, VƏRQAYƏ OL KEYDİ-QƏMƏRDƏN SƏRVİN ƏXBARİ

Əfqan edib ol sitəmrəsidə,
Heç ruy ilə olmaz aramidə.
Saymışdı səhih ol düruği,
Əksiltdi düruğ ona füruği.
Hərçənd Hilal edər təmənna,
Tərk eyləməz ol ədani Vərqa.
Gündən-günə artdı zəfi-hali,
Az qaldı ki, xüşk ola nihali.
Xali olmaz rəqibdən hal,
Ta sərv ona söyləyeydi əhval.
Bir gecə yuxuya vardı əğyar,
Fürsət bulub ol büti-vəfadar.
Vərqayə yetişdi ol pərivəş,
Çığırdı ona ki, ey bəlakəş,
Ta necə bir uyasan düruğə,
Aldanma bu şəmi-bifüruğə,
Ey sadə zəmirü pak kirdar,
Necə verəsən özünə azar.
Bəs sineyi-gərmü ahi-sərdin,
Gəl məndə durur dəvayi-dərdin.
Dur yoluni kəsmə aşinadən,
Ta qurtulasan düşən bəladən.
Vərqa görüb ol mələkmisali,
Öz-özünə qıldı bu xəyali.
İstər məgər o pəri şəmayil,
Vərqani özünə edə mayil.
Ləb açdı ki, ey özünə məğrur,

Fərsəx-fərsəx bu dərddən dur.
Göstərmə yüzün, itir xəyalın,
Bir özgəyə ərz qıl cəmalın.
Haşa bu xəyali-şum haşa,
Hər bisərü pa olurmu Gülşa?!
Getgil gerü, məndən üz ümidi,
Bir özgədən istə bu kilidi.
Vərqa olmaz səninlə həmdəm,
Yox məzrəinə bu əbridən nəm.
İçmək dilər idim əldə camım,
Sındı dəxi badədir həramım.
Ol püstə dəhan ləb etdi xəndan,
Dedi ona: – Ey əsiri-hicran,
Yüz heyf sənin kimi cəvanə,
Rəncur edə hiyləvü fəsanə.
Ay oldu bu surəti-misali,
Yəni düzülən bu qəbri-xali.
Qarətzadə eylədi həvasın,
Yıxdı bürcün, pozub əsasın.
Aşiq olana budurmu şivə?!
Bir söz anı sala məkrü rivə.
Dutgil üzə şiveyi-hüjəbri
Al tişeyi-şövqi, sök bu qəbri!
Görgil nə durur kanə məzmun,
Qılma özunu əbəs digərgun.
Gər anda bulunsa ləli-nabın,
Görmək yüzünü olur səvabın.
Gər qəbr görünsə sinə xali,
Yığ başına dağılan xəyali.
Bəs ol yuxudan göz açdı Vərqa,
Sərvə dedi: – Ey büti dilara,
Gəl söylə məcazə bir həqiqət.
Mən gümrəhə göstərib təriqət,
Bu qılmağidən məni xəbərdar
Məlum olunur ki, bir xəbər var?!
Çün sərvə yetişdi ol sənubər,
Sərv ona qəziyyəni sərasər,
Şərh etdi qəmu nəfirü qətmir,

Ol nüktəyə düzdü şərhü təfsir.
Verdi özünü dəxi nişanə,
Təcil ilə dutdu rahi-xanə.
Ta kimsənə olmasın xəbərdar,
Ol arada çəkməsin bir azar.
Çün sağəri-mey töküldü camə,
Bu yetdi o nafədən məşamə.
Cəngal işə saldı gürgi-nəbbaş,
Gəh torpaq atıb, gəhi söküb daş,
Gördü pozduqda ol misali,
Qəbr içidə bir səriri-xali.
Bildi sözü doğrudur o yarın,
Hər nə dedigi bu qəmgüsarın.
Pəs qıldı Hilalə tənə bünyad:
– Key şəhneyi-şəhri-zülmü bidad!
Məndən sizə oldu de nə təqsir?!
Ol necə əməl, bu necə tədbir?!
Yox şərm bu şiveyi-dəğəldən,
Üzrün bətər durur əməldən.
Netdim sizə söyləyin məni-zar,
Hər dəm verəsiz bir özgə azar.
Məndən dönmüş əgər xəyalın,
Ol güm şüdəyə nədir bu falın?
Layiq bu degil duram cidalə,
Məqtul qılam olanda nalə.
Açam yüzümə dəri-ədavət,
Lazım yetirəm sənə xəsarət.
Pa qoysam əgər, təriqi-rəzmə,
Dil versəm əgər durub bu əzmə.
Düşmən əgər olsa kuh dər kuh,
Bir həmləmə dözmiyə ol ənbuh.
Dözmək mənə səhldir cəfayə,
Qılmaq səni mübtəla bəlayə.
Leykə nandən nədir mənə sud?
Verməz bu dirəxt bari-məqsud?!
Getdim səni tapşırıb bu rahə,
Ol xəncəri-səbrü tiri-ahə.
Hərçənd Hilal edərdi puziş,

Artardı o şəmi-dərdə suziş.
Əsbani durub qıldı təfsil,
Ol mali birinə qıldı təhvil.
Qıldı ani ol güruhə sərdar,
Dedi ona: – Səd həzar zinhar.
Ərzə yazdım Səlim şahə,
Göndər buni tez o şəmi-cahə.
Hər nə ki, sənə olur işarə,
Yetür yerə durma intizarə.
Ey mötəməd irsən ol cənabə,
Olduqda müqarin aftabə,
Pabusinə dur yetür niyazım.
Bir-bir ona ərzə eylə razım,
Düzdü mənə balü pər bu meylim,
İstər Şama doğa Süheylim.
Gər versə əcəl həyatə möhlət,
Qayıtmağıma olursa fürsət,
Qılmaz dəxi mən əmudə təqsir.
Qoymaz qala intizar ol pir,
Unutmayınız məni duadən,
Ta feyz bulam o müddəadən.
Vərqa çü bu söznü qıldı rövşən,
Ol məcməə düşdü tazə şivən.
Yığıldı məxadimü cəvari,
Düzüldü fəğan, quruldu zari.
Dedilər ona ki, ey sipəhdar,
Lütfün bizə olmuş idi qəmxar.
Biz cümlə bu vadidə qəribiz
Bir bimariz ki, bitəbibiz.
Götirsə hümay mayeyi-bal,
Bu bəndələrə nə olur əhval?
Yoxdur bu güruhə yarü yavər,
Biz cümləmizüz qulamü çakər.
Vərqa oları yığıb sərasər,
Mərsumların qılıb müqərrər,
Düzdü onların qəmu zərurin,
Əsbabi-nişat ilə hüzurin.

## BU, MÖHSÜN ŞAHIN OL MƏCRUHƏDİR LÜTFİ FİRAVANİ

Saqi, məni yıxdı fəqrü faqə,
Sun bixudə badeyi-ifaqə.
Ver sınmışa mumiyayi-lütfün,
Sal qəlbə o kimyayi-lütfün.
Hərçənd ki, xarü xaksarəm,
Məcruhi şikəstəvü nizarəm.
Qıldım gözə sürmə xaki-rahın,
Dutdum yüzə rahi-bargahın.
Gəl görmə rəva bu cüstü cudən,
Məhrum ola azim arzudən.
Ey sədrnişini-bəzmi-ismət,
Ehsan dəmidir ötürmə fürsət.
Ta sınmıya sağəri-məzacım,
Gəl üstümə eyləgil əlacım.
Nəql eylədi tutisi bu bağın,
Yandırdı fitiləsin çırağın.
Kim bir gün o xosrovi-zəmanə,
Yəni Möhsün şəhi-yeganə,
Meyl eylədi seydü seyri-səhra,
Oldu o həvadə dəşti-peyma.
Yetirdi anı məşiyyət Allah,
Vərqayi-həzinə döndərib rah.
Ol rövzəyə çünki saldı sayə,
Düşdü nəzəri o binəvayə.
Gördü yatır anda ol cəvani,
Yox bəllü anın ki, var cani.
Ağüştə vücudi xakü xunə,
Nə tabi-tənü nə abi gunə.
Leykən şəni verir şəhadət,
Kim vardır o rəhrövə nəcabət.
At ilə donu verir gəvahi,
Ol məcruhə nişani-şahi.
Rəhm etdi ona dili-əkabir,
Düşdü anın üstə tikdi çadir.

Ol bixudə verdi nuşdaru,
Ta yetdi ona şüurdən bu.
İçirdi pəs ona mumiyayi,
Ta evə gətirdi kəndxudayi.
Təsir qılıb dəvavü timar,
Tədric ilə didə açdı bimar.
Gördü o şəhi-büլənd payə,
Xur tək salmış bu mahə sayə.
Ta göz açdı tanıdı ani,
Kimdür o qərib mizbani.
Baş qavzadi, açdı ləb duayə,
Dürr düzdü təbəqçeyi-sənayə.
Bir nəch ilə ol rüsumi-təslim,
Bir növ ilə o ədayi-təzim,
Qıldı ki, o kani-lütfü ehsan,
Ləb pürsişə açdı oldu giryan.
Dedi ona: – Ey güli-səbahət,
Vey bülbüli-rövzeyi-fəsahət,
Kimsən, yetişir kimə nijadın?
Adın nəvü qandadır biladın?
De qanda gedirdin, ey qəmərtaş?
Qani degilən rəfiqü yoldaş?
Oldun degilən kimə həvalə,
Kim saldı səni degil bu halə?
Ya necəsi düşdügün bəladən,
Qurtuldunü çıxdın ol aradən?
Kim oldu sənə bələd bu rahə,
Kim yetirdi bu caygahə?
Vərqa durub açdı dil cəvabə,
Ta söyləyə raz o dil kəbabə.
Dutdu yüzə rahi-ehtiyati,
Ta sınmıya sağəri-nişati.
Der sənə düruğ narəvadur?
Şəhrim adı "Sirri mən rəbadur".
Səd oldu ləqəb məni həzinə,
Yetirdi sənin kimi əminə.
Sövdagərəmü işim ticarət,

Yetdi mənə qayəti-xəsarət.
Xəlq içidə bəllü idi halım,
Beş yüz yükə yetişirdi malım.
Meyl eylədi dil həvayi-şami,
Yük bağladı rahə, qoydu kami.
Ta sərhədi-Şamə yetdi rahım,
Nəkbət oldu əduyi-cahım.
Dutmuş yolu qırx igit hərami,
Hər biri anın ol işdə nami.
Açdılar üzə dəri-nəbərdi,
Zahir qəmu qıldı zəru-mərdi.
Mən yalquzdən hücümi-əda,
Axir durub aldılar təvana.
Məcruhəyə oldu mal qarət,
Halım verir ol işə şəhadət.
Kişi özidən demək xətadır,
Andan məni qurtaran xudadır.
Bildim muni, çıxdım ol aradən,
Qurtulmağımı o macəradən.
Yox dəxi xəbər nə oldu halım,
Mən mundavü qanda getdi malım?
Şah ona der: – Ey sitəm rəsidə,
Ol qüssəvü qəmdən aramidə.
Yanında duran sənin həkimin,
Şahənşahidir bu sərzəminin.
Müjdə sənə tale etdi yari,
Yetirdi sənə bu qəmgüsari.
Ta ola dəvasidən fərağın,
Səhhət bula zəxmi-dərdü dağın.
Qoyduqda qədəm dəri-şəfayə,
Döndərdikdə qəfa cəfayə,
Yenlə sənə mayəvü bəzaət,
Verim durub eyləgil ticarət.
Gər meyli-hümayın, ey yeganə,
Sayə salsa bu üstixanə,
Əglənməgə olsa xatirin ram,
Hər nə diləsən qılam sərəncam.

Cərrah gəlib o yarələrin,
Tikdi bağladı parələrin.
Çün şəh ona verdi istimalət,
Bir neçə gün eylədi iqamət.
Ta görə məalın ol əlilin,
Həm səhhətini o qalü qilin.
Zira ki, şahi-cəhan mükərrər,
Göndərmişdi o cəmə ləşkər.
Ta dəf edələr o səddi-rahi,
Olmuşdu səfinələr təbahi.
Beş yüz kişi eylədi rəvanə,
Hər birisi Rüstəmi-zəmanə.
Ta anlıyalar həqiqəti-kar,
Ol xosrovi edələr xəbərdar.
İlqar ilə yol kəsib o ləşkər,
Zəngiləri gördülər sərasər.
Yatır qamusi qətilü məcruh,
Var bir-ikidə bəqiyeyi-ruh.
İstəşdilər ol ikidən əhval,
Dedilər ola həqiqəti-hal.
Filhal o qövmi-bərgüzidə,
Qayıtdı geri çü nuri-didə.
Ol sərvəri qıldılar xəbərdar,
Şah anladı doğrudur o köftar.
Birinə yüz artdı etiqadi,
Buyurdu yığın büsati-şadi.
Bir təxti-rəvanə ol həzini,
Məcruhi şikəstəvü qəmini.
Saldılarü oldular səbüxiz,
Ta şəhrə anı yetirdilər tiz.
Xurşid çü doğdu bargahə,
Bir bürc mürəttəb etdi mahə.
Olsa nə mərəzin ehtiyaci,
Hər nə diləsə anın məzaci,
Cənnət kimi cümləsi mühəyya.
Asudədil anda yatdı Vərqa.
Hazir yanidə həkimi-haziq,
Ta kim düzə şərbəti-müvafiq.

## DUYULMAQDIR BU, VƏRQA ŞƏH YETİRMƏKDİR ANI YARƏ

Gülşa ki, eşitdi ol məqali,
Təğyir ona oldu vəzi-hali.
Şah der ona: – Söyləgil həqiqət,
Döndərmə du rahdən təriqət.
Təğyirinə qıldı rəngü ruyin,
Qalmadı əvvəlki abi-cuyin.
Gülşa dedi: – Ey qəmimdə qəmxar,
Doğru deməgimdən özgə nəm var?!
Ol gün ki, yox idi aşinayi,
Sidqim qıldı girehgüşayi.
Hala ki, şəfəqqətin açıb kax,
Qılmış məni həzrətində küstax.
Vəchi budur olmağım müşəvvəş,
Şövq urdu mətayi-canə atəş.
Ta açdı ağız bu dudi-nili,
Oldu mənə atəşin dəlili.
Həqqa ki, bu sərvü zaği-bustan,
Der ki, açılıb güli-gülistan.
Hasil bu hədisi tərcümanın,
Məhzi sözüdür o novcəvanın.
Belə anlar məni-giriftar,
Vərqanındır yəqin bu göftar.
Zira ki, o filsufi-miknət,
Göftari durur təmam hikmət.
Gizlidir anın sözündə məzmun,
Hər fəqrə sözü kitabi-qanun.
Şəh der ona: – Ey nihali-heyrət,
Vey qönçeyi-şaxsari-həsrət!
Söylə nədir ol məlik nişani?
Ta tanıya kişi görsə ani.
Dedi ona: – Ey şəhi-fələktəxt!
İqbal ola yarü yavərin bəxt!
Məşhur durur anın cəmali,
Müstəsnidürür o qədri-ali,

Qəddindən əlif dönüb hilalə.
Rəşki-qaşi xəm verib hilalə.
Ol arizidən açanda pərdə,
Salmış güli-surini nəvərdə.
Nərgis çü gözündən anladı raz,
Qaldı baxa didəvü dəhən baz.
Ta ağzidən aldı qönçə məzmun,
Şərməndə aça dəhani-pürxun.
Ta qəbğəbinə yetişdi rahi,
Sib eylədi rəng ruyi-kahi.
Üç danə sepənd olub sepəndi,
Vermişdir olarə ərcüməndi.
Ta bağlana çeşmi-bəd xəyalə,
Salmışdır ol atəşi cəmalə.
Dutmuş hərə biri bir məqami,
Bulmuş ol aradə ehtirami.
Pişanisidə biri dutub xu,
Çün mərkəzi-xakə qütri-hindu.
Dutmuş ol ikisi cay üzündə,
Şəqqülqəmər olmuş ay üzündə.
Şəh hər nə ki, dedi mihmani,
Bildi o qəribdə var ani.
Qılmadı səbüklük al giranqədr,
Tez olmadı zirdəsti-ol sədr.
Çağırdı rəvan o tərcümani,
Key susəni-baği-kamrani.
Dur getgilən ol figarə məndən,
Ərz eylə səlam o yarə məndən.
Degil ona, ey yetən qəramət,
Qılmış nə bəqiyyeyi-əmanət.
Yetir yerinə ol ərməğani,
Qıl bizə hesab olan ziyani.
Yox səndə bu yüzdə hiç təqsir,
Zahir qəmuyə nə qıldı təqdir?!
Həqqa ki, əbəsdir infialın,
Yığ başına dağılan xəyalın.
Ehsan sanıram məgər mən, ey yar,

Kim beyü şərabi ola düşvar.
Yox bizdə təvəqqiyi-təlafi,
Gəl vermə məzacə inhirafi.
Ta hal nə qıldı mizbanın,
Şərməndəsi olasan sən anın?!
Bizdən sənə yetmədi bir ehsan,
Kim ola təbiətin hərasan.
Şəh sözü yetirməmiş təmamə,
Kim getdivü gəldi ol Hümamə.
Ağzında hənuz qilü qali,
Xurşidə yetirdi ol hilali.
Şah ol üzügə qılıb təmaşa,
Gördü ona nəqş nami-Gülşa.
Gülşayə dedi: – Bu ərməğani,
Al ki, ana göndəripdir ani.
Gülşa çü ona nəzarə qıldı,
Can rəxtini parə-parə qıldı.
Yıxıldı vida edib şüurə,
Bir mərtəbəsin yetirdi nurə.
Əhli-hərəm etdilər müdava,
Ta oldu şüur yari-Gülşa.
Çün gəldi özünə ol məhi-bədr,
Dedi ona: – Ey şəhi-mələk qədr.
Həqqa bu igit həmən cəvandır,
Kim dərdimə dərdi-tov əmandır.
Məqsuddur ol cəvan nə qasid?
Bu aradadür mətayi-kasid.
Yoxdur mənim əldə iqtidarım,
Ta eyləyə nolsa ixtiyarım,
Mən acizədir sənin fəqirin,
Nə nə, qələtəm sənin əsirin,
Bu babdə vardır ixtiyarın,
Qalmışdır əgər olan qərarın.
Göstər yenə şiveyi-mürüvvət,
Ehsanü tələttüfü fütüvvət.
Gər olsa qərar məhzi-göftar.
Olmasa o bişrə məğzi-kirdar.

Kim qadirdir ki, edə izhar.
Ol iqrarə nədir bu inkar?!
Qeyrət odu saldı şahi cuşə,
Əvvəldə rəfiq edib xüruşə.
Der: – Səhl ola çəkdigim xəsarət,
Əmma kola rəxti-irz qarət.
Kim övrətini verə cüdayə?!
Lən edə cəhan o kədxudayə!
Təxsis mənim bir özgə adım,
Var cümlə mülukə izdiyadım.
Nagəh mənə xiffət ola hasil,
Yek döndərəm ol qərardən dil,
Zur eylədi amili-şəriət,
Dedi ona: – Ey dutan təriqət,
Şər allaha di bumudur ayin?!
Gör nə buyurur əlindəki din?!
Dəm urma dəxi mürüvvətidən,
Ehsan dəmi ol fütüvvətidən,
Bir övrətin olsa əqdi batil,
Saxlamağından sənə nə hasil?!
Acın ola qarşısında nemət,
Yeməməgidir kəmali-həsrət.
Bu dünyaya saxlamaq əzabi,
Baqidir ol axirət iqabi.
Kim zülm ilə bir fəqir malın,
Alıb başa artırıb vəbalın?!
Əmma ona eyləyib təvəqqüf,
Versən ki, vəbaldir təsərrüf.
Kimdə ola əqlidin nəsibə,
Uyarmı munun kimi firibə?
Ol amili-əmrü nəhyi-Quran,
Dedi-ona: – Ey güzini-dövran,
Bir kişiyə kim xuda olur yar,
Bağlanır ona zəbani-inkar.
Yol göstərdi şahə süruşi,
Hər babdə huşi-eybpuşi.
Dil açdı şəhi-xücəstəkirdar,

Gülşayə dedi ki, ey diləfgar,
Yox Tanrı içün xilaf özümdə,
Təğyirqərar olan sözümdə.
Mən məhzi-mürüvvətü vəfayəm,
Eyni-kərəmü rüxi-ətayəm.
Bu əmri-məhalə salma xatir,
Olmaz məndən xilaf zahir.
Getdim ki, görəm o novcəvani,
Kimdir qılayım müşəxxəs ani.
Mətlubindir əgər o məcruh,
Mətlubimdir o mayeyi-ruh.
Çün yetirə ol sənə qərabət,
Rəf ola bəhaneyi-məhabət.
İltəm anı bu hərəmsərayə,
Kim xas olub durur sən ayə.
Ol bülbülü yetirəm bu bağə,
Pərvanəni tapşıram çırağə.
Muni deyib ol cəhani vayə,
Vərqa tərəfinə saldı sayə.
Çün gördü o sərvi-bustani,
Var bir-bir eşitdigi nişani.
Bildi ki, degil məgər ki, Vərqa,
Ol şiri-ərini-ruzi-heyca.
Dedi ona: – Ey cəhani təmkin,
Üşşaqə degil bumudur ayin?!
Yar ilə duta təriqi-əğyar,
Bir ola yanında qeyr ilə yar?
Pünhan raz eyləmək rəvadır,
Əmma ki, həbibdən xətadır.
Lazım deyə yar dərdi yarə,
Şayəd ki, bula o dərdə çarə.
Vərqa dedi: – Ey hümayi-sayə,
Sayən mənə verdi incə vayə.
Kim qıldı məni şəhə nəsiri,
Ehsan baranı, zilli-xeyri.
Var idi əvəldə ehtiyatım,
Ta sınmıya sağəri-nişatım.

Nəqdini güm eyləmişdi mədən,
Fərq eyləməz idi dustü düşmən.
Lütfün məni çəkdi yenlə barə,
Ol bardə düzdü sər qətarə.
Hala ki, əlindədir məharım,
Yox dəxi mənim bir ixtiyarım.
Vərqa mənəm, ey dil aşinasi,
Bu xaneyi-dərd kədxudasi.
Əmma sənə rövşən ola, ey şah,
Yox bir qərəzim bu yolda həmrah.
İlla yazıla adım vəfadə,
Çün sabit ola rəhi-cəfadə.
Lütfün ilə çün sağaldı yarə,
Gəldi yenə ab ruyi-karə.
Həm lütf ilə, rüxsət eylə həmrah.
Durub gerü qayıdam mən, ey şah.
Ta qayim ola bədəndə canım,
Məddah ola tutiyi-rəvanım.
Eh mən sənə əbdi-zərxəridə,
Xiclətzədə bəsdir açə didə.
Ta hal ki, gizli idi razım,
Səbr idi bu işdə çarə sazım.
Daim sağ olgilən səlamət,
Xiffət sənədir, mənə iqamət.
Layiq görünür bu qədrü şanə,
Rüxsət verəsən bu mihmanə.
Bəsdir munu biləvüz mənü sən,
Gəl açma təriqi-amə rövzən.
Şəh der ona: – Ey xücəstə kirdar,
De bu necə sözdür etdin izhar?
Səndən bizə yox küdurəti-dil,
Külfət ola durmağında hasil.
Ol gün ki, mənə yetişdi yarın,
Şərh etdi qəmu nə hali-zarın,
Çün mən o xəbərdən oldum agah,
Qıldım ona dəsti-meyl kutah,

Salim saxlanmış ol əmanət,
Bağlanmış ona rəhi-xəyanət.
Əhd eyləmiş idim, ey niku nam,
Görsəm sənə tapşıram durub cam.
Ol gül qoyalı qədəm bu bağə,
Zinət verəli bu bağü rağə.
Alınmamış ol gülün gülabi,
Ol qönçə buraxmamış niqabi.
Bülbül ona olmamış bərabər,
Od kimsəyə verməmiş ol əxgər.
Yalqızdır anın hərəmsərasi,
Ammadə yanında müddəasi.
Bu ürfidə dəbdir həmişə,
Məhrəm ola cümlə xiş-xişə.
Məsmu degildir, ey yeganə,
Bu babdə qılmağın bəhanə.
Atan tərk etdi gər bu baği,
Mən atanam, ey gözüm çırağı.
Atayə nə şivə ola adət,
Məndən gələ felə ol fərağət.
Hər nə ki, dedim rəhi-vəfadə,
İnşiallah olur ziyadə.
Hər babdə kəsdi üzrin anın,
Könlün ələ aldı ol cəvanın.
Həmmamə apardı ol əkabir,
Geydirdi ona xəllayi-faxir.
Aldı gedib ol hərəmsərayə,
Xurşidi müqarin etdi ayə.
Çün ol iki nov nihali-həsrət
Bir-birini gördügündə heyrət,
Zur etdi ol iki dərdnakə,
Filhal oları buraxdı xakə.
Şəh qıldı sədaqət aşkara,
Dil rəftələrə qılıb müdava.
Qansısı göz açdı gördü yarın,
Qoydu yerə rəxti-ixtiyarın.

Bir gün, bir gecə ol iki zar,
Bir-birə baxıb olurdu əfgar.
Axir yetişib qərari-xatir,
Oldu olara şüur zahir.
Çün badeyi-əql doldu camə,
Bülbül gül ilə gəlib kəlamə,
Bir-birinə dəhri-dun bəlasın,
Xar azarın, xəzan cəfasın,
Şərh eylədilər nəqirü qətmir,
Kim netmiş olarə dəsti-təzvir.
Hər bir gördükdə mihmanın,
Saldı özgə sərgüzəşti-xanın.
Gördükdə olar o mahizərni,
Bildiləri duydular xəbərni.
Hər bir-birini görüb vəfadə,
Öz qıldığı dəvidən ziyadə.
Xursənd olub ol iki vəfadar,
Hər bir qəminə bir oldu qəmxar.
Valeh o muna, bu ona heyran,
Qalib o muna, bu onadır can.
Əsbabi-nişatü eyş hazir,
Asudə mücavirü müsafir,
Qırx gün, qırx gecə qıldı söhbət,
Bir-biri ilə o həmməhəbbət.
Gəh-gah şəhi-həşəm sitarə,
Pünhan olara qılar nəzarə.
Ta kim görə ol iki hicazi,
Bir-biri ilə qılanda bazi,
Baz ol kəbkə açarmı çəngal?
Ya kəbk bu bazə sındırar bal?
Gördü ki, ol iki pak kirdar,
Bir-birə qılar həqiqət izhar.
Bağlı olara dəri-məcazi,
Səccadələri durur nəmazi.
Birdir olara hüzurü qeybət.
Qət etdi buşivə rahi-reybət.

## EŞİTMƏKDİR BU, MÖHSÜN ŞAHÜ GÜLŞA FÖVTİ-VƏRQANİ

Olduqda təmam o şüğli-cansuz,
Ol qövm dağıldı. Qaldı Bəhruz.
Qayıtdı geri pəs ola vəfadar.
Ta xosrovi eyləyə xəbərdar.
Saldı özünü sərayi-xasə,
Düşdükdə qəbuli-ixtisasə.
Ləb açdı ki, şah ola səlamət,
Vərqayə yetişdi bu qəramət.
Şahiddir əlimdə atü taci.
Ta kim ola sidqimin rəvaci.
Eşitdi muni çü ol güzidə,
Bil eyni-cəhanə nuri-didə.
İstərdi edə nihan o razi,
Xali qıla sövtdin o sazi.
Tışra çıxıban nə gördü ol şah,
Məmlu durur ol xəbərdən əfvah.
Mümkün degil etmək ani pünhan,
Qayıtdı hərimə gördü canan,
Olmuş agah bu xəbərdən,
Yandırmış özünü ol şərərdən.
Etmiş duruban siyəh libasın,
Əhya qılıban rüsumi-yasın.
Urmuş qəmu cins səbrə atəş,
Atəşsifət ol aradə, sərkəş,
Qılmış bitab, çak sinə,
Açılmış üzə dəri-dəfinə.
Ol çakdə sinəsi nümayan,
Çün zülmət içində abi-heyvan.
Rəh açmış o çeşmeyi-həyatə,
Qan qatmış o qənd ilə nəbatə.
Yox, parə qıdıb o cibi-həsrət,
Açmış rüxi-xasə babi-cənnət.
Xali olmuş gülabdən gül,

Zahir ona zəxmi-çəngi-bülbül.
Dökmüş, urmuş nəmək kababə,
Seyl ilə kələf o mahtabə.
Açmış başı, zülf edib pərişan,
Dökmüş gülə dəstə-dəstə reyhan.
Əzbəs yüzə urmuş idi seyli,
Nə yüz əli olmuş idi neyli.
Qan mövcinə qərq olub gülüstan,
Xali sünbüldən ona bustan.
Saçmış başa xakü xakə məcər,
Urmuş kani-əqiqə səd cər.
Yolmuş müjəsin o laübali,
Qalmış hinduyə kişi-xali.
Etmiş duruban siyəh libasi,
Əhya qılıban rüsumi-yasi.
Başı açıqü saçı müşəvvəş,
Almaz gözə kimsəni o məhvəş.
Saat-saat gedər özündən,
Yoxdur xəbəri özü sözündən.
Gördü çü şəhi-xücəstə kirdar,
Gülşayə olundu kari-düşvar.
Olmaz mən ilə ol təsəlli,
Əlhəqq mənin degil məhəlli.
Oldu ona yar ol əzadə,
Qəmxarlıq etdi ol bəladə.
Bir gün, iki gün bu rəsmə ol şah,
Ol dərkəş ilə oldu həmrah.
Şəh anladı ol əzarəsidə,
Heç növ ilə olmaz arəmidə.
Fikr etdi aparsa ol fikari,
Görsətsə ona məzari-yari,
Bir neçə gün etsə anda muyə,
Təğyir verə bu rəngü buyə.
Əmr eylədi ol şəhi-cəvanbəxt,
Vərqa qəbirinə nəql edin təxt.
Gedib verəm anda aşü abin.
Qəbrin düzübən yığam tərabin.

Ol şüğl yetişdi ehtimamə,
Pəs qıldı səla xəvasü amə.
Atlandı şəhü təmam ləşkər,
Həmrah olub əhli-şəhr əksər.

## BUDUR, GÜLŞA ÖZÜN QILMAQ MƏZARİYAR QURBANİ

Bir hudəci-dərd içində Gülşa,
Dutmuşdu o tale ilə qovğa.
Nə səbr əlində, nə qərari,
Var idi könüldə iztirari.
Ola yetişə məzari-yarə,
Qurban qıla öznü ol məzarə.
Yetişdikidə o sərzəminə,
Pəs eylədi iltimas əminə.
Ümmid budur ki, şahi-aləm,
Rüxsət verə kim bulardan əqdəm.
Yalquz gedəm ol səri-məzarə,
Dərdi-dil edəm məzari-yarə.
Bu zümrəyədir təriqi-adət,
Yığlamaq içün məzari-xəlvət.
Şəh verdi rizavü getdi ol yar,
Ta mərqədi-yarə yetdi ol zar.
Çün düşdü gözü məzari-yarə,
Zur eylədi şövq o dilfigarə.
Qoydu gerü bir kənarə səbri.
Düşdüvü qucaqladi o qəbri.
Yüz qoydu o xakə, qıldı avaz,
Çağırdı ki, ey mənimlə həmraz.
Həmrahlığın bu idi ey yar,
Kim qılmıyasan məni xəbərdar.
Səbr eyləmədin bu suzü dağə,
Çəkdin özün güşeyi-fərağə.
Qurtardın özün qəmü ələmdən,
Peyvəstə bu dəhr edən sitəmdən.

Rəhm eyləmədin bu dilkəbabə,
Getdin məni saldın iztirabə.
Sağınmagil, ey mənə olan can,
Canə verəm imtidadi-hicran.
Dil nəqdini gör bu xaksarın,
Filhal necə qılar nisarın.
Əl vermədi munda çün vüsalın,
Bari bula anda iqtisalın.
Eşq içrə, bəgim, bu narəvadır,
Bil aşiqə qayəti-xətadır.
Bir yar çəkə özün bəqayə,
Bir getmiyə aldana fənayə,
Baş qövza olam səninlə həmduş,
Yetişdi ərus açgil ağuş
Muni deyib ol büti-səmənbər,
Çün səbzə özünə çəkdi xəncər.
Nəsb eylədi dəstəsin məzarə,
Növkini o sineyi-figarə.
Bir zövq ilə açdı qəbrə ağuş,
Ta qəbrə olunduğunda sərpuş.
Tən lövh oldu rüxi-məzarə,
Ruh oldu qərin ruhi-yarə.
Mərdanə əgərçi qıydı canə,
Yetişdi vüsali-cavidanə.
Gər desə biri degil müvafiq,
Şər içidə bu ədayi-aşiq,
Öz nəfsinə qəsd narəvadır?!
Gər olsa cəhan-cəhan xətadır.
Söylə zahir durur bu məzmun?
Mərfu durur vəbali-Məcnun.
Hər fərqə ki, eşq saldı sayə,
Hər frdə ki, şövq yazdı ayə,
Uymaz dəxi əql edən füsunə,
Axir məşhur olur cününə.
Heç kimsənə olmadı xəbərdar,
Kim netdi özünə ol diləfgar.
Şah gəldivü düşdü bargahə,

Yer verdi o şəhrivü sipahə.
Göndərdi rəvan bir-iki məhrəm,
Ta kim olalar o yarə həmdəm.
Gəldilərü gördilər rəvani,
Ölmüş, yatır anda canfədani.
Almış anı zəxmi-növki-xunxar,
Bərgi-gülü necə kim dələr xar.
Agah qılıb şəhi-cəhani,
Ərz eylədilər o macərani.
Şahın oldu siyah ruzi,
Birinə yüz artdı, döndü süzi,
Heyrət ani saldı iztirabə,
Dil atəşə verdi, didə abə.
Çox yığladı, qıldı ahü nalə.
Heyran qalıban o vəzü halə.
Yandırdı cigər o macərayə,
Rəxt etdi siyəh, girib əzayə.
Qüssalə gəlib yudu o mahi,
Olduqda təmam o dəstgahi.
Əmr eylədi ol şəhi-vəfadar,
Açdılar o qəbri-aşiqi-zar.
Ol mərqədə qoydular həm ani,
Gəl gör bu cəhani-bivəfani.
Ta qılmadı xak olarə sərpuş,
Öldürmədi, qılmadı həmağuş.
Həmxabə olundu yar yarə,
Bu qəmli yetişdi qəmküsarə.
Şəh verdi oların abü aşın,
Hər miskinin düzüb məaşın.

## MÜCAVİR OLMAĞIDIR BU ŞƏHİN OL MƏRQƏDİ-PAKƏ

Çün oldu bəhar aləmaray,
Ruyi-çəmən oldu behcətəfzay.
Pəs çıxdı o qəbr sinəsindən,
Zahir oluban dəfinəsindən.

Baş çəkdi iki nihali-həmbər,
Biri sərv, biri sənubər.
Çıxdıqda iki nihali-məruf,
Hər bir olmuş birinə məlfuf.
Şəh bağlıyıb anlara iradət,
Edərdi gəhi gəlib ziyarət.
Axir muna düşdü rayi-şahi,
Ol məşhədi edə təxtgahi.
Çün şah o məkanə saldı sayə,
Sayə o zəminə verdi vayə.
Ol şəhr əhli gəlib təmami,
Bay ilə fəqirü xasü ami.
Görmüşlər idi çü rahəti-dil,
Cümlə ol aradə dutdu mənzil.
Şəh hər kişinin görürdü şanın,
Şanə görə mülkdin nişanın.
Yazdırıb edərdi ona təslim,
Təslim ilə göstərirdi təkrim.
Verib ona məune imarət,
Bu rəsmə edərdi ol riayət.
Gördükdə şəhin təfəqqüdatın,
Xas ilə əvamə iltifatın,
Doldu ev ilə o dəştü səhra,
Bir şəhri-əzim olundu peyda.
Əlqissə, o Məşhədi-münəvvər,
Hacətgəhi-aləm oldu əksər.
Zira kişi bulduğu muradın,
Artırdı xəlayiq etiqadın.
Şah olmadığı vəfadə qasir,
Qıldı o məzarə kalmücavir.
Açdı üzünə dəri-mübərrat,
Hər gün qılar idi tazə xeyrat.
Bu rəsmə keçirdi ol mədari,
Ta axıra yetdi ruzgari.
Tərk etmədi vəz ol əhli-təmkin,
Təhsin ona, səd həzar təhsin.

# SAİB TƏBRİZİ

*Məhəmmədəli Saib Təbrizi 1601-ci ildə Təbrizdə doğulmuşdur. Atası Mirzə Əbdürrəhim ticarətlə məşğul olub. Oğluna mükəmməl təhsil verə bilib.*

*Saibin ailəsi I Şah Abbasın (1587-1629) əmri ilə Təbrizdən İsfəhana köçürülüb. O, şərqin bir sıra ölkələrini səyahətə çıxıb. II Şah Abbasın dövründə (1642-1666) Məliküş-şüəra təyin edilib.*

*Saib Təbrizinin zəngin ədəbi irsi yaşadığı dövrdən indiyə qədər Şərq poetik fikrini özünə cəlb edir. O, Şərq poeziyasının bir çox janrlarından böyük ustalıqla istifadə edərək öz dövrünün sənət yolunu istiqamətləndirə bilmiş, "İsfahan səbki" nin ədəbi üslub kimi formalaşıb inkişaf etməsində böyük xidmətlər göstərmişdir.*

*Şərqin bir çox mədəni və ticarət mərkəzlərinə səfər edən Saib yaşadığı dövrün ictimai-sosial vəziyyəti ilə yaxından tanış olur, əsərlərində həyatın bütün incəliklərini qavrayaraq böyük sənətkar kimi ədəbiyyatda yeni söz söyləmək, özünəməxsus orijinal üslub yaratmaq kimi nəcib xüsusiyyətləri özünün yaradıcılıq yolu seçmişdir.*

## AZƏRBAYCANCA ŞEİRLƏRİ

Ürəyin sirrini o qan axıdan gözlər açar,
Hər evə baxmaq içün ya baca, ya pəncərə var.
Arif insan hara getsə, qayıdar tez vətənə,
Şam da bir yerdə yanar, şöləsi ətrafa uçar.
Dünyanı qaydaya salmaq elə asan da deyil,
Sanki nadan bir adam mıx götürüb nalı yazar.
Kim yetişsə kamala, o ucalar ərşə qədər,
Sünbülə döndümü dən, yığ, onu xırmana apar.
Göz yaşı pak eləyir sinədən həsrət tozunu,
Ətək ilə silinən aynada heç tozmu qalar?
Sordu xalqın qanını zalım adamlar zəli tək,
Təşnə insan yuxuda hey suyun ardınca qaçar.
Eşqin ilk şərti budur, Saib, özündən keçəsən,
Kim özündən keçəcək, o tapacaq burda qərar.

* * *

Nə ehtiyac ki, saqi verə şərab sənə –
Ki, öz piyaləsini verdi afitab sənə.
Şərab ləli içün tökmə abiru zinhar –
Ki, dəmbədəm ləbi-ləlini verir şərab sənə.
Əgər urum daşa peymanəni keçir, saqi,
Şərabidən neçə göz tiksə hər hübab sənə.
Qurutma tərli üzarın içində badeyi-nab –
Ki, gül kimi yaraşır cöhreyi-pürab sənə.
Şərabidən nə əcəb olmusan əgər sərxoş?
Bu duzlu ləblər ilən neyləsin şərab sənə?!
Bu atəşin yüz ilən kim tutar sənin ətəgin,
Həlal elər qanını ta yetər kəbab sənə.
Dedim çığarə səni xət hicabından qafil –
Ki, ol qübar olur pərdeyi-hicab sənə.
Sənin səhifei-hüsnün kəlam Saibdir –
Ki, daği-eyb olur xali-intixab sənə.

* * *

Aşiqin göz yaşına rəhm eyləməz ol afitab,
Yığlımaq ilə aparmaz od əlindən can kəbab.
Baş verəndə xəncəri-sirabına yetməz mənə,
Gərçi sanır özünü başdan keçənlərdən hübab.
İçdi qanlar ol sitəmgər ta kəbab etdi məni,
Çəkdi oddan intiqamın dönə-dönə bu kəbab.
Xak oldum ol kəman əbru oxun seyd etməgə,
Bilmədim gül yayidən düşməz yerə tiri-şəhab.
Gər tutuşsa atəşi-rüxsaridən yerindədir,
Eyləsin aşiqlər ilə necə yüzsizlik niqab.
Şəfqət ilən bir kərə başın götür torpaqidən
Necə yolunda şəfəqdən tərləsin qan afitab.
Fariğəm sangi-məlamət içrə cori-çərxidən,
Neyləsin göhərdə olan suya moci-inqilab.
Əql-eşq etmək söz ilən səhlü asan görünür,
Baş ağardı nafə tək, ta qanın etdi mişknab.

Sanmiya hər kim fəna dünyada möcud özünü,
Daxili cənnət olur məhşərdə Saib, bihesab.

* * *

Eldən çıxaram zülfi-pərişanını görgəc,
İşdən gedərəm sərvi-xuramanını görgəc.
Susuzlara gər can axıdır çeşmeyi-heyvan,
Mən can verərəm çeşmeyi-heyvanını görgəc.
Gər bağlamısan el gözünü şərmi-üzarın,
Candan kəsilir xəncəri-müjganını görgəc.
Reyhan ki, nəzakət tökülürdü qələmindən,
Xət tirə çəkər zülfi-pərişanını görgəc.
Bülbül ki, gülün ləli-ləbindən söz alırdı,
Dili dolaşır qönçei-xəndanını görgəc.
Rizvan ki, behiştin yemişi gözünə gəlməz,
Dişlər əlini sibi-zənəxdanını görgəc.
Yerdən xəti-reyhan vərəqin pak silibdir,
Nəqqaşi-gülüstan, xəti-reyhanını görgəc.
Gülrəngi alır sübh iki xali-tərindən,
Xürşidi-üzar möhriqi-əfşanını görgəc.
Müjgani alıb qanlı yaşından rəgi-yaqut,
Saib ləbi-ləli göhər əfşanını görgəc.

* * *

Olmadı xürşididən dağlarda rəngin qaşlar,
Gördülər ləli-ləbin qan, tərlədilər daşlar.
Qıldı peyda hökmi-təqvimi-kühən gül dəftəri,
Açdılar ta cöhreyi-dildarımı nəqqaşlar.
Qılmadılar sinei-əfkarımı amacgah,
Əksik etdilər bizimlən ol müqəvvəs qaşlar.
Aşiqi-sadiq bilir səngi-məlamət qədrini,
Məxzəni-sultana layiqdir bu yarar daşlar.
Günü gündən el dedim tərk etməsin yoldaşlığı.
Çün qara oldu günüm, yad oldular qardaşlar.
Yol əgər haqdır, çəkər yolsuzdan axır intiqam,

Elə tapşır, çıxdılar yoldan əgər yoldaşlar.
Oldu məğlubi-həvai-nəfsi-istilai-əql,
Aldılar hakim əlindən ixtiyar ovbaşlar.
Çün könül binur olub mütləq ənan alır həvəs.
Qaş qaralanda çıxarlar yuvadan xəffaşlar,
Mehriban olmaz nəsimi-sübhdəm hərgiz sənə,
Şəm tək ta tökməsəm Saib, gözündən yaşlar.
Aşiq qanını vəsməli qaşın nihan içər,
Cövhərli tiğ qınara peyvəstə qan içər.
Etdikcə qan könülləri ol ləli-atəşin,
Abi-həyat təq qara zülfün rəvan içər.
Ta bir piyalə verdi, kəbab etdi bağrımı,
Hər kim anın əlindən içər badə, qan içər.
İllər yaşar Xızr kimi hər kim ki, gecələr,
Gülüzlü yar ilən meyi çün ərğavan içər.
Adəm nədir ki, içməsin ol verdigin şərab,
Versən əgər firiştə meyi bigüman içər.
Saqi mənimlə şişeyi-peymanə neyləsin,
Dəryani bir nəfəsdə bu rigi-rəvan içər.
Tezraq çəkər nədamətə bədməstlik yolu,
Hər kim ki, yaxşı içsə şərabi-yaman içər.
Saib ki, mən anın sözünü yerə salmadım,
Bilməm niçün mənim qanımı asiman içər.

* * *

Gül kimi hər kim ki, gülzar içrə nəqd canı var,
Səyilə töksün sənin yoluna ta imkanı var.
Ta ayağın torpağına tökməsi tutmaz qərar,
Hər kimin məclisdə mina tək bir ovuc qanı var,
Nə əcəb aşiqləri gər başdan açsın naz ilə,
Kakili-mişgin kimi hər kim ki, sərgərdanı var.
Eyləyibdir nöqteyi-xalın məni pərkarsız,
Yoxsa dərya üzrə hər bir qətrənin dövranı var.
Gəzdirərlər əlbəəl dağın könüllər parəsi,
Yerdə qalmaz cam tək hər kim ki, isti qanı var.
Puçdu hər söz ki, deyərlər mərifətdən əhli-qal,

Bəhrdən çıxmaz sədəf ta gövhəri-qəltanı var.
Çox degil heyrət yeri gər varsa şirin sözləri,
Tutinin, Saib, nəzərdə güzgi tək meydanı var.

* * *

Məni məhrum edən rüxsaridən zülfi-pərişandır,
Bu dəryayi-lətafət mövci-ənbər içrə pünhandır.
Əgər xürşidi-taban ilə sənsiz həmşərab olsam,
Ləbi-ləli-meyaludi gözümğə qanlı peykandır.
Dədü dami müsəxxər eyləyibdir cəzbeyi-eşqin,
Dügün Məcnuni-şeyda başına çətri-Süleymandır.
Məni məkri-rəqib avarə qıldı yar kuyindən,
Çıxaran Adəmi firdosidən təzviri-şeytandır.
Qaçan aşiqlərin fikrinə düşdü ol əqiqi-ləb –
Ki, onun bir qara gözlülərindən abi-heyvandır.
Müsəlmanam, deyir məstin, içir aşiqlərin qanın,
Mənəm kafir, əgər ol düşməni-iman müsəlmandır.
Məhəbbət əhli rəngi-camu nişati-dərdidən dönməz,
Niçün çəksin xümar ol kim, həmişə içdigi qandır?
Məni-xaki nə tənha olmuşam Məcnun kimi rüsva –
Ki, ol dərddən fələk səngi-məlamət içrə pünhandır.
Fələklər qan içər gördükdə təcrid əhlini, Saib –
Ki, yuqsizlər, həramilər göziğə tiği-üryandır.

* * *

Çıxardı xətt, mənəm zülf mübtəlası hənuz,
Dügün sağaldıvü başımdadır qarası hənuz,
Xətin ğübari quyaşi əgərçi yaşurdi,
Gözümi xirə qılır yüziyin səfası hənuz.
Bahar yetdi də qanlar ki, tökdü gözlərdən,
Xəzan olanda nələr eyləsin cəfası hənuz.
Suvardılar qılıncla məgər gülüstanı –
Ki, bir-birinə qovuşmaz gülün yarası hənuz.
Həyat suyuna bir dağ qoydu rəşgi-ləbin –
Ki, keçdi ömri-əbəd, düşmədi qarası hənuz.

Mühiti-eşqara mən ol hübabi-bibakəm –
Ki, getdi başımü başımdadır həvası hənuz.
Vüsal ümidinə ömrün keçirdi kuyində,
Yetişməz işlərinə Saibin duası hənuz.

* * *

Tutulmuş könlümü cam ilə şadan eyləmək olmaz,
Əl ilən püstənin ağzını xəndan eyləmək olmaz.
Nə sözdür bu ki, olsun sahibnəzər zühhad,
Qara torpağı hərgiz abi-heyvan eyləmək olmaz.
Bulut qılan kimi cövlan urar da ildırım tiği,
Könül pərdələrində eşqi pünhan eyləmək olmaz.
Qılıc gər içsə aləm qanının sirablıq bilməz,
Səni üşşaq qətlindən peşiman eyləmək olmaz.
Mənim göz yaşımı çıxgil fələklərdən tamaşa qıl,
Hübabi qəsrlər içində tufan eyləmək olmaz.
Məni-Məcnuni aqil eyləmək mümkün degil, naseh,
Söz ilən müşgi-nabi, qan ki, bir qan eyləmək olmaz,
Xətadan keçdi ceyran qanını müşk eylədi Saib,
Demə, üsyanı taət, küfri iman eyləmək olmaz.

* * *

Meydan ol cöhreyi-ziba ərəqəfşan olmuş,
Ya sərasər göz olub yüzünə heyran olmuş?
Bu görən dairəni halə xəyal etmə ki, çərx
Ağzın açıb məhi-şəbgərdimə heyran olmuş.
Gözdən iraq ki, bu sultani-cünun şövkətdən,
Hər dügün başıma bir çətri-Süleyman olmuş.
Ləbi-ləlin cəmidən bəski udubdur qanlar,
Xubların daş yürəgi kani-bədəxşan olmuş.
Ta görübdür nəzərin var anilən, qaş yayı,
Gül yüzün cəm qılıb qönçeyi-peykan olmuş.
Saf edən də ləbi-canbəxşini dövran işidir,
Bir-iki qətrə damıb çeşmeyi-heyvan olmuş.
Rəhm qıl Saibə, saqi, mey ilən tut əlini,
Necə içsin qanını bu yürəgi qan olmuş?

* * *

Xəti-qübarın, arizin ayati-Quran eyləmiş,
Hüsni-sahib şövkətin muri-Süleyman eyləmiş.
Noqtei səhv eyləyibdir gözlərin ceyran gözün,
Qaşların bayram hilalın taqi-nisyan eyləmiş.
Azdırıbdır gül yüzün bülbülləri gülzardən,
Sünbülün, reyhan xətin torpağa yeksan eyləmiş.
Kəbəni bütxanə edibdir firəngi gözlərin,
Yer yüzün zünnar zülfün kafərstan eyləmiş.
Başını xəti-şüa ilən tutubdur afitab,
Ta mənim çapük səvarım zəmi-meydan eyləmiş.
Ləli-meykunin ki, içibdir bədəxşan qanını,
Qönçəni bülbül gözünə qanlı peykan eyləmiş.
İltifati-ləli-canbəxşin qara günlüləri,
Xəlq içində pərdədari-abi-heyvan eyləmiş.
Dərdi-eşqin çöhrei-zərrin ilən yer yüzünü,
Səfhei xurşidi-təban tək zərəfşan eyləmiş.
Moci-dəryayi-ehsanın tutubdur yer yüzün,
Şövqi-ruyin bu cahani şəhr-yunan eyləmiş.
Cilvei-badi-bahari-iltifatın gül kimi,
Könlümü min çak ilən dəsti-giriban eyləmiş.
Nə əcəb gər Saib ilən xəttini qıldım rəqəm,
Xəti-xalın böylə çox kafər müsəlman eyləmiş.

* * *

Ömr keçdi, səfər əsbabını amadə qılın,
Hər nə sizdən kəsə tiği-əcəl andan kəsilin.
Qülzümi-eşqidən, ey ayrı düşən həmdəmlər,
Düşmüşikən yola silabi-bahari yığılın.
Ta sizi dövri-zəman eyləməyibdir pamal,
Gün sarı şəbnəm güldükcə çəməndən çəkilin
Rolmayan çərxara pərvanə rəvandan ğafil,
Bu gül ilə qarani, güzgüləri saf eliyin.
Göy fəzası nə məqali-pəru bal açmaqdır,
Danei-nar kimi bir-birinizə qısılın.

Gər umarsız ki, cavanbəxt olasız axiri-ömr,
Qocalar qədrini, zinhar, ikilikdə bilin.
Artırır gərdi-məasini quru istəğfar,
Bu zəmingər tozunu əşki-nədamətlə silin.
Faş qılır xəm qocalar qamətini taətsiz,
Əkməmişkən sizi bu çərxi-müqəvvəs əkilin.
Tuta gər qönçə kimi çevrənizi nəştəri-xar,
Verməyin gül kimi əldən qədəhi-mey, içilin.
Kim ki sağər kimi ağzın açasız minanın,
Gülə-gülə kərəm ilə anı məmur qılın.
Badə, ney cuşi anın söz kəlamındadır,
Saibin qədrini, ey əhli-xərabat, bilin.

* * *

Tutma ol gül damənin məşhər günüdə can üçün,
Qılma yüzsüzlığ nigar ilən bir ovuc qan üçün.
Açmagil ağzın, görəndə xali mişgin danəsin,
Əkmə baş pərgar tək hər nöqtəyə dövran üçün.
Yoldaş oldur kim, qara günlərdə yoldan çıxmasın,
Keçmə yoldaşdan Xızır tək çeşmeyi-heyvan üçün.
Yengi ay başın əgər xürşidə ta olsun tamam,
Sadədil bilməz ki, bəslər özünü nöqsan üçün
Məşrəb üçün qoymagil, əldən ənani-ixtiyar,
Xamiliqdən atını öldürmə ki, meydan üçün.
Hüsn-cəlalından əl kəsməkdir arvadlar işi,
Keç özündən mərdilər tək Yusifi-Kənan üçün.
Minnət ilə dirilik, Saib, ölümdəndir betər,
Can verərlər əhli-qeyrət dərdi-bidərman üçün.
Məhi-şəbgərd əgər görsün anın xurşid rüxsarın,
Kəmənd eylər anı seyd etmək üçün halə zünnarın.
Şəkərxənd eyliyəndə neyləsin üşşaq ilən yari –
Ki, aci sözlərin verər ana ləli-şəkərbarın.
Deyirlər dərdmənd olan bilər həmdərd halını.
Yetişməz xəstələr halına neyçün çeşmi-bimarın?
Niçün məhv olmasın adəm anın seyranını görcək –
Ki, heyran oldurubdur vəhşətin gördükcə rəftarın.
Nə layiqdir ki, eşq əhli qıla qan içdigin zahir,

Niçün bülbül yaşırmaz el gözündən qanlu münqalın?
Süpehri-səngidil içrə mən ol Fərhad zəbərdəstəm –
Ki, abi-tişədən kani-zümrüd qıldı kuhsarın.
Məgər ol afitab ilən şəfəqgun mey içər Saib –
Ki, sərxoş mey çəkər yer üzrə hər gün sübhdəm sarın.

* * *

Saqiya, meydan rüfu qıl çak bolmuş könlümü,
Qıl yuvası qan ilən peyvənd yüzülmüş könlümü.
Qalmışam yerdə qanadsız quş təkin pərvazıdan,
Yola sal cami-şərab ilən büzülmüş könlümü.
Artır eylər badei-safi mənim viranlığım,
Dərd ilən təmir qıl, saqi, pozulmuş könlümü.
Zöhdidən qan quruyubdur bağrım içrə lalə tək,
Tazə qıl əski mey ilən bu qurumuş könlümü.
Cam urmaq rəsmidir saqi, tutulmuş ay üçün,
Seyqəli-cam ilə pərvaz et tutulmuş könlümü.
Eylə kim, Saib, qəmi-dövran tutubdur çevrəmi,
Seyri-gül mümkin degil açsın tutulmuş könlümü.

* * *

Biz nə imdi zərrə tək cövlanə gəlmişlərdənüz,
Afitabi-eşq ilən dövranə gəlmişlərdənüz.
Gün keçirməkdir hesabi-şahid əgrilik üçün,
Doğluğdan biz bu gün divanə gəlmişlərdənüz.
(Saya dur) barani-rəhmət gər qılıc kökdən yağar,
Qoç kimi qurban üçün meydanə gəlmişlərdənüz.

## QƏZƏLLƏR

Əzdikcə fələk, torpağa döndüm bu cahanda,
Yox özgə dənim mən üyüdəm bir daha onda.

Divar dibinə çəksə də yoxsulluğum ancaq,
Huma quşu dayəmdi mənim mən doğulanda.

Qəm dağı inan, qamətimi əydi kamantək,
Ancaq məni sındırmadı bir ləhzə boran da.

Dövran mənə nə verdi, nə geydirdi, soruşma,
Ruzum–qəzəbim, paltarım–eybimdi cahanda.

Dağ səbrim ilə uyğudayam dağ ətayində,
Xəncərlə ayırmaq bizi mümkünmü bir an da?!

Öz süfrəmə mehman oluram bəsdi mənimçün.
Göz dikmərəm özgə əlinə, qopsa tufan da.

Kam almasa da hər iki dünyada bu aşiq.
Qəlbi açılır yarı görüb heyran olanda.

Bir dürrəm, özüm, qiymətimi verməsələr də,
Aydındı mənə, yoxdu xiridar bu məkanda.

Mən ki, fələyə minnət ilə başımı əymərəm,
Əzsin nə olar, istəmərəm ondan aman da.

Zahirdə mənəm varlı ki, batində fəqirəm,
Qönçə kimiyəm paltarın altında qalanda.

Əlvan libasa yox həvəsim, Kəbə təkin mən,
Bəsdir dəyişəm paltarımı il qurtaranda.

Sayəmdə əgər şöhrətə çatmışsa bu xalqım,
Ruzum sümük olmuşdu humatək bu məkanda.

Saib, səni kim bağladı bu mülkə ki, qaldın?
İndi sənə zindandı bura, qal hələ yan da!

* * *

Demirəm səhradə bir rəhbərim yoxdu mənim,
Qanadımdan savayı bir hünərim yoxdu mənim.

Cigəri yanmış o qəvvas da mənəm, yox nəfəsim,
Dağdan özgə ürəyimdə gövhərim yoxdu mənim.

Neçə müddətdi axan qumlar olub həmsəfərim,
Gedirəm, mənzilim harda? Xəbərim yoxdu mənim.

İstərəm qəlbimə atəş yağa bu uçmaqdan,
Daşa dönmüş ürəyimdə şərərim yoxdu mənim.

Elə yüngüldü yüküm, Nuh məni almış gəmiyə,
Çör-çöpəm sanki, tufandan xəbərim yoxdu mənim.

Bənzərəm sərvə, baxarlar mənə heyran-heyran
Qəmdən özgə bu cahanda səmərim yoxdu mənim.

Sapı odlansa şamın od yeriyər qəlbinədək,
Axı pərvanəyə, yansan, zərərim yoxdu mənim.

Narahat qəlbim ilə hər gecə söhbət edirəm,
Ondan özgə nə edim, naməbərim yoxdu mənim.

İki dünyaya dəyər indi qulaq dincliyimiz,
Heç də qəmgin deyiləm, simuzərim yoxdu mənim.

Şam kimi istəmişəm ki, işığım pərvaz edə,
Heyf ola, uçmaq üçün balu pərim yoxdu mənim.

Əymişəm qönçə kimi başımı öz sinəmə mən,
Saib, ondan savayı özgə yerim yoxdu mənim.

* * *

Qəmi başdan aşanın olmaz ölümdən həzəri,
Qurumuş bir çəmənə ildırımın yox xətəri.

Qəlbinin yanmağını söyləmə, ey lalə mənə,
Qəlbi yanmışdan olar qəlbi yananın xəbəri.

Neməti əldə edər, kim buna səy etsə əgər,
Pərdədən də görəcək məşuqi aşiq nəzəri.

Ürəyi odlananın mütribi mənzildə olar,
Necə ki, od alışar, rəqs eləyər şöləleri.

Layiq olmaz hər adam gəzdirə eşqin dağını;
Qeyri aşiqlərə göstərməz üzün çün o pəri.

Nə qədər təqlid ilə eyni yolu getmək olar?
Quş təzə uçmağa başlarsa uzanmaz səfəri.

Od salar xırmanına bir gün o eşq sahibinin,
Saibin şölə çəkən qəlbinin ol zərrələri.

* * *

Asan da gəlməsin, ey ağciyər, şikar sənə,
Çətin başa gələcək axırı bu kar sənə.

Şiri şikara gedən çox zaman şikara dönüb,
Gər şikar olmamısan tale olub yar sənə.

Arif ol kəsdi ki, öz-özünü dərk eləyir,
Sahili yox bu dəniz heç verər kənar sənə?

Əlin ətəkdən uzun durmusan nahaq beləcə,
Nə ümmid eyləmisən yol verə hasar sənə!

İnanmıram ki, qiyamətdə də dura biləsən,
Nədəndi eyləməyir təsir heç bahar sənə?

Göyün sinəsini yüz parça etdi şimşəklər,
Bircə an gözlərini açmadın, nə var sənə!

Nədir bu kölgənin ardınca hey düşüb qaçmaq?
Bu sərva diqqət eylə sayəsi çatar sənə.

O daş ürəyin ilə çox da iftixar eləmə,
Fələk əzər o daşı bir divan tutar sənə.

Öz həddini aşanı bir gün endirər bu fələk,
Unutma həddini ta verməyə qərar sənə.

Ağıllı başlanan iş bil o vaxt çatır sona ki,
Gülür məhəbbət ilə onda ruzigar sənə.

Közərmiş ulduz ilə dağlı lalədən başqa,
De, indi hansı gülü bəxş edib bahar sənə?!

Nə yaxşı oldu ki, axır oyandın, Saib,
Axı bu daş yuxular az verib azar sənə?!

* * *

Yük etmə qəlbinə dərdin cahanın,
Quş asmaz hər budaqdan aşiyanın,

Yalandan çəkmə ah qorxa fələklər,
Əyilsə ox vuramı öz nişanın?

Sağalmaz Məcnunu zəncirləsən də,
Qəmi yox dalğadan çayda batanın.

Zamanı fəth elə odlu nəfəslə,
Belini odda əymişlər kamanın.

Gözəl güllər sifariş eyləmişlər,
Qırın sərhədini yazla xəzanın.

Sədəf tək ağzını pak eyləsən sən,
Udarsan gövhərini asimanın.

Zəhərdən qıl həzər, adət edərsən –
Zəhərlə məhv olar axırda canın.

Canın əldən gedir, bundan nə fayda,
Olar faydası hər dərdə davanın.

Vəzifə nərdivanilə ucalma,
Buz üstədir ayağı nərdivanın.

Göyün ki, qaməti qövsə dönübdür,
Çətindir düz gedə işi cahanın.

Axan göz yaşları bir gün sel olsa,
Yıxar qəflət evin olsun gümanın.

Sən öz xasiyyətinlə çox öyünmə,
Öyün ki, razı qaldı mehimanın.

Canı çox bəsləmə, ruha fikir ver,
Axı ayna gözüdür aynadanın.

Beyinsiz boş qəfəsdi dünya, Saib,
Sümüyü at, it olsun mehribanın.

* * *

Kim ki, varlandı, silindi xatirindən namımız,
Dövlətin artdı, unut dostu, budur əyyamımız.

Hər kəsin artar məqami çox yeyər öz qəlbini,
Özgə camlardan kiçik olsun bizim qoy camımız.

Saldı dərdə bu cəmiyyət incidilmiş qəlbimi,
O gümüş pullu balıqtək pullar oldu damımız.

Göz açınca gəldi, keçdi ömrümüz, çatdı sona,
Bir qığılcımtək bizim də yandı, söndü şamımız.

Sıxdı azad qəlbimi bu dünyanın gülşənləri,
Qumrunun o tar gözündə sərb olub əndamımız.

Yox müəllim dincliyi şagird əlindən heç zaman,
Zəhrə düşmüşdür həyat, çün hasil olmaz kamımız.

Arxamız səhradı, öndə yoxdu bir yol göstərən,
Cövri-dövrandan olub yüz parə qəlbi-xamımız.

Əldə lalə rəngli cam, Saib, özün də yoldasan,
Ta fələk dövran edir bil ki, dolanar camımız.

* * *

Nə qədər qında yatıb pas atacaq xəncərimiz?
Paltar altında zireh tək qalacaq cövhərimiz?

Axı səhrayi-qiyamətdə ki, bitmir lalə,
Orda bil, olmayacaqdır daha dərdi-sərimiz.

Zöhrə acizdi dönə ordumuzun dövrəsinə,
Canını məqsədi uğrunda verər ləşkərimiz.

Qanadı yanmış o pərvanəyə döndüm yenidən,
Alışıb yandı el uğrunda könül dəftərimiz.

Görmədim bir kəsi ki, ağlaya öz halımıza,
Öcgənin bəxti üçün dövr eləyir əxtərimiz.

Düşmən hər söhbətimizdən necə də kam götürür,
Başsızıq şam kimi, məclisdə hanı rəhbərimiz?

Arzumuz qəmli ürəkdə dolanıb aha dönür,
Şah damardan od alıb sanki yanır məcmərimiz.

Ağlayaq, ya da gülək, birdi bizimçün, Saib,
Göylərin şişəsini sındıracaq əllərimiz.

* * *

Olduq necə halın duyanı biz bu cahanın,
Bizdə görünür sirri-nihanı bu cahanın.

Əsrarını faş eyləmədi dünya, biz olduq –
Həm aynası, həm ayna tutanı bu cahanın.

Susduqda dönüb sir dolu gövhər oluruq biz,
Dindikdə bizik odlu bəyanı bu cahanın.

Torpağın ürək dağı kimi yazda göyərrik,
Üzdə olarıq fəsli-xəzanı bu cahanın.

Köhnə şərab ilə ürəyi nəşələnən pir –
Əslində bizik bəxti-cavanı bu cahanın.

Qətrə dəyişib gövhər olar söhbətimizdən,
Bir dürr kimiyik, şöhrəti-şanı bu cahanın.

Zəncirə salıbdır bizi ol ahu nəzərlər,
Divanəsiyik həm də ki, canı bu cahanın.

Düzlükdə bizi əldə əsa eylədi dövran,
Sonra əyərək etdi kəmanı bu cahanın.

Huşsuzluğumuz yadları qəlbən şad edibdir,
Yatdıq, yuxuda keçdi hər anı bu cahanın.

Karvanımızın zəngini əks eylədi səhra,
Bu ahı idi, həm də fəqanı bu cahanın.

Bizdə cəm olub sirri iki dünyanın ancaq,
Həm heyrətiyik, həm da gümanı bu cahanın.

Zahirdə əgər gözlərimiz pərdələnibsə,
Olduq gecə şamdanda yananı bu cahanın.

Saib, xəbərin yoxdumu bu məclisimizdə
Müşküldü ola dərdə qalanı bu cahanın.

* * *

O acı sözlərə səbr eyləyərək dözdüm mən,
Çün kamal əhli olan nakam olur, sezdim mən.

Hərzə söz söyləyənə yaxşı cavab susmaqdır,
Susaraq hay qoparan hərzə dili üzdüm mən.

Kama çatmaq diləyirsən, eli çatdır kamına,
Bunu gördüm, hara getdim, haranı gəzdim mən.

Od ilə sən mumu bir yerdə necə saxlayasan?!
Atəşimlə poladı mum kimi bil əzdim mən.

Unudublar səni, Saib yada salmaz kimsə,
Dərdimi ləl ilə dağ sinəsinə yazdım mən.

* * *

Surətin sanki səməndər eləyər ayinəni,
Gülüşün sinəsi gövhər eləyər ayinəni.

Hüsnünün şövkəti İsgəndərin o şöhrətinə,
Şəfəqin ayə bərabər eləyər ayinəni.

Can alan xalın ilə, şəkkərə dönmüş dodağın,
Tutuya bəlkə də şəkkər eləyər ayinəni.

Aləmi yandıran hüsnün eləməz kimsəyə zülm,
Odlu səhra, ya da məşhər eləyər ayinəni.

Tərləmiş surətin aydan da gözəl cilvələnər,
Baxana nurlu bir əxtər eləyər ayinəni.

Qanadım mum kimidir, Allah özün dadıma çat,
Atəşiin şöləli məcmər eləyər ayinəni.

Dolanar başına məşşatə, necə zərgərlər –
Bəzəyib haşiyəsi zər eləyər ayinəsi.

Arif insan ilə söhbət özü bir dövlətdir,
Görkəmin bir daha zivər eləyər ayinəni.

Göz yaşı tökdü xəcalətlə baharın buludu,
Şəbnəmin çünki təzə-tər eləyər ayinəni.

Sadəlövh tez düşər həmsöhbətinin təsirinə,
Təsirin tutuya bənzər eləyər ayinəni.

Yusifi görmək üçün güzgü həvəs etməyəcək,
Baxışın bil ki, tavangər eləyər ayinəni.

Daş ürəklər əriyib döndü suya hicrində,
Gözlərin çeşmeyi-kövsər eləyər ayinəni.

Saibin qəlbi yarın gül üzünə heyrandır,
Dil açar tərifə gövhər eləyər ayinəni.

* * *

Bir nəzər salsa əgər nərgizə oxşarın sənin,
Təzədən canə gələr bil necə bimarın sənin.

Düşsə şəbnəm gül üzə, qorxu budur təsir edə,
Asimanın göz yaşıyla güldü gülzarın sənin.

Gözlərində bir quru səhra olar dünya üzü,
Kim ki, bağlarda görər məstanə rəftarın sənin.

Dimdiyində tutinin sözlər də heyrətdən donar,
Üzbəüz dursa onunla güzgü rüxsarın sənin.

Hüsnünə baxmaq üçün yox kimsədə cürət belə.
Çün yaşardı gözləri gün gördü didarın sənin.

Gör şirinlikdən oləblər qönçələnmişdir necə?
Kimsə bilməz qönçədə gizlənmiş əsrarın sənin.

Kirpiyindən nizələr tutmuş təbiət çöhrənə,
Gülüzü hifz eləsin pis gözdən ol xarın sənin.

Kim səni dinlərsə o, vallah, ürəkdən şad olar,
Çünki düzdür hər sözün, hər əhdin, ilqarın sənin.

Aynaya cövhər çəkirlər ki, daha parlaq ola,
Dövrələnmiş ol qara zülfünlə rüxsarın sənin.

Güldərən heyrət edər, gördükdə səntək bir gülü,
Bəlkə məst eylər onu bir anda gülzarın sənin?

Cürət etməzdi çəkə meydanə öz gövhərlərin,
Yusifi Kənan əgər görsəydi bazarın sənin.

Torpağın altında da rahat yata bilməz, inan,
Kim ki torpaq üstə olmuşdur giriftarın sənin.

Nə qiyamətdən xəbərdardır, nə də duz dadmış o,
Saib, hər kəs görməyib o sərvüqəd yarın sənin.

* * *

Yuma bilməz gözünü aşiqi-divanə gecə,
Sübhədək çünki açıqdır neçə meyxanə gecə.

Boş söz ilə boş ürək ki, dola bilməz heç vaxt,
Kim oyaq qalsa ona xoş gələr əfsanə gecə.

Qəlbimin sərvəti sinəmdəki bu dağlardır,
Hər uçulmuş ev olar bayquşa da xanə gecə.

Ömrünü sərf eləyir şam da qaranlıq gecəyə,
Oldu göz yaşın şamın içə məstanə gecə.

Səhərin gül üzü xoş gəlmədi pərvanələrə,
Şənlənib rəqs eləyər şəm ilə pərvanə gecə.

Yoldaş oldur ki, silə dərdi-qəmi qəlbindən,
Necə ki, yoldaş olur aşiqə peymanə gecə.

Parlaq ulduz gecələr nur çiləyər yer üzünə,
Sən də yan, şölə çəkib şam kimi mərdanə gecə.

Yoxdu xəlvətdə yerim təkcə xəyalımla qalım,
Zahidinsə yeri mehrab, özü rindanə gecə.

Gecə məclisdə olan sübhi pərişan açacaq,
O qara saçlarına çəkməginən şanə gecə.

Qəmə fürsət düşə çəkməz ətəyindən əlini,
Özünü xəlvətə ver, çək yaxanı yanə gecə.

Xəstə dostun yanına dəyməyə, Saib, elə get,
Gəlişin ta ki, dönə dostuna dərmanə gecə.

* * *

Çalış riayət elə qanuna itaətlə,
Amandı, yorma nahaq xalqı sən ibadətlə.

Çalış qonaqlığa getmə, gedər olsan,
İtaət eylə sən hər qaydaya mətanətlə.

Əgər ki, var inamın Tanrı hər şeyi eşidir,
Yavaşdan elə duanı ürəkdə hörmətlə.

Yemək ki, süfrəyə gəldi, namazdan əl çək sən,
Çalış itaət eylə qaydaya cəmaətlə.

Yağ ilə bal kimi ol cümlə məclis əhliylə,
Üzünü turşudaraq baxma sən küdurətlə.

Tələsmə məclisi qurtarmağa hara getsən,
Çalış ki, yormayasan xalqı boş nəsihətlə.

Biri danışsa əgər kəsmə sən sözün yarıda,
Üyüdər öz dənini xalq həmişə növbətlə.

Gedəndə məclisə öyrən əzəl nədir səbəbi,
Soyutma məclisi, sən pıçhapıçla, söhbətlə.

Ziyafət olsa ora varlılar gələr şəksiz,
Gedərsə yoxsul əgər əyləşər nə halətlə?!

Belə zamanda ki, yox söhbətin xiridarı,
Çəkil də bir yana sən, dinmə, sus məharətlə.

Əgər ki, guşənişin olmaq istəməz Saib,
Başa salın onu siz indi bu nəsihətlə.

* * *

Görəsən dünyada bir qəlbi şad olan tapılar?
Yer şoranlıqsa əgər orda gülüstan tapılar?

Havayı oxlar üçün eyləmə sən ömrü hədəf,
Ox, kaman olsa əgər bəlkə də nişan tapılar.

Yamanı, yaxşını yol yoldaşı olmaqla bilin,
Ox əgər əyri ola uçdumu nöqsan tapılar.

Baharın məqsədi var gülləri açmaqda yəqin,
Gül açan vaxta yəqin nəğməyə imkan tapılar.

Qələmin yox hünəri bəs, bunu tərif eləsin,
Var neyistansa şir üçün təzə meydan tapılar.

Yazda bülbüllər ötər, bağlara çıx, sən qulaq as,
Gəlsə qış fəsli daha bülbül hayandan tapılar?

Gülü gülşəndə xar ilə görəcəksən birgə,
Nə zaman gül açılar onda da bağban tapılar.

Hər zaman hümmətimiz yüksək olub. Fayda nədir?
Nə olub mətləbimiz, sanma ki, asan tapılar?

Sən də o aynaya bənzər sinəni açsan əgər,
Aynaya baxmaq üçün tuti doğrudan tapılar.

Çəkilib bir kənarə ayrılı bu aləmdən,
Bilsə Saib, ona da yaxşıca canan tapılar!

* * *

Bu cahanda heç nəyə, bil, etibarım yox mənim,
Çün zəmanəylə döyüşməkçün qərarım yox mənim.

Odlara yanmış toxumdur bu həyatda hasilim,
Ömr ötüb keçdi daha, heyhat, baharım yox mənim.

Dərya ilə gövhərin fərqi, inan, yoxdu mənə,
Mən elə bir dəryayam ki, heç kənarım yox mənim.

Torpağa döndərsə dövran yolların üstə məni,
Bil ki, dövrandan özgə bir intizarım yox mənim.

Öz halımla qalmağım bəsdir mənimçün dünyada,
Çün həyatın işləriylə indi karım yox mənim.

Hamı tək bir istəyim vardır bu aləmdə fəqət,
Gözlərəm öz arzumu, özgə qərarım yox mənim.

Mən ki, əlvan nemət üçün içmədim qəlbin qanın,
Bu səbəbdən sinəm üstə laləzarım yox mənim.

Taleyim yarpaq kimi qonmuş nəsimin çiyninə,
Hər zaman yollardayam, heç bir qübarım yox mənim.

Ayna tək əks eyləmək olmuş əzəldən qismətim,
Ayna tək əks etməməkdə ixtiyarım yox mənim.

Bu həyatda olmadım mən rütbə, mənsəb düşkünü,
Çünki heç bir şöhrətə yox iftixarım, yox mənim,

Var ümidi Saibin də bir gül olsun qisməti,
Gözlərim olsun girov, özgə madarım yox mənim.

* * *

Kəmalın hüsnü hara, gözdə iztirab hara?
Şükufə bəhri hara, xeymeyi-hübab hara?

Görəndə zərrəni mən sanki bir cahan görürəm,
Ürəkdə tab hara, odlu-afitab hara?

Könlümdə qalmamış əfsus, qəmdən özgəciyim,
Bizim xərabat hara, nuri-məhitab hara?

Günəş bərabəridir təşbeh eyləsək üzünü,
O bayram ayı hara, səndəki hicab hara?

Səni gəzəndə bütün dünyanı gəzib aradım,
Hara gedim daha ey xaniman xərab, hara?

Məni ki, məstlərin nərəsi oyatmadı bəs –
Deyin, o nəğmə hara, nəğmeyi-rübab hara?

Tutaq çatdı mənə növbə, bir sual eləyim,
Sözün niqabı hara, qüdrəti-cəvab hara?

Bu gülyanaqlıların seyrinə dalıb qaldım,
Çəkib apardı məni aldadıb, sərab hara?

Gülü ləçəklərinin ətri rüsvay eləyir,
Üzünə çəkmə niqab sən hara, hicab hara?

Kal ilə dəyişmə bir gözlə baxma, fərqini bil,
Baxanda göz yaşına, məv hara, kəbab hara.

Tutubdu aləmi dərdsizliyyin bəlası, deyin,
Hara getdim ki, bu aləm olub xərab, hara?

Elə tutub gözümün kəsasın bu göz yaşı kim,
Yuxum uçubdu tamam mən hara, o xab hara?

Yarın camalına bax, şöləsi düşüb cahana,
Bu qəlb unutmuş özün, eyləyir şitab hara?

Həyat çeşməsinə baxmaram daha, Saib,
Səraba bənzəri var, mən hara, Sərab hara?

Dolmuş ürək qanıyla yenə əldəki camımız,
Meydan oxur hər axşam aya nurlu şamımız,

Bir baxmaq ilə aldın əlimdən qərarım,
Nərgiz baxışlı gözlərə de, yox aramımız.

O al şərabı içməyə mən tövbə etmişəm,
Çün tövbə edib içsək olar mey haramımız.

Ömrümdə düşmərəm mən o cənnət xəyalına,
Çünki fəna evindədi darüssəlamımız.

Meydən şirin nə vardır, odur şad edən bizi,
Meylə həyatda hasil olur cümlə kamımız.

Leyli kimin yüz ahunu biz salmışıq tora,
Eşq aləmində Məcnunu keçmiş məqamımız.

Qəlbin odundan atəş alır sinədə hər ah,
Yandıqca daha bəllənir eşqə davamımız.

Bu dünyada nə varsa onu əql dərk edir,
Müşküldü əqlə bəlli olan hər məramımız.

Xızrın ayağı dəydiyi yerlər çiçəklənər,
Bəxtin fidanı yarpaq açar var inamımız.

Ceyranların gözündə biz insafsız olmuşuq,
Torla deyil, duayla qurulmuşdu damımız.

Qənd verməsən bu dil-dil ötən tutiyə, inan,
Bir kəlmə də danışmaz o şirin kəlamımız.

Dünyanı da idarə edənlər bizik, nədən,
Çərxin əlində qul kimiyik indi hamımız.

Güntək cahana isti nəfəslər verən bizə,
Saib, yazıldı göylərə fəxr ilə namımız.

* * *

Bir ayna kimi vəslinə canan tələb eylə,
Əvvəl evi tik, sonra da mehman tələb eylə.

Gün gülmıx olub sancılıb eşqin qapısında,
Hər nə diləsən onda var, ondan tələb eylə.

Sən daşların altında göyərmiş ota dönmə,
Azad boy atıb, qalxmağa imkan tələb eylə.

Daşla dəmirin yoxdusa, atəş nədən olsun,
Gözlə yolunu, ta gələ karvan, tələb eylə.

Hər qönçəni sübh yeli xəndan edə bilməz,
Ey himmətimin qönçəsi, dövran tələb eylə.

Dostluq məqamın ölçməyə mizandı zəmanə,
Dostu sınasan borcu yalandan tələb eylə.

Saib, diləyirsən ki, sənə dost ola canan,
Əvvəlcə qələm, bir də qələmdan tələb eylə.

* * *

Çək yana zülfünü gül surətinə salma niqab,
Bu gözəllikdə sənə söylə, nə lazımdır hicab.

Sən olan məclisə cürət eləməz gül dolana,
Gülləri al yanağın atəşi etməkdə gülab.

Vəsl olubdur səbəbi sel tək axan göz yaşımın,
Şad olar kandarına göz yaşını töksə şərab.

Çöllərin hakimi divanə deyirlər, o bizik,
Bu səbəbdəndi şəhər sıxdı bizi, verdi əzab.

O təmiz gözlərə bax, eşqidir hakimlik edən,
Günəşin şöləsinə şəbnəm haçan etmiş tab?

Şor sudan göydə buludlar yaradır gövhər əgər,
Sən o pak gözdə eyib gəzmə nahaq, vardı səvab.

Su da layla çalaraq böylə yaratmışdı məni,
Ömr qəflətdə keçib getdi, nədir indi cavab?

Tamam etmə, yaxanı qurtar əlindən tamahın,
Arxayın olma duan hasil ola xanəxərab.

Bu xəyallardı soxulmuş yenə də qəlb evimə.
Havası artsa belə partlayar axırda hübab.

Şah əzab versə əgər rəyətinə şah deyil o,
Bənzəyər sərxoşa kim eylər ətin şişdə kəbab.

Saib, aldanma ki, dövran sənə rahat keçəcək,
Sən kimi təşnəni çox aldadıb axır bu sərab.

* * *

Fələyin min kələyi, fitnəsi var, yatmaginan.
Körpünün altına daim sel axar, yatmaginan.

Sübh açılmış gülə şəbnəm hamıdan çox yaraşır,
Sübh çağı dursan halın yaxşı olar, yatmaginan.

Şikarın eşqi ilə tor da gözün yummur, inan,
Yatmasan, qismət olar yaxşı şikar, yatmaginan.

İstəyirsən hər işi sən alasan öz əlinə,
Ox elə kirpiyini, sinəni yar, yatmaginan.

Ələmin kölgəsinə girmə, nahaq ah eləmə,
Sübh əgər qovğa üçün versə qərar, yatmaginan.

Acı söz söyləməyin faydası yoxdur, ilanın
Yuvası üstə yatan olsa çalar, yatmaginan.

Hər kəsin xəstəsi varsa ona yatmaq yaramaz,
Rəhm elə sən də bizə bir gecə, yatmaginan.

Qayığın köhnədirsə, su dolacaq ağzınadək,
Göz yumarsan, qayığı sel aparar, yatmaginan.

Gecə sən olma günah əhli, könül aynasını –
Yoxsa sübh vaxtı təzə cəng tutar, yatmaginan.

Pusquda oğru olar kim yata yol üstə əgər,
Çalışıb mənzilə tez çat, yolda bekar yatmaginan.

Damarında qaralan qanları neştərlə çıxar,
Ver özün öz halına fövri qərar, yatmaginan.

Dəryada yummayır heç vaxt balıq gözlərini,
Sahilə gəlsən əgər olma xumar, yatmaginan.

Lalənin yarpağı olsun sənə örnək, ona bax.
Sinənin yarasını sən də qopar, yatmaginan.

Ayı almış araya halə məhəbbətlə yenə,
Sən gecə haləyə dön, ay da nigar, yatmaginan.

Qönçə ilə baharın, gör, necə şadlıq dəmidir,
Səni gül kölgəsinə çəksə bahar, yatmaginan.

Çəməni, sərvi sevən qumru yumarmı gözünü,
Başın üstə dayanıb qəddi çinar, yatmaginan.

Yunisi uddu balıq, dəryada da qaldı oyaq,
Dövrənə mavi sular çəksə hasar, yatmaginan.

O badam gözləri ömrün tağına bənzədərik,
Rüzigarında gözündə gözü var, yatmaginan.

Leyli karvanla gedir sərvanıdır indi hilal,
Sənə Məcnun deyəni kim qınayar, yatmaginan.

O qara zülfünə bax, əldən alıbdır qərarım,
Bu qərarsız quluna ol havadar, yatmaginan.

Gecə zülmətdi deyib çox nahaq işlər görülür,
Sən ədəb gözlə, daha etmə qübar, yatmaginan.

Kəndlinin torpağı var, heç səninki deyil az,
Torpağa göz yaşı tök, gündə suvar, yatmaginan.

Kəhkəşandır fələyin tutduğu ol odlu qılınc,
O qılınc başı bədəndən qoparar, yatmaginan.

Hər bahar rəqs eləyər torpağının zərrələri,
Sən də torpaqsan əgər, durma kənar, yatmaginan.

Fələk öz gövhərini vermiş əmanətdi sənə,
Gizli saxla onu sən, oğru duyar, yatmaginan.

Torpağa mərkəz olub indi şəhidlər ürəyi,
Bu şəhid qəlblərə sən vermə azar, yatmaginan.

Mövləvi şerinə Saib bunu yazmışdı cavab,
Ömrünün bir gecəsi sən də naçar, yatmaginan.

* * *

Hansı qəlbdə yandısa, bil ki, çırağban etdi söz,
Söz qanan insanları gülşəndə mehman etdi söz.

Hansı söz dinlədikdə qəlbə təsir etmədi,
Bil təbil tək hay salıb boş yerdə cövlan etdi söz.

Öz qələmin dişləyərsə söz yazan sözdən sarı,
O qələm əhlin axırda çox pərişan etdi söz.

Xızrın o abi-həyatı zülmət içrə axsa da,
Çün damarlarda axanda sanki tüğyan etdi söz.

Özgələrdən bircə fərqim vardı bu babətdə kim,
Hamıdan artıq məni mənada heyran etdi söz.

Kim təvazöhlə dedi qönçə kimi bakirə söz,
Belə söz sahiblərin vaxtında xəndan etdi söz.

Mehribanlıq eyləyib mən sözlərə verdim sığal,
Quş kimi açdı qanad, göyləyə cövlan etdi söz.

Gərçi İsgəndər üçün lövhə qoyuldu qəbrinə,
Qəbrimi rövşən edib xalqa nümayan etdi söz.

Çün qələm tək öz başından keçdi Saib söz üçün,
Bu səbəbdəndir onu məşhuri-dövran etdi söz.

* * *

Görmədim bir gözəli eşqə giriftar deyil,
Hüsnünə Misridə kim var ki, xiridar deyil?

Şirləri ovlayanın qəlbini sən ovlamısan,
Hansı şirdir ki, bu işdən o xəbərdar deyil?

Elə bir lalə tapılmaz bu çəmənlikdə onun
Qəlbinə od salan o səndəki rüxsar deyil.

Sənin o silsilə zülfündü bu dünyanı tutan,
Varmı bir kəs ki, saçın boynuna zünnar deyil.

Göz dikib gözlərinə məst də, xumar da bunu bil,
Elə nərgiz tapılar çeşminə oxşar deyil?

Hər kəsə ləli-ləbin bir dil ilə söhbət açar,
O şirin ləhcədəki söz kimi aşikar deyil?

Açmamışdır hələ bağçanda sənin bircə çiçək,
Demə öz bəxtinə kim, bəxt sənə yar deyil.

Sənin hüsnün, gözəlim, göz bəbəyimdən pakdır,
Hüsnünün bağı sənin adicə gülzar deyil.

Sədəfin bağrını yar, orda tapılmaz ümman,
Mənə göstər sinə ki, məhrəmi-əsrar deyil

Kim ki, səndən çəkir əl, söylə, əlində nə qalır?
Nə tələb eyləyir ol kəs ki, tələbkar deyil!

Nə gözəl oldu ki, sən aynadan üz döndərdin,
Hər pərişan nəzəri görməmək inkar deyil!

Bu qərəz əhli yanında dil açıb dinmə nahaq,
Saib, hər gövhərə onlar ki, xiridar deyil.

* * *

Söz onun tərifinə səy ilə imkan tapdı,
Tuti aynanı görüb söhbətə meydan tapdı.

O gülün şəbnəmi düşsə deşəcək daşı inan,
Bülbülün göz yaşı ilə böyüyüb, can tapdı.

Hər adam hər nəyə kim layiq idi aldı onu,
Cəmi Cəm aldı, xızr çeşmeyi-heyvan tapdı.

Başını köksünə əy, qal özün-öz fikrin ilə,
Qönçə bu halı ilə şöhrəti asan tapdı.

Qəlbini dərdi ilə çox da ümidsiz olma,
Zərrə öz qəlbinə daldı, təzə ümman tapdı.

Kim susa bildi səadət açarın tapdı o da,
Çün sədəf susdu axır dürri-dirəxşan tapdı.

Can alan sözləri vardır o susan ləblərinin,
Namənin şadlığını ilk dəfə ünvan tapdı.

Əfsus ol Fərhada kim çapdı dağı bilmədi o,
Onu ki hiylə tapıb, zor onu hardan tapıb.

Min əzab qarşıda var, indi hanı öylə adam –
Qəlbinin arzusunu olmadı nalan tapdı.

Çox tələsmə çətin iş, tez dəyişib asan ola,
Quyudan çıxdı Yusif, sonra o zindan tapdı.

Bu fikirlərlə daha söyləmə Saib nə tapıb?
Onu tapmış ki, nə Hatəm, nə Süleyman tapdı.

* * *

Dostluğun çox şərti var ancaq, qanında yox sənin,
Dost üçün şam tək alışmaq da canında yox sənin.

Torpağından güc alıb azad ucalmış sərv tək,
Kim deyir ki, yox ucalmaq imkanında yox sənin?!

Çəkdi xəncər al günəşin üstünə bayram ayı,
Qaşını harda görüb ay ki, yanında yox sənin.

Hüsnünə heyran olan göylər qızı atəş saçar,
Sənsə sakit durmusan bir cövlanın da yox sənin.

Dərdə bax, qəlbim səni biganədən eylər soraq,
Bilməyir ki, özgələrlə peymanın da yox sənin?

Sədd çəkir nazın yolumda, yoxsa birdir qəlbimiz
Məndən ayrı çün bu yolda qurbanın da yox sənin.

Söyləyin ümmid elə, Saib, o yarın lütfünə,
Bir şikarsan, yoxsa, heç bir ad-sanın da yox sənin.

* * *

Tikan üstə oturam xoşdu, nə ki, nadan ilə,
İldırım olmasa göylər qaralar tufan ilə.

Səyyadın mənzili əvvəlcə fəqət çör-çöp idi,
Ayıra bilməyirik indi ovçunu xan ilə.

Kim paxıl olmasa qorxmaz o, cəhənnəmdən, inan,
Çün paxıllıq özü oddur, dolanır insan ilə.

Bizi bu beş gün olan ömr gətirmişdi cana,
Vay o, Xızrın halına, ömr edəcək dövran ilə.

Ölümü sadədil insan çox uzaq zənn eləyər,
Bir qəbirdir hər otaq hey dolur o mehman ilə.

Dil bıçaq tək itidir, doğrayar öz ömrünü də,
Bil, günahsız adamın yoxdu işi zindan ilə.

Günəşin gözlərini qəm tozu tutmaz, Saib,
Görür hər kəs cahanı qəlbi verən imkan ilə.

* * *

Eşq dağında belə şöləyi-qeyrət qalmayıb,
Soyuyubdur al günəş onda hərarət qalmayıb.

Ah ilə bayraq ucaldan bir ürək yoxdu daha,
Sərvidən xali olub, indi o cənnət qalmayıb.

Kəhrəbanın önünə qaçmır əgər yolda saman,
Bil, pozulmuşdu nizam, çox şeydə hikmət qalmayıb.

Dəryada təmkin, əgər sellərdə sürət yoxdursa,
Məst başlarda deмək şuri-məhəbbət qalmayıb.

Lalə üzlərdən uçub çünki həyanın rəngi də,
Hətta cənnət meyvəsində bir təravət qalmayıb.

Çün bulud saqi əlində çevrilib oldu sərab,
Bu səbəbdən gövhəri-meydə səxavət qalmayıb.

Xızr abi-heyvanı İsgəndərə verməz nişan.
Ruzigarın xislətində heç mürüvvət qalmayıb.

Dünyanı salmış qəribə bir xəyal titrətməyə,
Çün qənaətdə daha əvvəlki ləzzət qalmayıb.

Tapmadım bir əhli dil ki, qəlblərə məhrəm ola,
Mən dolandım çox şəhər, çox-çox vilayət qalmayıb.

Yoxdu bir asudə yer ki daldalanmaq rəsm ola,
Çünki asudə adında indi nemət qalmayıb.

Bu susub əyləşməyi siz yazmayın heç şadlığa,
Yox, daha bizdə həvəs, bir də şikayət qalmayıb.

Heç də cənnət meyvəsindən pis deyil qəlbin qanı,
Əfsus olsun ki, daha əhli-fərasət qalmayıb.

Şərqin o ağ saçların Saib görüb peşman olub.
Əfsus olsun tövbə üçün əldə fürsət qalmayıb.

* * *

Bir söz ümmanı coşar dalğalı sinəmdə mənim,
Dünyaca məna yatır susduğum hər dəmdə mənim.

Nə zaman məst oluram, mey küpü də cuşa gəlir,
İtirir huşunu çox meygədə qüssəmdə mənim.

Dərdini gəzməginən pərdəli aləmdə nahaq
Tapacaqsan qucağımda uyuyan qəmdə mənim.

Hər təzə söz ki, söz əhli bəyənib fəxr eləyir,
Bir, yadımdan çıxıb o məst olan əyyamda mənim.

Fələyə yüksələn o təndirimin tüstüsüdür,
Ayağım tozudu göy qübbəli bu damda mənim.

Göylərin pərdə dalında görünən kəhkəşanı
Öz əlimlə alışır hər gecə bayramda mənim.

Gətirib sufiləri cuşa bu vəhdət şərabı,
Sonra da heyran edib odlu sözüm həm də mənim.

Ya xərabatda, ya da meyxanada doldu yaşa,
Dərdlərim təlim alıb çünki o aləmdə mənim.

Sanma dərviş libası geyməyimi pərdə mənə,
Bənzərim yoxdu, inan, zahidə heç kəm də mənim.

Eşqə mən həlqəbeküş bəndəyəm, aləm də bilir,
Kaş yaman gözdən uzaqda qala həlqəm də mənim.

Saibəm, çatmayacaq bəlkə sözüm bircə kəsə,
Nə qədər eşqin əli gəzməsə sinəmdə mənim.

* * *

Gülməyin gizlətmə kim sanki gülü pünhan edər,
Kim açıb ağzın gülər bir bağçanı viran edər.

Kim ağır vaxtda çatarsa xalqının imdadına,
Damlanı öz hümmətilə eylə bil ümman edər.

Göz yaşın kim düşmənindən gizlədə bilsə əgər,
O, bu hal ilə yəqin öz düşmənin nalan edər.

Bir qəzəb dünyasını kim söndürüb xamuş edə,
Sanki yanmış bir düzü lalə dolu meydan edər.

Söz qananlar məclisində kim susub dursa yəqin,
O, tikanla sinəsin başdan-başa al qan edər.

Şadlığın kim gizlədərsə, qəsd edər öz bəxtinə,
Eylə bil öz qiymətin xalqın gözündən yan edər.

Laləli bir çöldə kim al rəngli mey çəksə əgər,
San şəhidlər qəbrini o şam ilə əlvan edər.

Kim öz eşqin gizlədib qəlbində saxlar, Saib o,
Sən elə fikr eylə ki, bir parça od pünhan edər.

* * *

Çöhrəni görsəm qəm artar, görməsəm mümkün deyil,
Bu gülü dərsəm günahdır, dərməsəm mümkün deyil.

Hər nə var məşuqdan özgə hicran üçün pərdədir,
Yusifin ətrin verir köynək desəm, mümkün deyil.

Var şəhidlər yarası, sinəmdə ulduzlar sanı,
Söyləmə indi mənə sən çəkmə qəm, mümkün deyil.

Meyvə dəyməzsə budaqdan ayrılıb düşməz yerə,
Mən də ol kal zahidə dərs verməsəm, mümkün deyil.

Mənzili etsəm əvəz, bil, laməkanlıqdır yerim,
Dövrəmə dövr etməsə aləm bu dəm, mümkün deyil.

Qönçəni sübhün yeli hər vaxt çıxardar düymədən,
Məndə ol sübhün yeliycə var kərəm, mümkün deyil?!

Hər kəs öz qeydindədir, hər kəs bəzər öz surətin,
Gövhərin etmək suyun əl ilə cəm, mümkün deyil.

Çün gülüstanı tutubdur güllərin ətri tamam,
Olmasa bülbül gözü məhbəsdə nəm, mümkün deyil.

Bisütun Fərhad kimi bir aşiqə qəsd eylədi,
Gör onu torpaqlara mən sərməsəm, mümkün deyil.

Bir həyatdır aşiqə ol zülfünün hər bir teli,
Mən ona bağlanmışam, bil, hörməsəm mümkün deyil.

Tövbə et gənclikdə sən, hər bir günahdan xali ol,
Diş də düşsə, yar ləbindən öpməsəm mümkün deyil.

Cəzb edər səni, Saib, gəl, palçığa basma ayaq,
Sonradan peşman olub çəkmək qədəm, mümkün deyil.

* * *

Bizdən ucada bəlkə də bir sirli cahan var?
Varsa, orada özgə həyat, özgə zaman var.

Nə qaldı bizə, fikr eləsən, bircə təmənna,
Aşiq sinəsində o təmənnanı duyan var?

Övladı bəşərdən kənarda varmı bir insan?
Kim görmüşdü onu, varmı hanı? Harda nişan var?

Göz yaşı tökürlər ümidin matəmi-üçün,
Bu yer kürəsində nə qədər abi-rəvan var?

Əfsus ilə ahdır ucalır hey sinələrdən,
Bu bağ verəcək təzə bəhər bir də güman var?

Sən aləmə baxmaqda, çalış, sadədil olma,
Bu torpağın altında məgər özgə cahan var?

Div göstərir hərdən mələyə sirrili ayna,
Bəlkə bu cahanda yenə bir sirri-nihan var?

Dünyanı dolan sən də günəş tək, halalındır,
Pak duyğulu insanlara bundan nə ziyan var?

Can tutisinin sözləri heç vaxt acı olmaz,
Sinəndə onu əks eləyən ayna, inan var.

Gəlmirsə iki dünyada bir iş ki əlindən,
Bir küncə çəkil, gözlə hələ ömrə aman var.

Saib desə öz dərdini qan ağlayacaqdır,
Bu məclisimizdə nə qədər dərdi duyan var.

* * *

Mən nə təxtü tac, nə də mülki-Süleyman istərəm,
Kaş ki, məndən razı qalsın nazlı canan, istərəm.

Qalmışam bir taxta üstə mən bu sakit dəryada,
Dalğası hay qoparan bir coşqunümman istərəm.

Bu yalançı dünyaya gülmək dilər qəlbim mənim,
Sübh tək gülmək üçün mən də bir imkan istərəm.

Tufana cövlan üçün meydan gərəkdi çox geniş,
Qəlbimin tufanına mən bir də cövlan istərəm.

Yox kəvakib nuruna çün ehtiyacım, ay kimi –
Ol günəşdən süfrəmə mən istəsəm, nan istərəm.

Bir qarışqa timsalam, yox etibarım torpağa,
Şah Süleyman təxtinə eylərsə mehman, istərəm.

Bu ölü dünya buraxsa pəncəsindən gər məni,
Qəmdən azad dost ilə mən əhdi peyman istərəm.

Cəddimin yanında yatsam sanma rahat olmaram,
Yusifəm, qardaşlarım olmuşdu "düşmən", istərəm.

Cənnətə dərban qoyarlarsa məni verməm riza,
Aynadar etsə məni o mahi-taban, istərəm.

Arzusuz bu qəlbə hərgah etsələr bir mərhəmət,
Hər nə imkan eyləyib dost versə ehsan, istərəm.

Bu şəhər sıxdıqca, Saib, məndə taqət qalmadı,
Bir geniş səhra, yaşıl çöllük, biyaban istərəm.

* * *

Bu həyatda hamı olmuşdu giriftar özünə,
Unudub haqqı tamam, tək ümidi var özünə.

Yetimin divarını Xızr da tikməz yenidən,
Hər kəsin fikri budur, tikdirə divar özünə.

Şam da pərvanə üçün göz yaşını tökmür inan,
Sübh olur, ağlayır indi o da zar-zar özünə.

Qönçə həsrət tikanın bülbülə qoymazdı dəyə,
Amma göz açmağa qoymur bu tikanlar özünə.

Kimdə özgə yükünü alsın onun çiynindən,
Hamı İsa kimi olmuşdu cilovdar özünə.

Əzəli nur düşübdür dərü divara tamam,
Yusif öz hüsnü ilə oldu səbəbkar özünə.

Saibin yox nəzəri çün buludun gövhərinə,
Bəsdi öz təbi, olub indi göhərbar özünə.

* * *

O dodaqlar ki, susur, sanma ki, sözsüzdür hər an,
Çox zaman sakit olur çün ürəyi sözlü olan.

Kamanın qoynuna girdikdə susur ox da belə,
Kənara çıxmaq üçün ortaya girdim mən əlan.

Nə ürək peşman olubdur, nə də əfsus demişəm,
Nə zaman əl çalıram kirpiyimi çallam inan.

Pambığı at qulağından, sökülür dan yeri, bax,
Başqa bir mənası var sübh sözünün olsa duyan.

Sürmə çəksən gözünə, bil ki, gözün nura gələr,
Taleyin bəd gətirsə elə sən tərki məkan.

Saib öz naməsini yazdı ürək qanı ilə,
Bir yəmən ləli kimi alsın onu namə alan.

* * *

Ehtiyacın varsa da qəlbən tox olsan yaxşıdır,
Dəryadan minnət belə çəkməszə insan, yaxşıdır.

Bəxtsizlər eşqidən çəksə bəlalar, inciməz,
Şor sudan qorxmaz balıq, hər yerdən ümman yaxşıdır.

Yol gedən tək olsa, tək də qət edər axır yolu,
Hər iki aləmdə kim tək etsə cövlan, yaxşıdır.

Hiyləgər bey köynəyi geysə təkəbbürlə gəzər,
Əyninə atlas geyə saf qəlbli insan yaxşıdır.

Şənbənin fikrin çəkər cümə gələndə hər uşaq,
Günləri sən xoş keçirt, var əldə imkan yaxşıdır.

Dəryada yelkən açıb sərxoşlar hay salmış nahaq,
Kuzələr salsa haray məclisdə, ondan yaxşıdır.

İldırımdan yansa xalqın xırmanı, dargöz adam
Əl uzatmaz, söyləyər, yansa bu xırman yaxşıdır.

Ay buludda gizlənəndə ayrı cür görkəm alır,
Çün gözəl çöhrə gecə örpəkdə pünhan yaxşıdır.

Hər ötən gün sonradan xatırlanır xoş röya tək,
Fikr edirsən ki, dünən hətmən sabahdan yaxşıdır.

Hər işi yüz ölçmədən bez biçməyin yox faydası,
Sən də, Saib, hər işi yüz ölç, doğurdan yaxşıdır.

* * *

Varına eyləmə sən çox etibar,
Günəşi göydə gəzən yerdə tapar.

Qurumuş çeşmədi yay fəsli bulud,
Bəhrəsiz əldə görübsənmi qabar.

Qar kimi əl, kimə vermiş de, xeyir?
Zəhmətin bəhrəsi də gövhər olar.

Xəsisin zəhr dadar hər tikəsi,
Qan kəsif oldumu neştərlə çıxar.

Səhərə qalmış bir ulduz kimidir
Şam işığında yatan nazlı nigar.

Gözəlin xisləti də xoş olacaq,
Surətin məna ilə vəhdəti var.

Lalənin bağrı kimi bağrı yanar,
Gecə-gündüz meyə kim olsa düçar.

Özgə eybin deməyə sayma hünər,
Özün öz eybini gör, ver də qərar.

Rəngi yox, ətri yox, o şeh kimidir,
Saib, hər kəs mey içib olsa xumar.

* * *

Xatirin xoşsa əgər, badə nə lazımdır daha.
Qəlbin aydınsa sənin səhra nə lazımdır daha.

Sərvətin neylər o kəs ki, ürəyi varlı ola,
Etiqadın yoxdursa dünya nə lazımdır daha.

Bağı seyr eləyər insan ki, onun könlün aça
Nə zaman xoşdu ürək, onda nə lazımdır daha?

Sənə mən etibar etdim evimin sərvətini,
Xəlvəti girmək ora amma nə lazımdır daha.

Göz ki, dostlar üzünə baxmaq üçün lazım olur,
Yəqubun yoxdu gözü, olsa nə lazımdır daha.

Buludun yelkənə yox ehtiyacı, göydə üzər,
Aşiqə yarı gərək, başqa nə lazımdır daha.

Dağ əgər ləl yetirə, qırmızı lalə nə gərək,
Bir adam ölmüş ola, xülya nə lazımdır daha.

Sabahın dərdi bu gündən çox olar, şübhəsi yox,
Bu günün dərdini çək, sonra nə lazımdır daha.

Xəncərin əks eləyir halımı aydın su kimi,
Ərzi-hal eyləməyə ayna nə lazımdır daha.

Saibi məşğul edib eşqi bu ay üzlülərin,
Bu camal təşnəsinə dərya nə lazımdır daha.

* * *

Əql bir körpə fidandır ki, xəzan qəmdir ona,
Eşq bir sərvidi, güllər hamı həmdəmdir ona.

Hər kəs öz əsli ilə daxil olur meydana, bil,
Kimə xoş keçsə, o dövran sürəcək, dəmdir ona.

Dünyanın dərdi nədir, qəm elə eşqin qəmidir,
Hər qəmi çəkməz aşiq, eşqin özü qəmdir ona.

Eşqə düşmüş ürəyə vəsl ilə dərman nə gərək?
Kim məhərrəmdə tutar bayramı, matəmdir ona!

Kim açıq gözlə baxar dünyaya, dövran sürər o,
Bu həyat nəşə dolu, bal kimi aləmdir ona.

Hüsnümün aynasıdır əks eləyən hər nəzəri,
Gül gülən üz kimidir, ayna da şəbnəmdir ona.

Hər kimin qəlbi ilişmişdir o zülfün toruna,
Ömrünə nəşə verər, çünki bu məlhəmdir ona.

Kim yumub ağzını sakit çəkilə bir tərəfə,
Bu susub durması bir dövləti-hatəmdir ona.

Saib, hər qəlb ki, paxıllıq oduna yandı, inan,
Düşsə cənnət bağına, bil ki, cəhənnəmdir ona.

Dostluğun möhkəmliyi ilqardadır, peymandadır,
Dövranın zülmün nə bilsin ta toxum xırmandadır.

Mehribanlıq eylə sən namehriban insanlara,
Yusif olmaq bir dözümdə, bir də ki, imkandadır.

Hər kəsin ağlı çox olsa, çox olar sinə dağı,
Ev çıraqla nurlanar, əsli səbəb də bundadır.

Arzularla çırpınan qəlb eşqə minnətdar olar,
Sap kimi incəlmisənsə eşq odu, bil, candadır.

Kim gülün ətrin sevirsə əllərin vurmaz gülə,
Yusifin də köynəyi o gül kimi meydandadır.

Kim yumar söylə, gözün meyxanədə məst olsa da,
Kuzə bir yanda durur, mey camı da bir yandadır.

Arpaya eylər əsər, Saib, bulağın saf suyu,
Qəlbi nazik kəslərin həssaslığı çün qandadır.

* * *

Yatmağa meyl eləyir ol göz ki, giryan olmayır,
Nəfsinə quldur o kəs ki, qəlbi nalan olmayır.

Əbədi ömr qazanmaq istəsən keç ömrüdən,
Əbədi ad-san qazanmaq bil ki, asan olmayır.

İşlərim müşkül olubdur, təqsir öz əqlimdədir,
Püstəni sındırmayınca ağzı xəndan olmayır.

Mərhəmətlə, rəhm ilə işlər yetəndə hasilə,
Mərhəmətsiz qardaş heç bundan peşiman olmayır.

Söz demə dünya işindən ölüyə, bilməz onu,
Qızmasa təndir çörəklər orda büryan olmayır.

Günəşə naz eləyər ol gün ki, bədr oldu hilal,
Ay üçün göylərdə hər dəm böylə meydan olmayır.

Sıxdı zindan tək məni həsrət də, qəm də doğrusu,
Ayrılıqdan kimlərin qəlbi pərişan olmayır.

Bu qoca vaxtında düşdüm mən də sərvət eşqinə,
Bilmədim hər qocalan kəs də Süleyman olmayır.

Saibə xoşdur bu səhrada qala tək, tənha o,
Çünki bu səhrada bir ahu da mehman olmayır.

* * *

Nə qədər çox ola şadlıq yenə qəm kamil olar,
Bir kəsin xərci gəlirdən çox ola aqil olar?

Dövranın qəlbi kədərlənmədi göz yaşımıza,
Çürümüş toxmu əkib gözləmə ki, hasil olar.

Ona aşiq deyərəm eşqi üçün dara gedə,
Dəyməmiş meyvə düşərsə yeməyə qabil olar?

Zülfünün həlqəsi bu qəlbimi yandırdı mənim,
Kim tamaşaya dura, qırpsa gözün, qafil olar.

Könlümün arzusu birdir sənin heyvanlarının,
Gör, o zülfündə neçə aşiq üçün mənzil olar?

Göz önündən bu həyat girdabı qalxarsa əgər,
Bu yolun yolçuları məqsədinə nail olar.

Yedi qəlbin qanını hər söz üçün Saib də,
Parçalanmazsa ürək, gözləmə söz hasil olar.

* * *

Qoysa əvvəl kərpici torpağa bir memar kəc,
Asimana dəysə də, axır olar divar kəc.

Bir qapağa bənzəyər, sanki qoyubsan boş qaba,
Çün beyinsiz bir başa qoysan əgər dəstər kəc.

Aciz eylər hər kəsi bir dar cığırla getsə o,
Vay o gündəndir yolun olsun uzaq, həm dar, kəc.

İnsana nöqsan olar etsə xəsislik həddini,
Toxunar tez çör-çöpə olsa əgər paltar kəc.

Bir mədar vardır, ona tabedi cümlə kainat,
Eyb tutma gər cıza öz xəttini pərgar kəc.

Çün təvazölə azalmaz rütbəsi hər bir kəsin,
Kəçdi şəmşir, heç zaman etməz onu, bil, xar kəc.

Əyridir həm dimdiyi, həm caynağı vəhşi quşun,
Əyri eylər insanı çün tutduğu hər kar kəc.

Düzlük et, Saib, çün əyri işdən olmaz yadigar,
Kölgəsi əyri olar, olsa əgər divar kəc.

* * *

Sübh o vaxt qəlbə yatır ki, üzü xəndan olsun,
Zülmətin qəlbini yarsın o nümayan olsun.

Dodağın qoy dodağın üstünə, sakitcə otur,
İstəmirsənsə əgər qəlb evi viran olsun.

O qiyamət səhəri dəryamın ağ dalğasıdır,
Hansı məcnundu bu gün sahibi-fərman olsun?

Yusifin surətinə bənzəri var bəxtimizin,
Ümidim vardı mənə qardaşım həyan olsun.

O qiyamət odunun dağı kimi cilvələnər,
Eşq sirri hər ürəkdə necə pünhan olsun?

Aləmi-qeybə açıq pəncərə olmuşdur ürək,
Bəlkə divanəliyim orda firavan olsun.

İnsaf əhli deyərəm xalqa yaxınlıq edənə,
Əsl kəbə odu ətrafı biyaban olsun.

Bu qızıl ilə gümüş qəlbini şad etməyəcək,
Nəyə lazım yığasan, sonra da ehsan olsun!

Buludun göz yaşı nemətdi, fəqət şimşəklər –
İstərəm çaxmaya ta kəndli də nalan olsun.

Bil, qənaət eyləyər süfrədəki nemət ilə –
Hər o kəs ki, gözü tox, qayğulu insan olsun.

Hörmət ilə yad olar mərd kişilər ölsə belə,
Əsl insan da odur qəlbdə mehman olsun.

Hər qarışqa ürəyin şad eləyər bir dən ilə,
O dənin sünbülü qoy taci-Suleyman olsun.

Ney dinən dəmdə məni naləsi hüşdan eləyir,
Şir də istər yer üzü cümlə neystan olsun.

Ürəyi daş olan insan hara, kövrəklik hara?
Sanma hər qəlbdə bu ləli-bədəxşan olsun.

Dil danışmazsa yanar, amma başın salim olar,
Dinmə, qoy dinməməyim başına dərman olsun.

Gülməsən, ağzını yum, çünki bu dünya belədir,
Yeyər öz başını hər püstə ki, xəndan olsun.

Kim görüb şişmək ilə tarlada dərz bağlayalar?
Nə edər mey o kəsə ömrü pərişan olsun?

Yeri vardır bu qəzəl divanımın tacı ola,
Saib, hər kəs oxusa bir daha heyran olsun.

* * *

Bu səmanın altında kim şadiman olubdur?
Bu bağçanın gülləri nə vaxt xəndan olubdur?

Zəmanənin selindən haray düşüb cahana,
Sel çağlayıb gələndə, hardan aman olubdur?

Bir qəlb ki, coşmayırsa, qəbrə gömülsə xoşdur,
Qızıl sikkə deyilsə yerdə nihan olubdur.

Sən incimiş ürəkdən dözüm umma nahaqdan,
Oxa dönəndə hər ah özü rəvan olubdur.

Saralmış çöhrəmizdir sən istəyən o məktub,
Nə söyləyim ki, orda hər şey bəyan olubdur.

Sən aşiqin yanından uzaq getmə, amandır,
O gülləri dərərlər, yeri meydan olubdur.

Şad olma sən baharın sübh vaxtı gülməyindən,
Vaxtsız gülən o başda beyin haçan olubdur?

Ürək dərdin əlindən solub gedər, ol agah,
Bir yerdə toz görünsə, bil, karıvan olubdur.

Acizlərin əlindən tutmaq savab bir işdir,
Özgəsinə sığınmaq hər vaxt asan olubdur.

Minlərlə bülbül ötmüş bu bağçada, bu bağda,
Saib kimi ürəkdən nəğmə qoşan olubdur?

* * *

İmkanın vardısa, nadan ilə söhbət eləmə.
Söz ki bir ayinədir, sən onu zülmət eləmə.

Bu bağın qönçəsinin al dodağı qandı tamam,
Nə işin olsa açıq gör, onu xəlvət eləmə.

Başda zərrin tacı, hey ömrü boyu ağladı şam,
Sərvətə etmə tamah, zərdədi zillət, eləmə.

Gəmi boş olsa, onu dalğalar hey oynadacaq,
Qəm ilə dolsa sinən sən buna xiffət eləmə.

Gözünün küncünə düşmüş o xalın fitnəsi var,
Ehtiyat eylə, ona çox da məhəbbət eləmə.

Tükü-tükdən seçən o Saibən bax, dərsini al,
Zünnarı vermə əlindən, daha qəflət eləmə.

* * *

Hər adam ki, kişi tək eybini söylər üzünə,
Öp onun gözlərini, həq ver onun sən sözünə.

Yaxasın verməz o əlbəttə qəmin pəncəsinə,
Bir adam ki, gecəni qatmış ola gündüzünə.

Sahibi-xırman olubdur o dama dünyada,
Səpib öz göz yaşını buğda kimi yer üzünə.

O kəs hörmətlidi ki, milçəyi də incitməz,
Dünyanın varı-yoxu gəlməyir əsla gözünə.

Sən çalış yaxşılığın toxmunu ək torpaqda,
Kim nə əkmişsə axır qismət olur da özünə.

O hilal Saibə bənzər, necə əymiş belini,
Başını qoymuş üfüqdə bu səmanın dizinə.

* * *

Bu gözəllər ki, təkəbbürlə, hey ətrafa baxar,
Bilməyirlər, yarımın qar kimi ağ gərdəni var?

Yığılıbdır ki, qiyamət səhərin seyr edələr,
Yaxasın açsa nigar, onda qiyamət də qopar.

Çünki ustad qələmi çəkdi sənin surətini,
Qələmə bənzəri var qamətinin nazlı nigar.

Ahu ol gözlərini gördü xəcalət çəkərək,
Leylinin xeyməsinə getmək üçün verdi qərar.

Cənnətin meyvəsini vəsf eləyənlər bilmir,
Yoxdu o bağda bu qamətdə, gözəllikdə çinar.

Səni Xızrın o həyat çeşməsinə təşbeh edən,
Ləbinin ləlini görsə bu cahanı unudar.

Qəlbi korlar səni dərk etməyə acizdir, inan,
Qəlbi kor insana yox fərqi bu qışdır, ya bahar.

O lətif ləblərinin çün əqiqə bənzəri var,
Bir təmasdan o əqiqin qanı torpağa damar.

Dövranın gözlərinin ərşə çəkilmiş yuxusu,
Nə zamandan ki, o məst gözlərin olmuşdu xumar.

Xəcil etmişdi, inan, lalələri al yanağın,
Quş qanadın eləyib özlərinə güllər hasar.

Sən bu qamətdə qədəm qoysan bağa əgər, o dəm
Qumrular tuba budağında tutarlarmı qərar?

Bu çəmənlikdə sənin lalə üzün dağsızdır,
Fəqət o lalələrin cümləsinin min dağı var.

O sənin fitnə gözün yer üzünün şəbnəmidir,
Belə bir ahu baxış görməmiş əsla rüzgar.

Yusifə yoxdu gözəllikdə bərabər bir vaxt,
Sən bu hüsnünlə edərsən nə qədər Yusifi xar.

Saibin təbi bu aləmdə çoxun heyran edib,
Mənanı dərk eləyənlər bunu etmiş iqrar.

* * *

Etməyib nə ay, nə ulduz, nə günəş dünyanı ağ,
Bir yığın insan sümüyü etdi bu zindanı ağ.

Sinədən ox tək çıxar ahlar, fəqət yox rəngi heç,
Vay o səyyada olar daim oxu, qurbanı ağ.

Yusifin şahlıq sarayın tərk qıldı Misridə,
Bir otaq saxlar ona Kənanda öz cananı ağ.

Qar kimi ağ namə istərlər qiyamət başlasa,
Faydası yoxdur qoyubsan süfrəyə sən nanı ağ.

Qeybətə açma ağız, pəhriz elə sən hər zaman,
Çox da ki, misvak ilə sən etmisən dəndanı ağ.

Şahlara sən ev tikirsən, öz evində yox çıraq,
Sadəlikdən can qoyub etdin fəqət divanı ağ.

Tinətin pak olsa, ölsən də yerə xeyrin dəyər,
Ud yanıb kül olsa da eylər külü hər yanı ağ.

Eşq yolundan yüksələn tozlar şəfəq dəryasıdır,
Zəncinin rəngin edib bir anda eşq meydanı ağ.

Bircə gündə, gör, necə dümağ olub sübhün saçı?
Ay da istər eyləyə axşam çölü, ormanı ağ.

Ay camallı nazəninlərlə dolubdur İsfahan,
Saib, onlar eyləyib başdan-başa İranı ağ.

* * *

Bizi məftun eləyə bilməyəcəkdir dünya,
Yusifi Misrin ayı salmadı çün sevdaya.

Elə möhkəm dayanıb torpağın üstə ayağım,
Qeyri-mümkündü məni sel apara dəryaya.

Varlı öldükdə min həsrətlə gedir dünyadan,
Çünki uymuşdu yazıq ömrü boyu xülyaya.

İndi o piri-xərabatdan əziz bir kəs yox,
Kim çağıra hamıdan tez gəlir o çünki haya.

Kaş bu sınmış gəmidən sahilə bir taxta çıxa,
Verə o xalqa xəbər ki, gəmimiz batdı suya.

Şirinin şəklini əmr etdi silinsin qayadan,
Xosrovun əmri ilə silmək olarmış guya?

Saib, ahəstə apar sən bu cahanda işini,
Qafil ol kəsdi şirin pəncəsində pəncə qoya!

* * *

Sinədən qalxan o ahlar dönər axırda ələmə,
Sahibi-meydan olar sahib olan dərdə, qəmə.

Qarabaxt olmağa layiq ola bilməz hər baş,
Bu taca layiq o kəsdir ki, vurulmuş qələmə.

Əfsus olsun ki, sınıq bir şişədir təkcə bədən,
Ciyərin qanı onu döndərəcək Cami-Cəmə.

Fələyin əmrinə kim boynun əyər, şad dolanar,
Fərmana boynun əyən hər kəsə acizdir, demə!

Kim ki, vurğundu ürəkdən, ona qeyrətli deyin,
Bu pərişan sinəmin dağları gəlməz rəqəmə.

Zamanın dalğaları, bil, səni divanə edər,
Dalğa ləngər daşıdır ancaq o sabit qədəmə.

Keşməkeşli bu həyatda qoru öz səbrini sən,
Ziyanın üçqat olar, anla, şikayət eləmə.

Dünyada qisməti nə olsa hüma şaddı buna,
Kölgəsin salsa kimin üstə dönər möhtərəmə.

Bülbülün fəryadı ondan ötərü qalxar ki,
Güllərin həsrəti ilə düşür hərdən sitəmə.

Məst olan öz qəmini nəğmə kimi ötsə əgər,
Bilməz o nəğmə zilə qalxdı, ya da düşdü bəmə.

Tufanı ram eləyər sinədəki eşqin odu,
Çün günəşdir uçuran şəbnəmi mülki-ədəmə.

Heç rəvadırmı ki, Saib, ürəyin Kəbəsini,
Bu xəyallar çevirə boş yerə beytülsənəmə.

* * *

Pərdədən çıxsa o hüsnün bu ürəklər qan olar,
Torpaq atlas geyinər xəncər əgər üryan olar.

Dünyaya od yayan o eşq də bir gün soyuyar,
Onda İbrahim üçün od da dönüb reyhan olar.

Aşiq ah çəksə əgər, yarı cəfakeşlik edər,
Necə ki, bülbül ötər, gülsə baxıb heyran olar.

Qoymaram eşqimi qət eyləyə bir gün də əcəl,
Çün saraldıqca tikan, dərmək onu asan olar.

Telinin sayəsi gizlətmiş onun gözlərini.
Zalimin xanəsi bir ləhzədə çün viran olar.

Meyə meyl eyləyərəm, mey də minər qiymətə hey,
Eyləyərəm tövbə o dəm, mey yenidən ərzan olar.

Eşq unutdurdu mənə eşqin o sonsuz qəmini,
Ədl ilə abad olar, hansı bina viran olar.

Məşrub haqda nə desən zahidə təsir eləməz?
Çirkin üz aynaya baxdıqca ürək nalan olar.

Şadlığı dünyanı tutmuşdu xərabət pirinin,
Göylər əlvan geyinər, dan yeri çün xəndan olar.

Kim paxıldan tikə alsa uda bilməz, bilirəm,
Vay halına o kəsin Tanrıya bir mehman olar.

Zalim əldən nə zaman düşdü özüylə vuruşar,
Çünki qurd dişsiz olar, öz qanına qəltan olar.

Sel axar dağda, düzənlikdə dönər batlağa bil,
Hər kəsi aldada nəfsi dönüb o şeytan olar.

İsfahanda yenidən Saib əgər şeir desə,
İsfahan onda iki Zindərudə meydan olar.

* * *

O hünər sahibləri köçdü cahandan, qalmadı,
Sərbəsər boşdur tamam indi gülüstan, qalmadı,

İldırım tək yandı, söndü fikri aydınlar hamı,
Bir ovuc gül də desən bu karivandan qalmadı.

Bircə qasid gəlmədi Kənana hətta Misridən,
Yəqubun ağlar gözündə yaş nədir, qan qalmadı.

Nəğməkar quşlar vətəndən uçdular qürbət elə,
Bu yuvada onlara artıq bir imkan qalmadı.

Cənnətə bənzər bu gülşəndə fəqət bayquş ötər,
Çünki soldu gül-çiçək, başlandı tufan, qalmadı.

Çox qələmdanda suya döndü mürəkkəblər tamam,
Nə qələm dindi, nə də dillərdə dastan qalmadı.

Saibin də qələmi susdu qələmdanda daha,
Çün sözə qiymət qoyan vaqif bir insan qalmadı.

* * *

Bu gözəl gün də keçər, dərd keçər, qəm də keçər,
Həyatın şadlığı da, hətta bu matəm də keçər.

Belə rahat yuxu da, mənasız ömrün günü də,
Səni heyran eləyən hər nə var aləmdə keçər.

Nə veribdir sıxılan qəlbimizə boş səhra?
Ürəyin nalələri zildə, ya da bəmdə keçər.

Bil ki, Ayla Günəşi əks eləmir eşq seli,
Paranın hökmü dinarla yenə dirhəmdə keçər.

Bir adam yoxdu ki, yansın belə qəlbin halına,
Bir dinarçın o başından, desən hər dəmdə keçər.

Sənin ol ləl ləbin əksini salmaz sulara,
Hökmüranlıq nədi ki, Hatəm ilə Cəm də keçər.

Bu necə gözdü ki, bir işvə ilə baxsa əgər,
Ahular qərq olar o işvəli aləmdə, keçər.

Saibin qəlbinə də təsir edər əhli-həsəd,
Aynaya dəysə nəfəs tar da olar, nəm də keçər.

* * *

Söz qanadlı quş kimidir, o uçar sinədə qalmaz,
Yusifi-Kənanı salsan sən əgər kəməndə, qalmaz!

Niyə hay salır o bülbül, niyə yırtır öz boğazın,
Gül əgər açılsa bir gün o daha çəməndə qalmaz.

Kamala çatanda övlad onu saxlamaq nahaqdır,
Qan əgər dönərsə mişgə o daha bədəndə qalmaz.

Qaça bilməz heç gözümdən, deyin o Süheylə bilsin.
Hər əqiq ki, ad çıxardı o yəqin Yəməndə qalmaz.

Sədəfi edibdi heyran yenə gövhərin kəlamı,
Söz əgər şişərsə gec-tez axır o dahanda qalmaz.

Hamı öz hayındadır, bax hamının gözü özündə,
Yusifinsə taleyindən danışıb dinən də qalmaz.

Sinəm od tutub yanırsa nəfəsim də oddu şəksiz,
Qara qarğa bağça-bağda, nə də ki, çəməndə qalmaz.

Qəribə danışdı, Saib, qərib oldu hər kəlamı,
Hamıya qərib deməzlər o əgər vətəndə qalmaz!

* * *

Sənə dünyaya nə zər, bil, nə də zivər qalacaq,
Hər nəyin vardı xəyal etmə sərasər qalacaq.

Bu gülüstan ki, ona baxmaq ilə məğrur idin,
Bir ovuc torpaq ilə bir də yellər qalacaq.

O şirin arzular ilə ürəyi şad elə sən,
Ancaq ümmid eləmə arzuların tər qalacaq.

Qəlbini bağlama dünyaya, səfər vaxtı çatar,
Gedəcəksən əli boş, sanma bu şeylər qalacaq.

Nə veribdirsə fələk cümləsini verməlisən,
Səndən, ey xacə, fəqət qalsa xeyir, şər qalacaq.

Eşq də tərk edəcək qəlbimizi birdəfəlik.
Elə bil tərk edəcək dəryanı gövhər, qalacaq.

Başının altına kərpic qoyacaqlar o zaman,
Evdə yüz pərqu balınc, üzləri mərmər qalacaq.

Bu cahan ayinədir, əks eləyibdir bizi o,
Sanma ki, ayna ilə əks bərabər qalacaq.

Gördüyün lalələrin yoxdu bu gülşəndə dağı,
Cigərin dağlanacaq, sənsiz o dilbər qalacaq.

İmkanın varsa əgər uçmağa səy et, Saib,
Tufana düşsə də ömrün, sözün əzbər qalacaq.

Vəfasızdan vəfa? Yox gözləmə, əsla!
Tikandan sən səfa? Yox, gözləmə, əsla!

Zəmanə pis keçəndə yüksələr nalən,
Sən hər neydən nəva? Yox, gözləmə, əsla!

Bu xalqdan kim uzaq olsa uzaq ondan,
Olardan aşina? Yox, gözləmə, əsla!

Otur məclisdə sən göylər kimi dinməz,
Ürəksiz kəsdə məna? Yox, gözləmə, əsla!

Danışmaq ya xətadır, ya səfa şəksiz,
Susarkan bir xəta? Yox, gözləmə, əsla!

Məhəbbət könlünün dərdin silər səssiz,
Sudan hər dəm səda? Yox, gözləmə, əsla!

Edər cəzb aşiqi məşuqə hüsnüylə,
Dəf eylər kəhrəba? Yox, gözləmə, əsla!

Sükut et sən də, Saib, çünki düşmənlər
Deyərmi mərhaba? Yox, gözləmə, əsla!

* * *

Zənn eyləmə əks eyləyər hər yer təranəni,
Münbit deyilsə torpaq əgər səpmə danəni.

Göyçək deyilsə çöhrən əgər, ayna neyləsin?
Etmə şikayətinlə günahkar zəmanəni.

Gül tək ikicə həftədi ömrün, hədər etmə,
Çox da bəzəmə zövq ilə sən aşiyanəni.

Dünyanın işi yas tutanın zülfünə bənzər,
Salma bu bəla girdabına sən də şanəni.

Şam tək gözünün yaşlarını tökmə hər axşam,
Bu ağlamağa tapmısan hardan bəhanəni.

Yüz xəznə dərdimə qiymət ola bilməz.
Verməm zərə bu solmuş üzü – aşiqanəni.

Qəm karvanının zərrəsidir ömürdə anlar,
Qəmsiz görürəm mən vəli hər an bu xanəni.

Divarə acıqdan dilini sürtsən əgər, sürt,
Tərk etməginən sən evini, bu viranəni.

Yusif kimi zindan ola hərgah ata yurdum,
Kim dərdi verib aldı fələkdən xəzanəni.

Azadəliyi xoşdur, kasıb olsa da Saib,
Girməz qəfəsə səpmə ora sən də danəni

Alimin söylədiyi söz məgər əfsanə olar?
Mey nə vaxt hasil olar azimi-meyxanə olar.

Adi sözlər qələmimdən kağız üstə tökülər,
Təzə paltar geyinər sanma ki, biganə olar.

Qəlbimin arzusunu məhv elədin eşqin ilə,
Bil ki, xırman dolusu toxma səbəb danə olar.

Şam geyər fanusu öz əyninə paltar yerinə,
Yenə şəmə alışan eşqilə pərvanə olar.

Bircə söz çıxsa yarın qönçə dodağından əgər,
O sözün qiyməti sərrafına dürdanə olar.

Qələmin gəzsə kağız üstə, inan, nərə çəkər,
Mərd əlində qələmin nərəsi mərdanə olar.

Sinəmin dağı bütün aləmi salmışdır oda,
Hansı kaşanə yana axırı viranə olar.

Nəfsini qoyma aşa həddini, çün körpə uşaq
Çıxsa evdən itəcək, hər yer ona xanə olar.

Sanma asan çıxarır qəvvas o dür danəsini,
Saibin sinəsi hər gövhər üçün şanə olar.

Ey könül qışlı, payızlı ruzigarı fikr elə,
Huşyar ol, tez solar ömrün baharı, fikr elə.

Bir nəsim əssə həyatın dəftərin alt-üst edər,
Bu vərəq tək çevrilən leylü-nəharı fikr elə.

Ay əgir öz başını, on dörd gecə olsun tamam,
Mey içib məst olmağın vardır, xumarı fikr elə.

Harda ki, şər iş olur, ordan çəkil tez bir yana,
Özgə fikrin olmasın, sən bu qərarı fikr elə.

Zəhrdir, bir də peşimançılıq cahanın işləri,
Xabi-rahət vaxtı boynunda o marı fikr elə.

Asiman tək bu cahanın da yox əvvəl-axırı,
Bu həyat da böylədir, yox etibarı, fikr elə.

Gül əgər gülşəndə gülsə axır o gülab olar,
Gülmə hər yerdə, gülüm, gülsən gə barı fikr elə.

Dam kənarında məgər rahat yatarmı bir nəfər,
Etibarsızdan umar kim etibarı, fikr elə.

Xəncər ağır oldumu ağır olar mütləq yaran,
Düşməni qüvvətlisə məzlum şikarı fikr elə.

Mığmığa axşam uçar, insan qanıyla bəslənər,
İndi sən zahid kimi mərdüm-azarı fikr elə.

Nəbzdən duymaq olur hər insanın əhvalını,
Üzməyə yox cürətin, onda kənarı fikr elə.

Kainat tüstüsüylə tozdan yoğrulub, Saib, düşün,
Tüstünü fikr etmə tək, həm də qübarı fikr elə.

* * *

Nə səbəbdəndir mənim qədrimi dövran bilməz?
Gövhərin qiymətini heç zaman ümman bilməz.

Üzdə aydın görünür hər nə desən ayna kimi,
Ürəyin yanmasa, bil, qədrini canan bilməz.

Harda divanə saçın tacə bərabər bilsə,
Orda şahla gədanın fərqini insan bilməz.

Pis ilə yaxşını ancaq düşünən baş ayırar,
Bu qəmə ağzıdı, ya camdı, o nadan bilməz.

Hakimin fikrini məşğul eləyər balla zəhər,
Qarpız ilə şəkərin fərqini sorsan, bilməz.

Qəlbə dərmandı yarın səf-səf olan müjganı,
Damarın dərdini nəştər kimi, dərman bilməz.

Sədəfin qoynuna düşmüş su dönüb gövhər olar,
Məqsədə çatmağı Saib bilər? Hardan bilməz.

* * *

Dünya dərdindən əgər kim ürəyin etsə uzaq,
Qəlbi eşq aləminin arzularıyla dolacaq.

Elə vaxt gəlsə ki, məstlər də durub rəqs edələr,
Təpik altında fələk tapdalanıb məhv olacaq.

İnanıb etimad etmə bəzənən üzlərə sən,
Bir xəzan yarpağı tək, bil ki, o üzlər solacaq.

Bir dəfə görmək ilə ayna necə qane olar?
Bizə haqq vermək üçün bir də dönüb aynaya bax.

Hüsnünə heyran olubdur, gəzə bilmir saqt,
Dolanır çərxi-fələk tək başına sanki otaq.

Fələyin arxasını torpağa qoymaq nədi ki,
Çoxunu xar eləyib qoynuna almış torpaq.

Vermə əldən, bu kasıblıq özü də bir nemətidir,
Ehtiyacdan görülən hər nahaq iş haqdır, haq.

Ulduz-ulduz göz olur xırdalanan vaxtda fələk,
Sanki gül üstə düşən şehdi, yanır parlayaraq.

Səy elə, Saib, ürək gün kimi olsun aydın,
Sel də səy ilə axır dəryaya çatsın ancaq.

* * *

Paxıl olsa xəsisin haləti lap bədtər olar,
Köhnələn bir düyünü açmaq özü məşhər olar.

Güdər öz izzətini kim ki, olar guşənişin,
Qətrə düşsə sədəfin qəlbinə, bil, gövhər olar.

Arzu çox olsa tamah da tez açar qol-qanadın,
Çör-çöpü atsan əgər şöləyə balu-pər olar.

Əyrilik bilməz o qəlb ki həmişə aydın ola,
Güzgünü aydın edən seyqəl olar, cövhər olar.

Dövlətə meyl eləmə, hər nə varın bəsdi sənə,
Neydə çox olsa şəkər, onda nəva kəmtər olar.

Üzünü tutma yana, hər qara baxtdan zülfün –
O qara görkəm ilə aşiqə də məzhər olar.

Mənim o yarımı Ay görsə üzə pərdə salar,
Haləsi dövrəsinə şölələnən səngər olar.

Elə sakitdi ürək, gər düşə eşq ümmanına,
Nəğməkar bülbülə hər kəlmə dönər şəkkər olar.

Hansı gülşəndə ki, Saib oxuyar tazə qəzəl,
Orda bülbül susar, hər kəlmə ona nəştər olar.

* * *

Heç görübsən birini çirkin üzə heyran ola?
Kor elə kordur, nə fərqi ev ola, meyan ola.

Ölümün qüdrəti çatmaz soyuda eşq odunu,
Bu mahal işdi, avam röya görə, loğman ola.

Dünyanın qibləsi eşqin evidir, eşqə inan.
Məskəni səhra ola, sahil ola, ümman ola.

Sil kədurət tozunu sən gözünün yaşı ilə,
Çün yağış yağsa yuyar, ya dağ ola, orman ola.

Ucalar göylərə fəryadı Züleyxanın o dəm,
Yusifin başının üstündə əgər böhtan ola.

Xəstə qəlbim sevinər, halımı sorsan, Saib,
Elə gəl başımın üstə, gəlişin dərman ola.

* * *

Bu fələk bir kimsədən əsla xəcalət çəkməyib,
Göy üzü heç vaxt tutulmaqdan əziyyət çəkməyib.

Divarın üstündə bitmişdir beli əyri tikan,
Ömrümün sərvi qalıb torpaqda qamət çəkməyib.

Hökmdarlıq ləzzətini hardan bilir Misrin şahı,
Bircə gün Yusif kimi ömründə qürbət çəkməyib.

Haq divanı sən güman etmə qiyamətdə olur,
Haqq-hesab burda olur, sözdü qiyamət, çəkməyib.

Kim meyi öz qaydasınca içsə, məst olsa belə,
Ya özü, ya özgəsi bundan əziyyət çəkməyib.

Fərhad öldürdü özün eşqində ortaq görcəyin,
Hansı aşiqdir ki, o, eşqində zillət çəkməyib?

Eylə bir əyyamdasan, Saib, səbrli olginan,
Kim səbrli olmuş o, heç vaxt məzəmmət çəkməyib.

* * *

Bu həyat çeşməsi o gül üzünün şəbnəmidir,
Zülfünün ətri yayılmış, elə ənbər kimidir.

O xumar göz bizi meydən də artıq məst eləyər,
Bir gözəl çöhrə də bir bağça çiçək aləmidir.

Alnının xətlərini yaxşı bilir xətt oxuyan,
Hər qırış ömrün itən illərinin bir şəmidir.

Nöqtədirmi ağ üzündə düzülən qara xal,
Yox o ki, ətir saçır canımızın məlhəmidir.

Əlinə, çöhrənə hər dəm toxunan sübh yeli,
Ümidin yelkənidir, arzum isə bir gəmidir.

Saçının bir ucu birçəkdə gəlib halqalanar,
Halqanın hər biri zülfündə bir aşiq qəmidir.

Bu həyat çay tək axır, öylə ki, qəddin əyilər,
Bu təzə ömrün üçün körpüyə dönmək dəmidir.

Saib, o gül yaxasında görünən düymə deyil,
Bülbülün şölə çəkən cəh-cəhidir, ya bəmidir.

* * *

Hər kimin fikri qəvi oldu, o hikmət tapdı,
Kim ki, söykəndi qara torpağa, qüvvət tapdı.

Kölgədə gəzmədi hər kəs əbədi oldu həyat,
Kim məhəbbətlə qapı açdı, o, hörmət tapdı.

Gözünü aç ki, təlatümlü dənizdir bu cahan,
Kim ki, yumdu gözünü, dəhridə zillət tapdı.

Hindi tərif edirəm, özgə xəyal eyləməyin,
Burda söz incilərim yaxşıca şöhrət tapdı.

Çün peşimanlıq odu sinəmə dağ basdı mənim,
Saib axtardığını lalədə əlbət tapdı.

* * *

Yüz heyif, keçdi zaman, gül kimi canan soldu,
Baharın fəsli ötüb gül də pərişan oldu.

O qara xal elə yandırdı ki, öz dairəsin,
Kim ona baxdı, inan, qəlbinə atəş saldı.

Kirpiyin kölgəsi incitdi yarın gül üzünü,
O bahar göyləri tək nərgizi gözlər doldu.

Bundan artıqmı olar qəm, bu elə bəsdi mənə,
Çün xarab olmuş evim sellər axan bir yoldu.

Faydası yoxdur məzarım başına lövhə vurub –
Yazallar ki, günahım yoxsa, savabım boldu.

Gər yada salma nahaq bir də cavanlıq dəmini,
İldırım tək çaxaraq göydə yanıb məhv oldu.

Sən mənə vədə verirsən, beləcə ömr keçir,
O gözəllik yolunun səmti de, sağdı, soldu?

Saibə birdi o yarın otağı, astanası
Etibarı yox isə sərv mənimçün koldu.

## QƏSİDƏLƏR

Səpibdir hər yana əxtər şükufə,
Edibdir yer üzün gövhər şükufə
Qopubmu Yusifin ağ köynəyindən?
Müəttərdir, müəttər hər şükufə
Elə bil yüz-yüz ağ şamlar alışmış,
Qara qəlbə olub rəhbər şükufə
Başında ağ çətir tutmuş gəlintək,
Dayanmış çöhrəsi əsmər şükufə.
Oyanmış röyadan cümlə ağaclar,
Deyir, sanki gəlib məhşər, şükufə.
Süleyman təxtinə çatmaq dilərmi,
Açıbdır göylərə şəhpər şükufə?
Budaqlar üstünə gövhər düzübmü?
Olubmu inciyə məhzər şükufə?
Necə ki, yolları qışda qar örtər,
Budaqda o qara bənzər şükufə.
Gümüş əndam nigara bənzəri var,
Bağa öz örpəyin örtər şükufə.
Bu ağ çalma gülü heyran edibdir,
Olubdur güllərə məhvər şükufə.
Gedib gül bağına sən şadlıq eylə,
Açıbdır, gör, necə dəftər, şükufə.
İpəkdən hüsnünə bir pərdə salmış,
Giribdir örtüyə dilbər şükufə.
Qoparıb çadırı bir yana atmış,
Axı boz çadırı neylər şükufə?
O ağ şamlar edər hər yanı aydın,
Gümüşdür, yoxsa ki, mərmər şükufə?
Elə bil süd axır mərmər sinədən,
Düşər torpağa hər dəm tər şükufə.
Buluddur gövdəsi sərvin deyirsən,
Büllurdan da gözəldir hər şükufə.
Özündəndir qələm də, ağ kağız da,
Çəkər öz hüsnünü əzbər şükufə.
Necə Məryəm Məsihanı böyütdü,
Qucaqda meyvələr bəslər şükufə.

Uşaq öz barmağından süd əmən tək,
Verər hər meyvəyə cövhər şükufə.
Nədəndir şirin olmuş, heç bilirsən?
İçibdir bəlkə də kövsər şükufə,
Civəni güzgüdə gördünmü, titrər?
Suda, bax, eyləcə titrər şükufə.
Gecədən feyz alar qəlbin o günlər,
Saçar çün ətrafa ənbər şükufə.
Gümüştək aləmi ağ rəngə tutmuş,
De, məhtabdır, gümüşdür, zər, şükufə?
Səhər də məhtabı görmək dilərsən,
Edibdir bağları zivər şükufə.
Xərabət piri tək bu tazə üzlə
Olubdur qəlblərə sərvər şükufə.
Dönübdür bağ yolu ağ kəhkəşana,
Tökülüb torpağa əxtər şükufə.
Ayağın altına qu tüklərindən
Sanırsan ki, sərib bəstər şükufə.
Səhərlər ulduzu kim gördü göydə?
Dönübdür ulduza yeksər şükufə.
Şərabı şişədən süz cama sən də,
Budaqdan hey düşür tər-tər şükufə.
Sanırsan ki, beşikdə İsa dindi,
Şaha xoş mədhlər söylər şükufə.
Şah Abbas naminə zər sikkə vurmuş,
Olubdur gör, necə zərgər şükufə.
Ədalət hökm edir dünya üzündə!
Küləklərdən tapıb qəhmər şükufə.
Müəttər eyləmiş güllər fəzanı,
Olub başdan-başa ənbər şükufə.
Sözün başın buraxma, bəsdi, Saib,
İpəkdir, ya da ki, məxmər şükufə.
Sözün şəkkər kimi şirin də olsa,
Zərərdir çox ola şəkkər şükufə.
Dua eylə ona bu gül bağında,
Dua eylər ona çün hər Şükufə.
Onun iqbalı daim aydın olsun,
Kama çatsın o pak gövhər şükufə.

* * *

Hüsnünə ayna tutan da olubdur heyranı,
Ola bu gözlərim o tərli çöhrə qurbanı.
O qara saçlarının, bir də ki, alləblərinin,
Tərifi gör, necə tutmuşdu bütün dünyanı.
Sən susanda elə bil sakit olur göylər də,
Başlayır yer üzünün sən güləndə tufanı.
Günəş heyrətdə qalıb səndəki bu cazibəyə,
Səndən ayrılmağa günəşin yoxdur imkanı.
Sanki püstə içi tək dünya düşübdür şəkərə,
Nə vaxt ki, püstə ləbin oldu şəkərin kanı,
O ipək saçlarına valeh olub sünbüllər,
Güllərin çöhrənə baxcaq pozulur sahmanı.
Qədəhi almış ələ gül üzündə şəbnəm tək,
O tərli çöhrə olur sanki gövhər ümmanı.
O əyri qaşları yağmur dolu üfüq kimidir,
O pünhan etdi fəqət qibleyi-müsəlmanı.
Elə ki hüsnünün əfsanəsi cahana düşüb,
Yusifin tərifinin bağlanıbdı dastanı.
O qara gözlərin zülmət gecənin bəxşişidir,
Odur ki, İsfahanın sürməsi olub fani.
Od üstə qalmaz üzərrik, onu nahaq gəzmə,
Od dəyər tərk eləyər şeh o gülü-xəndanı.
Əgər o bircə dəfə hüsnüdən niqabı ata,
Çölləri tərk eləyər Leylinin də karvanı.
O odlu çöhrəyə baxsa sönər gözün nuru,
Necə ki, atəş olan yerdə tər buxarlanı.
Həyadan ağ üzünə baxmağa üzüm gəlməz.
Kəbab edibdi məni o cəmali-nurani.
Gülə yaxınlıq edən qönçə tez güdaza gedər,
Çıxıb da seyr eləmə naz ilə gülüstanı.
Cəmalı Zöhrədi, nəqqaş ona baxa bilməz,
Gərəkdi fürsət edib rəsm edə o pünhani.
Piyalənin dibini töksə torpağın üstə
Yəqin ki rəqsə gələr onda torpağın qanı.
Kimə deyim sözümü, özgə bir kəsim yoxdur,

Deyə o yarə məni məhv edibdir hicranı.
Ya naz edə, ya qəzəb, naümid olan deyiləm,
Onun məhəbbətidir çünki canımın canı.
Onunla bitdi daha dilruba gözəllik də,
Onunla tərk elədi təxti-eşq-sultanı.
Cahana hakim olan ol vüqarlı Abbas şah,
Həmişə münsif edib öz eşqində imanı.
Necə əyər başını dərs alanda tüllablar,
Ona əyərdi başın kim olaydı mehmanı.
Günəş kimi yeri var fəxr edə fələk onla,
Tutardı hörmətini ölkənin hər insanı.
Ona itaət edər Zöhrə ilə Mərrix də,
İşarət etsə durar göylərin də cövlanı.
Acıqla baxsa sədəf qoynunu açar yarışa,
İnan ki, gövhər olar göylərin də leysanı.
Çəkibdi bəd əməlindən əlin bu çərxi fələk,
Dəyişmiş idi o öz hökmü ilə dövranı.
Qılıncı Qaf dağına vursa idi hiddətlə,
İki bölərdi yəqin şəmşiri o qalxanı.
Apardı torpağa bayquş xəraba həsrətini,
Bütün bu ölkədə bir ev viranə olmuş hanı.
Dua gəlir əlimizdən, ona dua eləyək,
Olubdu Saibin hər dərdinin o dərmanı.
Onun əlilə bu ölkə büründü al qumaşa,
“Çaharbağ” oldu gülüstan, o verdi fərmanı.

* * *

Dərya təbim şeirdə çün gövhərəfşan eyləyər,
Ağzını açmaz sədəf, dürrü o pünhan eyləyər.
Xızr tək hərdəm qələm zülmət mürəkkəbdən çıxar,
Ağ vərəqlər üstünü bir sünbülüstan eyləyər.
Leylinin karvanı tək səf-səf duranda beytlər,
Hər sözün bülbül kimi ahənglə əfqan eyləyər.
İlhamım məşşatə tək hər dəm sözə zinət vurar,
Sanki solmuş qönçəni o bir də əlvan eyləyər.
Bu nəfəs ki, məndə var hər bağçaya qoysam qədəm,

Şəbnəmi ahım odu ləli-dirəxşan eyləyər.
İlhamım səs salsa, bağban bağdakı bülbüllərə –
Qönçənin qoynun ömürlük qanlı zindan eyləyər.
Qarğalar tuti qanadıyla bəzər öz hüsnünü,
Harda ki, odlu qələm bir nəğmə dastan eyləyər.
Şerimin misraların qövsü-qüzeh eylər səma,
Gün mənim rəyimlə öz hüsnün numayan eyləyər.
Duzlu sözlərdir düşən hərdəm qələmdən dəftərə,
Məna süfrəm çün qələmdanı nəməkdan eyləyər.
Nil qədər məna axıtdı misra müddətdir qələm,
Yusifi-Kənan təbim hüsniylə tüğyan eyləyər.
Yazdığım mənaların bir zərrəsin tapsa, inan,
Təşnələr ol zərrəni bil, abi-heyvan eyləyər.
Nobaharda xatirinçün bircə gül açsa əgər
Sübh tək o qönçə gül dünyanı xəndan eyləyər.
Qızların qəlbi kimi nazik xəyalım var mənim,
Bağçama İsa dəmin hər anda ehsan eyləyər.
Təbimə göylər belə darlıq edər, yoxmu əlac,
Nə edərsə bil, mənə indi bu dövran eyləyər.
Gör, bu dövranın əlindən nə çəkir göydə günəş,
Yenə o öz nurunu dünyaya ehsan eyləyər.
Fitnəli göz sanma ki, sakit olur göylər kimi,
Heç inanma, susa da batində tüğyan eyləyər.
Bülbülün şaqraq səsi getməz qulağımdan mənim,
Sanma ki, qönçə mənimlə bəhsə imkan eyləyər.
Kim Zəfərxandan mənim tək sonsuz hörmət gördüsə,
Bir inamla şeirdə bu fikri elan eyləyər.
Yandırıb könlümdə o mehri-məhəbbət şəmini,
Bu məhəbbətlə, inan, hər dərdə dərman eyləyər.
Gül kimi ilhamı açsa pərdəni rüxsardan,
Şübhə yox Xaqaninin şerilə heyran eyləyər.
Çün səxavətlə bütün dünyada məşhur olmuş o,
Bir qərib insan görər, hörmətlə mehman eyləyər.
Al şəfəqlərdən qılınc vermiş ona dövran özü,
Bircə hökmüylə şehi bağda o bağban eyləyər.
Hökmü gəzdikcə nəsim tək yer üzün başdan-başa
Kimdə bu cürət olar zülfü pərişan eyləyər.

Sübh onun hökmüylə ağ geydirdi bir-bir şamlara,
Bu səbəbdən göy üzün şamlar çırağban eyləyər.
Ey ağam, gör ki, nə vaxtdır düşmüşəm səndən uzaq,
Bu uzaqlıq Saibin qəlbin, inan, qan eyləyər.
Cəm olub cümlə müqəddəslər, tez ol dil aç, qələm,
Biriya insana insan can da qurban eyləyər.
Sən uzat hümmət əlin, şahim, nəvasız bülbülə,
Gör, necə söz mülkünü şerim gülüstan eyləyər.
Sən könüllərdə nə vaxtdır ki, nigəhban olmusan,
Harda olsan həq səni xalqa nigəhban eyləyər.

* * *

Bəzəyib çalmasını öndə hökmdar gedər,
Düşüb ardınca onun xalq da ki, naçar gedər.
Çox təəccüb, küçələrdə niyə qan axmır axı?
Xalq avamdır qabağın kəssə də divar, gedər.
Dövranın gərdişi məzlum eləyib xalqı tamam,
Yox geri dönməsinə əldə ixtiyar, gedər.
Daşda qalmış ləpiri bəzi ağır gövdələrin,
Qəzəb ilə doldurur sanki bir anbar gedər.
İy çəkiblər bu gönü qalın adamlar elə bil,
Mişk üçün çəksə əgər min cürə azar, gedər
O, qarışqa boğazından çıxarar qılçığı da,
Muncuq üçün ilanın ağzına aşkar gedər.
Hər zaman yoxlamağa getməyir o xəstələri,
Sağalıb durmasına bilsə ümid var, gedər.
Ayağı altına baxmaz o təkəbbürdən, inan,
Güldən ötrü dalasa əllərini xar gedər.
Bir nəhəng tək sinədə hiddəti tüğyan eləsə
Yüz gəmi udmağa ümmanda o qəddar gedər.
Desələr ki, şirin ağzında qızıl vardır əgər,
Tamahından o, şirin ağzına oynar, gedər.
Sındırar başını öz məqsədinə çatmaq üçün,
Əyri yolla desələr gizli, ya aşkar gedər.
Onun addım səsini kim eşidə kar olacaq,
Sanki daşlıqdadı o, yolda nahəmvar gedər.

Deyəsən məsti-xumardır elə ləngər vurur hey,
Mığmığa sancsa onu, onda çəkər can, gedər.
Bir ayağı yəhərə yetsə, gedər qəbrə biri,
Mərkəzin dövrəsinə sanki o pərgar gedər.
O adamlar ki, canın qoydu fəqət zinət üçün,
Bilmədi qəlp çıxana yoxdu xiridar, gedər.
Saib, onlar ki, şikəst olmuş əgər bəxtindən,
Görə bilmir ucalıb qarşıda divar, gedər.

## TƏKBEYTLƏR

* * *

Nərgiz kimi ol gözlərə inanma, amandır,
Məzlum görünən zalimin hər zülmü yamandır.

* * *

Abrunu tökmə hədər, böylə misal var, deyəsən;
Qurumuş arxa ümid var ki, gələr su təzədən.

* * *

Ehtiyatla bax o yatmış gözəlin gözlərinə,
Vay o dəmdən ayılıb baxsın o gözlər də sənə.

* * *

Yoxsulluğun əlindən təzə xilas olan kəs,
Təəccübdür, yoxsula necə laqeyd baxır bəs?

* * *

Elə ağır keçir illər əyilibdir belimiz.
Yola saldıqda ili bayram edir illərimiz.

* * *

Gülmə, ey gənc bu ağarmış saçımın mənası var,
Bil ki, bu dünyada hər dağ başına yağmır o qar.

* * *

Nə qədər zülm eləyirsə, düzü bu dünya bizə,
Onu tərk et, deyə hökm etməyirik qəlbimizə.

* * *

Zülfü afət, teli fitnə, o qara xalı bəla,
Vay o gündən ki, bu kafirlər hələ əlbir ola.

* * *

Yoxsulun eyninə gəlməz qocalıq dərdi, inan,
Dərd odur ki, diş ola, amma çörək tapmayasan.

* * *

Zahidi qoyma qədəm basmağa meyxanəyə sən,
Meyi, meyxanəni təhqir eləyirsən niyə, sən?

* * *

Sevgidən xali olan baş bədənə yükdür, inan,
Kuzə boş oldu onu almaz ələ arif olan.

* * *

Doğru söz ox kimidir, düz dəyəcəkdir nişana,
Oğul istər kişitək tab gətirə bilsin ona.

* * *

Söz uzandıqca azaldar özünün qiymətini,
Hər kəsi mədh eləyən tez salar öz hörmətini.

* * *

Dinləyən arif olarsa natiqə ilham verər,
Qönçə sakit durmasa bülbül fəğan eylər məgər?

* * *

Sözün mənasındadır söz deyənin qüdrəti,
Çün ətrindən bəllənər hər gülün lətafəti.

* * *

Söz çıxıb dağ başına, qələmin dili haça,
Qəlbim qələmə döndü, mən bir söz ovlayınca.

* * *

Kağız üstə hər kəsin inildəsə qələmi,
Bil ki, qələm tutanın başından aşıb qəmi.

* * *

Hövsələsiz adamla səfər etmə heç zaman,
Şar kimi partlayacaq adicə bir təmasdan.

* * *

Kimə qayğı edirəm, qayğı dönür dərd olur,
Müşkülünü açdığım boynuma kəmənd olur.

* * *

Güllərin rəngini sormaqla əzab vermə ona,
Hansı bülbül ki, qəfəsdə göz açıbdır cahana.

* * *

Kim paxıllıq tozunu silsə ürəyindən əgər,
Gözlərində yer üzü tazə gülüstana dönər.

* * *

Kim ağlının gözüylə bu dünyanı seyr edər,
Torpağın altında da rahat yatıb dincələr.

* * *

Qürbətə bağlama bel, tərk eləmə tez vətəni,
Hər quşun öz yuvası, hər kişinin öz vətəni.

# QÖVSİ TƏBRİZİ

*Əlican Qövsi Təbrizi XVII əsrin məşhur Azərbaycan şairi, Füzuli ədəbi məktəbinin ən tanınmış nümayəndələrindəndir.*

*Bizə gəlib çatmış əsərləri hələlik lirik şeirlər toplusu – "Divan"ından ibarətdir. Ədəbiyyat tarixində "Qövsi" təxəllüsü ilə şeirlər yazmış üç şairə rast gəlirik, Akademik Həmid Araslıya görə onların hər üçü şairə bir nəsildən olub baba, ata və nəvədirlər. Azərbaycan dilində "Divan"ı bizə gəlib çatan şair – Əlican Qövsi Təbrizi XVII əsrin əvvəllərində Təbriz şəhərində sənətkar ailəsində dünyaya gəlib.*

*Xalq ədəbiyyatının, M. Füzuli, Ə. Nəvai şerinin ən gözəl ənənələrindən qidalanan Q. Təbrizi yaradıcılığında dövrünün ictimai ədalətsizliyini tənqid edir, vətənpərvər şair kimi çıxış edir, tez-tez uzaq düşdüyü doğma Təbriz şəhərinin adını çəkir. Heca vəznində, xalq şeri üslubundan da şeirlər yazmışdır.*

## QƏZƏLLƏR

Kimi can etdi, kimi könlünü dildarə fəda,
Bilmənəm mən ki, yoxumdur, nə edim yarə fəda?

Abi-yaqut deyil əşki-rəvanım, mən onu
Nə üz ilən edim ol ləli-göhərbarə fəda.

Bu səbəbdən ki, sənin çeşmüvə bir nisbəti var,
Eylərəm nəqdi-həyatım dili-bimarə fəda.

Hər gülün başına dönmək nə həvəsdir, bülbül!
Aşiq oldur ki, özün eyləyə bir yarə fəda.

Eylər azadələrin adını aləmdə bülənd.
Sərv edərsə özün ol şiveyi-rəftarə fəda.

Onun üçün sevirəm mən dili-sədparəmi kim,
Çeşmi-bimarivə hər gün ola bir parə fəda.

Dili-pürxunimi hədrəm basaram bağrıma kim,
Ola bir gün ki, ola saqiyi-xunxarə fəda.

Yıxmağa, yapmağa layiq deyil, ol viran kim,
Dəmbədəm gənci-göhər etməyə memarə fəda.

Bilmə kim, görürəm tabü təbin xurşidin,
Zərrə-zərrə olur ol şöliyi-rüxsarə fəda.

Söz bilənlər arasında ələm olmaz, Qövsi,
Etməyən xamə tək öz yaşını göftarə fəda.

* * *

İstərəm peyvəstə, ey rəna dolanım başına,
Qoygilən əldən inanım, ta dolanım başına.

İstərəm kim, gah qurban, gah bəlagərdan olam,
Gah, ey sərvi-səhi-bala, dolanım başına.

Hanı ol bəxtrəsa kim, kakili-müşkin kimi,
Ya öpüm hərdəm ayağın, ya dolanım başına.

Dutgilan bir yerdə sən, ey mərkəzi-təmkin, qərar,
Ha dönüm pərgar tək, mən ha dolanım başına.

Çox yamandır etimad etmək bu gündən danlaya,
Ta həyatım var durum hala dolanım başına.

Ta ayaqdan salmamış saqi kimi səhba məni,
Saqinin yadilə, ey mina, dolanım başına.

Şəmtək gər tərü pudum yandırırsan razıyam,
Bir zaman pərvanə tək amma dolanım başına.

Ömrlərdir itmişəm, mən bilmənəm kim, handayam,
Heç məni gördünmü, ey ənqa, dolanım başına.

Bir-birinin halını sormaq gərək divanələr,
Ver xəbər Qövsidən ey səhra, dolanım başına.

* * *

Dostlar, könlüm diyarın etdi viran iztirab,
Eylədi övraqi-tərkibim pərişan iztirab.

Hər kimi kim yandırar atəş, yanar ondan betər,
Neyləsin gər etməsin ol bərqi-cövlan iztirab.

Qətrə gər dərya üçün bitab olur məzurdur,
Bilmənəm neçün qılır dəryayi-ümman iztirab?

Mən deməm kim durgilən axşamatək, ya sübhətək,
Belə amma etmə ey sərvi-xuraman iztirab.

Nəqdi-can hər vəqt ola axır sənə təslim olur,
Eyləmə qətlimdə çox, ey namüsəlman, iztirab.

Eşq tək getməkdə sübhi-vəsl biaram olur,
Seyl tək gəlməkdə eylər şami-hicran iztirab.

Hər biri bir rəngilə Qövsi fəğan kim, qıldılar,
Könlümü ab intizarü bağrımı qan iztirab.

* * *

Canə etdim dərdi-dil zəbtindən, ey dildar, eşit!
Əndəlibin sərgüzəştin, ey güli-bixar, eşit!

Yox dilim yalvarmağa əzbəs xumar aludəyəm,
Əl-ayağın sədqəsi, ey saqiyi-xunxar, eşit!

Bağrımı qan etdi qəm, ey yari-səngindil, inan
Canımı yandırdı hicr, ey atəşin rüxsar, eşit!

Rəhm qıl eşq əhlinə, kəs bülhəvəsdən rəğbətin,
Gər eşitməzsən onu bari bunu, ey yar, eşit!

Sağərü səhbayə, zalım, ömrüləridir təşnəyəm,
Bir zaman əglən, sözüm, ey əbri-gövhərbar, eşit!

Öldürərsən çünki sən axır məni bidad ilə
Bir nəfəs zinharim, ey xunxari-bizinhar, eşit!

Çün bu dərdə öz-özün, Qövsi, salıbsan mən kimi,
Hər təbibin acı-acı pəndin, ey bimar, eşit!

* * *

Gətir saqi şərabi-nab, mütrib sazını saz et!
Çəkib bir naləyi bülbülləri dörd yandan avaz et!

Mənə bülbül kimi hər gül budağı dilnişin olmaz,
Əgər bir belə sərvin var isə, ey bağıban naz et!

Dilim dutduqca əfqan eylədim, fəryadına yetdim,
Nəfəsdən düşdüm axır sən həm, ey bifikr, dəmsaz et!

Əgər aşiq gözündən öz camalın görmək istərsən
Mənim ayinəmi, ey səngdil, zinhar pərvaz et!

Gözün hərçənd sahirdir, həbibim, dilrübalıqda,
Dəmi-canbəxş ilə göftarə gəl, ol sehri ecaz et!

İtirmə əl-ayağın, ey nigahi, əcz Tanrıyçün,
Ona əhvalımı ərz eylə, amma çox sözü az et!

Vəfavü mehr ilə, ey sərvqəd, xublar arasında
Özün mümtaz olub, üşşaqara Qövsini mümtaz et!

* * *

Tünük zərfəm, məni saqi əlindən gəlsə hüşyar et,
Əgər ehmal edirsən bəs xəbərdar ol, xəbərdar et!

Mənə çox rüxsəti-göftar ol şirin zəban verməz,
Ona razi-dilim, ey xamə, bir nəgilə izhar et!

Bu halilən şəbi-hicranda, birəhm, almadın canım,
Məni məndən alıb, yarəb, mənimlə yarimi yar et!

Təbibimdən dəva umdum ayağın çəkdi başımdan,
Ona sən dərd bidərmanimi ey zəf izhar et!

Söz ilə nazəninlər eşq dərdinə inanmazlar,
Bu dilbilməzləri, yarəb, giriftar et, xəbərdar et!

Sənin fəryadına on səngdil verməz qulaq, amma
Ona əhvalımı ey ney, dilin tutduqca təkrar et!

Gəl ol xurşiddən çeşmim sarayın rövşən istərsən,
Fələk məhdində bəxtim kovkəbin, ey nalə, bidar et!

Sənin çün ağzını qəndi-mükərrər eyləməz şirin,
Həmən Qövsi nihan eldən onun adını təkrar et!

* * *

Gəlir bahar, açılır gül, həzar edər fəryad,
Bu əndəlib xəzanü bahar edər fəryad.

Fəğan ki, halimə o daş bağırlı rəhm etməz,
Əgərçi naləm ilə kuhisar edər fəryad.

Özü salır özün oddan-oda səpənd kimi,
Zəbani-halilə hər kim şüar edər fəryad.

Bu hərc-mərcdə heç bilmirəm nə qovğadır –
Ki, məst nalə qılır, huşiyar edər fəryad.

Bə eynə öylə ki, oddan səpənd nalə çəkər,
Səni görən kimi biixtiyar edər fəryad.

Nə növ kim, dağıdır tünd bad xarü xəsi,
Biyani-hövsələmi tarimar edər fəryad.

Cərəs kimi yığaram gərçi nalədən dilimi,
Yüz ol qədər bu dili-biqərar edər fəryad.

Kimin muradı ilə bəs fələk dönər, yarəb –
Ki, gərdişindən onun kim ki, var, edər.

Sipehri-çərxə düşər girdibad tək Qövsi,
Nə sərzəmində ki, bir biqərar edər fəryad.

* * *

Könüldə qönçələnir cahan-cahan fəryad,
Dilim bu vəchdən eylər zaman-zaman fəryad.

Çəməndən ötdümü ol şaxi-gül təğafül ilə –
Ki, əndəlib bu gün başlamış yaman fəryad.

Boyun bəlasın alım böylə sərgiran keçmə,
Əgər gəlir sənə uşşaqidən giran fəryad.

Yarar fələk ciyərin Bisütuni tişə kimi,
Edəndən aşiqi-məzlumü natəvan fəryad.

Cahan-cahan aləmindən, cahan-cahan əfğan,
Zaman-zaman sitəmindən, zaman-zaman fəryad.

Yetincə bülbülə növbət bahari-ömr keçər
Əgər mən eyləsəm, ey şaxi-ərğivan fəryad.

Nə yerdə kim mən olam, hacəti-dəlil deyil –
Ki, əndəlib yuvasın verər nişan fəryad.

Səda əgərçi dolu camidən bülənd olmaz,
Vüsal edər məni ləbrizi-ələman fəryad.

Bu ahu nalə məgər bisəbəbmidir, yarəb –
Ki, bəzmi-vəslidə həm eylirəm haman fəryad.

Bahar fəsli ünü sövti-rəd sanmagilən –
Ki, naləm ilə mənim eylər asiman fəryad.

Kimin muradı ilə bəs fələk dönər yarəb –
Ki, gərdişindən edər yaxşıvü yaman fəryad.

* * *

Mənə cahanı qara eyləmiş süpehri-kəbud.
Görün-görün ki, nə od yandırır bu odsuz dud.

Könül binasını yarəb, süpehr yıxmışmı –
Ki, ah sinəm evindən gəlir ğübaralud.

Ona nə rəng ilə əhvalım eyləyim rövşən –
Ki, yandırır məni bir od nə şölə var, nə dud.

Könül sorağını kuyində almışam vəh kim,
Yaman uzağa düşübdür bu Kəbeyi-məqsud.

Nə eybin olsa onu eşq edər hünər, zahid
Vəli bu qapıda mərd olmayan olur mərdud.

Əsərdə eşq sözü əqlə oxşamaz, Qövsi,
Bu odlu naleyi-ney yüz təraneyi-Davud.

* * *

Əvvəl ləbin şərab verib, sonra qan tutar,
Bu düz əgərçi gec tutar, amma yaman tutar.

Daği-cünun yapışmadı könlünə zahidin,
Bu möhrü gər qara daşa bassan nişan tutar.

Hər söz ki, arizindən onun eyləsən rəqəm,
Xurşid misrəi kimi axır cahan tutar.

Ol kuyə, ya behiştə könül bağlamaq gərək,
Bir quş iki çəməndə haçan aşiyan tutar.

Yekdir ki, şişəyə tuta qanını bülbülün,
Hər qönçənin gülabını ta bağiban tutar.

Təsxiri-zülfi-yari səbadən dilər könül,
Oxşar ona ki, özgə əlilə ilan tutar.

Təbriz cəzbəsi yaxamı tutmuş aparır,
Qövsi, əgərçi damənimi İsfahan tutar.

* * *

Nə sərkəş şölədir bu vəh, bu nə qəddü nə qamətdir,
Qiyamətlər qiyamindən qiyam etmiş qiyamətdir.

Nə kakildir ki, ənbərsiz olub badi-səba ondan,
Cahan həm ol səba feyzilə rəşki-bağicənnətdir.

Fələkdə öylə üzmüş mehrü mahin rövnəqin hüsnün –
Ki, yulduzlar bu üzdən hər biri bir çeşmi-heyrətdir.

Gözü qaşın əgər islamü küfri etməmiş yeksan,
Bu nə meyxanədir, bəs ol nə mehrabi-imamətdir.

Nə rəngamizdir yarəb, bahari-xətti-səbzin kim,
Gülüstanlar onun dövründə rəngamizi-xiclətdir.

Kəlami-möcüzəncami-ləbi-şirin kəlamindən,
Doludur şurilə dünyavü ləbrizi-həlavətdir.

Bilibdir ta cəmalın mənisin, ey səbzeyi-gülgun,
Nə surət ki, musəvir nəqş edər məşqi-xəcalətdir.

Çəməndən pərtövü rüxsar ilə yarəb, sən ötdün kim,
Gülü şəbnəm, bəeynə, çeşmi-heyrət, əşki-həsrətdir.

Gəlir sağü solunda hurivəşlər ol mələk, Qövsi,
Nə ölmüşsən, dur ey bidərd, gör kim nə qiyamətdir.

* * *

Kim ki, bu aləmdə ömrün sərf edib yar axtarır,
Gənci-gövhər dağıdıb viranədə mar axtarır.

Bəs ki, verməz yuxu göz açmağa firsət kimsəyə,
Sübh gün şəmilə hər gün çeşmi-bidar axtarır.

Çıxmadı Məcnun gedəndən sonra bir şeyda səsi,
Ömrülərdir kim, təbibi-eşq bimar axtarır.

Bəs ki, xətt ol kövkəbi-hüsnün günün etmiş qara,
Zülfi-rüxsari-çırağilə giriftar axtarır.

Pərdeyi-dam eyləmiş zahid ridasin xəlq üçün,
Qapılarda səbhə fali birlə zünnar axtarır.

Yox, dəxi könlüm mənim meyxanəyə mayil deyil,
Kim gəzib ev-ev xərabat içrə huşyar axtarır.

Damənindən əl, ayaqdan düşməyilə çəkmənəm.
Könlüm ol ayişə ruyi-ta nəfəs var axtarır.

Başı əzbəs kim, bizim çöllərdə dəymiş daşlara,
Seyl fəryad eyləyib damani-kühsar axtarır.

Özgə rövnəq var Qövsi, hüsn bazarında kim,
Bir məta onda iki aləm xridar axtarır.

* * *

Qönçeyi-gül ta gülüstanın çırağın yandırır,
Əndəlibin pərdeyi-çeşmində yağın yandırır.

Yanaram ah etməsəm, gər ah çəksəm, ah kim,
Bülbüli-biçarənin bağü budağın yandırır.

Eyləmişdir şami-hicran sinəmi zülmətsəra,
Bu səbəddən onda canan şəm dağın yandırır.

Eşq əhli aşiq istər cümleyi-əhbabını –
Kim, səməndər mizəban olsa qonağın yandırır.

Gərmdir əzbəs nigahım yandırır göz pərdəsin,
Vəh nə səhbadır bu səhba kim, əyağın yandırır.

Yandırır ol atəş ilə xanimanın aqibət,
Hər kimin gərduni-dunpərvər ocağın yandırır.

Ol güliçün bağiban nazin çəkər hər xardən,
Nikhəti-gül gərçi Qövsinin dimağın yandırır.

* * *

Gərçi hər aşiqə hicran qatı müşkül görünür,
Mənə bir ləhzə fərağın neçə min il görünür.

Mən düşən vadiyə basman[1] qədəm ey aşiqlər –
Ki, bu çöllərdə nə Məcnun və nə mühmil görünür.

Şirlər pəncə salır vadiyi-xunxarində,
Eşq əgər biciyərü bixudü bidil görünür.

Cəzbeyi-aşiqə əğyar ola bilməz mane,
Xarü xəs atəşi-suzanə nə hayil görünür?

Savurar külləri öz başına pərvanə üçün,
Şəm zahirdə əgər sərkəşü qafil görünür.

Özgə taətlərə oxşatma mənim taətimi –
Ki, mənə müttəsil ol Kəbə müqabil görünür.

Vəsl bəzmində ki, əğyar ola əngəl Qövsi,
Hər ili bir dəmü, hər saəti bir il görünür.

---

[1] Basmayın

* * *

Onunçün mən sənə yalvarmanam kim, yalvaran çoxdur,
Mənim könlüm alan yoxdur, sənə könlün verən çoxdur.

Məni dilxəstəni həm sədqəsi çox, sorgilən halın,
Səninçin nərgisi-bimarin əhvalın soran çoxdur.

Dili-sədparəmi sən algilən, ey namüsəlman kim,
Bu gün ol laleyi-sədbərgi dörd yandan dərən çoxdur.

Gözüm nöqsani-naz olmaz, sual et hali-zarım kim,
Mənim dərdim bilən yoxdur, sənə gər bildirən çoxdur.

Qaçan fürsət verir nazi-təğafül dərdi-hicranə,
Bəli əhya verən azdır və gör nə öldürən çoxdur.

Uzaqdır yol, gərəkdirləngüləngin başa aparmaq,
Və gər nə öz səməndin bir havur yortub-yoran çoxdur.

Qənimətdir kimin kim, dideyi-mənisi rövşəndir,
Və gər nə çeşmi-surətbin ilə Qövsi görən çoxdur.

* * *

Daşə salmaq rəxnələr ol növki-müjgandan gəlir,
Yüz qılıncdan gəlməz onlar kim, bu peykandan gəlir.

Ver xəbər könlündən, ey mütrib nişanın var isə –
Kim, gəlir bir nalə, amma bilmənəm qandan gəlir.

Sala bilməzsən təzəlzül aləmə, ey sərv sən,
Gər bu işlər gəlsə ol sərvi-xuramandan gəlir.

Yandırır ol şöleyi-rüxsar hicrandan betər,
Dərddən gəlməz mənə onlar ki, dərmandan gəlir.

Sən meyi-gülrəng tut saqi, dolanım başına,
Hər qədər kim, cami-pürxun dövri dövrandan gəlir.

Xar tutma, gövhəri-əşkim götür torpaqdan –
Kim, onun hər qətrəsi dəryayi-ümmandan gəlir.

Gərçi könlüm sinədə bir qətrə qan, artıq deyil,
Müttəsil seylablar Qövsi, bu virandan gəlir.

* * *

Bu rəng mənim bağrım əgər qan olacaqdır,
Aləm qamu bir qitə gülüstan olacaqdır.

Ey şaxi-gül ol qaməti-mövzun həvəsindən,
Çox sərv bu gülşəndə xuraman olacaqdır.

Göz yaşına yüz vermişəm, amma bilirəm kim,
Ol seyl ilə könlüm evi viran olacaqdır.

Sən oxların ey nalə yığıb saxla ki, bir gün,
Sinəm hədəfi-navəki-müjgan olacaqdır.

Ölməm dəxi, ey nəqdi-həyatım, ölür olsam –
Kim, ruhi-rəvanım sənə qurban olacaqdır.

Sərf etdi ciyər qanını israf ilə çeşmim,
Bilməz ki, bugün-danla pərişan olacaqdır.

Əz bəs ki, bahar ayini saqi gözüm istər,
Ol günlər olunca ciyərim qan olacaqdır.

Yüz siğəyilə tövbə verir özgəyə zahid,
Amma özü min qatla peşiman olacaqdır.

Hicran gecəsi gəldi ki, hər qətreyi-əşkim,
Pərvanələrə şəmi-şəbistan olacaqdır.

Qövsini unutma ki, sənin qaşın ucundan,
Hər misrəi bir mətləi-divan olacaqdır.

* * *

Əgər min dağ yandırsam könül bir ayrı dağ istər,
Gəda gər sərbəsər aləm çırağandır, çırağ istər.

Gözüm görməz həyadan, vəsl üçün amma könül titrər,
Bəladir böylə sərxoş kim, əli tutmaz, ayağ istər.

Məhəbbət olsa təklifü təvaze olmaz olmasın,
Üzündən bəllidir hər mizəbanın kim qonaq istər.

Mənə gülkəşt təklifin elərlər dərd bilməzlər,
Nə bilsinlər bunu kim, nikhəti-gül həm dəmağ istər.

Məni divanəyə eşq içrə hər bidərdi bənzətmin –
Ki, məcnun vüsəti-səhra sorar, Fərhad dağ istər.

Şəbi-hicran qaradır əxtəri-bəxtim kimi, amma
Xəyalın pərtövündən mehrü məh məndən çırağ istər.

Gözü surət görən, mənidən agah olmayan qafil
Əgər vəsl istəsə, bir korə bənzər kimi, çırağ istər.

Nəsimi-sübhdən hər gün səri-kuyin sorar Qövsi,
Bu qafil öz evinin həm yolun bilməz, sorağ istər.

* * *

Mən istəmənəm dərdimi cananə desinlər,
Əhvalımı ol zülfi-pərişanə desinlər.

Ol Leyliyə qurban oluram mən təhi-dildən,
Qoy bir neçə bitəh mənə divanə desinlər.

Pərvanə yaxar var-yoxunu bir oda yetsə,
Razı deyiləm kim, mənə pərvanə desinlər.

Onlar ki, deyirlər bu nə fəryadü fəğandır,
Barı bu sözü ol güli-xəndanə desinlər.

Dilər tökərəm bülbülü pərvanəyə Qövsi,
Ta bir gün olar halımı cananə desinlər.

* * *

Dilim fəğaniləvü didə qan ilən doludur,
Könül səhifəsi şərhü bəyan ilən doludur.

Vurubdur ağzına min qifli-ahənin qeyrət,
Hənuz səqfi-fələk əl-əman ilən doludur.

Haray kim, nə dilim var, nə bir dil anlayanım,
Əgərçi ney kimi cismim fəğan ilən doludur.

Əgərçi könlümə zahirdə dəymək asandır,
Bu çöl kəmingəhi şirin-jiyan ilən doludur.

Sınıq səbudə su tutmaz qərar, mey durmaz,
Şikəstə könlümə məhvəm ki, qan ilən doludur.

Xumarilən məni öldürdü saqiyi-birəhm,
Səbuyi-badeyi-gülrəng can ilən doludur.

Bu bir piyalədə yarəb, nə sehr edib saqi –
Ki, üstü badə ilən, altı qan ilən doludur.

Sən öz yamanlarını yaxşı et, nə hasil kim,
Zəmanə yaxşı ilən, ya yaman ilən doludur.

Bəsirət əhli dəlil istəməz ki, kövnü məkan
Nişan ilən doludur, binişan ilən doludur.

Yuvada qönçələnir əndəlib bəs ki, çəmən,
Nəvayi-Qövsiyi-atəşzəban ilən doludur.

* * *

Ləli-nabin bilmənəm ruhi-rəvandır, ya nədir?
Sərv qəddin məddi-ömri-cavidandır, ya nədir?

Bilmənəm, ey səbzi-təhgülgun mənə mənzur olan,
Qaşü gözdür, ya ləbi-şəkkərfəşandır, ya nədir?

Xəlq derlər var dəhan ilə miyanın, söylə kim,
Əsli vardır, doğrumu sözdür, yalandır, ya nədir?

Piçü tabə bir nəhani nüktə salmış aləmi,
Hiç kim bilməz kim ol, muyi-miyandır, ya nədir?

Bağrımı bir qan edən vardır, deyil məlum kim,
Sən özünsən, ya sözündür, ya dəhandır, ya nədir?

Var bir bidad edən üşşaqə, amma bilmənəm,
Bəxtdir, ya çərx, ya dövri-zəmandır, ya nədir?

Mur tək hərçənd öldürmək məni asan olur,
Axır ey bidadgər ol dəxi qandır, ya nədir?

Keçdi ömrüm bu çəməndə açmadım göz ta biləm –
Kim bahar əyyami, ya fəsli-xəzandır, ya nədir?

Yaxşılar birlə yaman başlarsan ey naz afərin,
Heç deməzsən kim, bu yaxşıdır, yamandır, ya nədir?

Söylə Qövsi kim, nə verdin ala bilməzsən ona?
Sənədən ol bibak alan bir nəqdi-candır, ya nədir?

* * *

Fəğan ki, söz deməyə doğru sözlü yar azdır,
Şəbi-siyah çoxu şəmi-şami-tar azdır.

Bu qəm ki, var mənim cani-natəvanimdə,
Tamami xəlq mənə olsa qəmküsar azdır.

Giriz çağı süpahi-bəlavü möhnətdən,
Ümid bağlamalı, arxalı hasar azdır.

Hüzur qədri bilən əndəlibdən sor kim,
Xəzan bir-iki nəfəs çox, yüz il bahar azdır.

Bulunsa yari-vəfadar qoymanam ətəgin,
Əlim dilim kimi kutahidir ki, yar azdır.

Vəfavü mehrdə hərçənd imtiyazın var,
Hənuz ol ki, gərək yoxdur, ol ki, var azdır.

Bu arizular ilə kim əhatə etdi məni,
Min il muradım ilə dönsə ruzigar azdır.

Əgər şərab verirsən ayağa dur, saqi –
Ki, nagüvar çoxü abi-xoşgüvar azdır.

Əgərçi bülbüləm, amma bahar üçün Qövsi,
Gözümdə həsrətü könlümdə xar-xar azdır.

* * *

Aləmdə bu gün aşiqi-xunincigər azdır –
Kim, xuni-cigər qədir bilən simibər azdır.

Çoxdur həvəs ərbabi, vəli aşiqi-sadiq
Azdır, necə kim, nəğmeyi tər çox, əsər azdır.

Ey sinə verən qüzumi-xunxarinə eşqin,
Ğur et ki, bu dəryada sədəf çox, göhər azdır.

Ol kuy sorağında verir xüld nişanın,
Vaizdə, sözün doğrusu, doğru xəbər azdır.

Məndən dilə hərgah kəbab istəsə könlün,
Hərçənd bu bitabidə, saqi, cigər azdır.

Gər olsa sözü mehrü vəfanın özü olmaz,
Dünya doludur laf ilə, amma hünər azdır.

Ney dəxi həzin nalə ilə bağrımı doğrar,
Guya dili-bimar verən dərdi-sər azdır.

Əndişeyi-tufan çox olur bəhrdə qamma
Sən ləngəri-təslim ələ alsan, xətər azdır.

Ol çeşmi-siyah məsti görən kimsə bilir kim,
Qövsi kimi sahibdilü baliğnəzər azdır.

* * *

Nola gər könlümdə eşqi-naləfərma gizlənir,
Bu könül bir qətrədir kim, onda dərya gizlənir.

Aşiqi-pakizə gövhər sinəsində xuni-dil,
Gizlənir, gər pərdeyi-minada səhba gizlənir.

Bərq əbr altında pünhan qalmağı mümkün deyil,
Naleyi-atəş inan, sinəmdə bica gizlənir.

Dərd əlindən dudi-ahim çün fələk peymalənir,
Yaşınır xurşidi-tabanü Məsiha gizlənir.

Durmayan, oturmayan xəlq ilə bilməz kim, neçin
Yer üzündən qaçıban göylərdə İsa gizlənir.

Balü pərsiz bülbüləm, mümkünmüdür görmək məni –
Kim, yuvamın xarü xaşakında ənqa gizlənir.

Bir pəri peyvəstə vardır, şişəsində Qövsinin,
Səngidil bütlər gözündən sanma bica gizlənir.

* * *

Günüm gecəm kimi peyvəstə qarədir sənsiz,
Gözüm çırağı, gözüm hiç karədir sənsiz.

Cahanda rəml ilə gənc axtaran həris kimi,
Mənim tamam işim istixarədir sənsiz.

Səninlə həm bu imiş qismətim, sanırdım kim,
Mənə nəsib dili-parə-parədir sənsiz.

Əcəb ki, mərhəmi-kafur vəsl ilən bitsin,
Bu növ kim, cigərim başı yarədir sənsiz.

Nədən bu Qövsiyi-məhcur yanmasın gecələr –
Ki, hər sitarə ona bir şərarədir sənsiz.

* * *

Zəfilə gərçi qönçələnibdir sitarəmiz,
Əflak xərməninə vurar od şərarəmiz.

Qaş ilə göz dilini bilən əhli-dil bilir –
Kim, bir kitab söz başıdır hər işarəmiz.

Aylar keçər ki, şəmi-visalini bulmanız,
Bu il bizi nə günlərə saldı sitarəmiz.

Hər bəxyənin gözü bizə bir çeşmi-zəxmidir,
Tutdum ki, bəxyə etmək ilə bitdi yarəmiz.

Bülbüllərə xəzanda verin müjdə kim, tutar
Gül yarpağı yerin cigəri-parə-parəmiz.

Zinhar bəxyəsini çox incitmə kirpiyin,
Dönməz qılınclarilə üzündən nəzarəmiz.

Gər yar sərgiran ola, gər çərx biaman,
Biçarəlikdən özgə nədir dəxi çarəmiz.

Gər lalə bitsə qəbrimiz üstündə razıyız,
Yarəb ki, bitməsin bu bizim qanlı yarəmiz.

Qövsi, əgərçi eyləmədin ərzi-hal ona,
Bəsdir bizə gər anlayan olsa işarəmiz.

* * *

Hərçənd qəmi-eşqi nəhan eyləmək olmaz,
Fəryad ki, fəryadü fəğan eyləmək olmaz.

Təlx eylərdim göz yaşı ilə meyi-nabi,
Əhbabə bu qan olmuşu qan eyləmək olmaz.

Hərçənd edər göz görə risva məni ağzın,
Heç nəstə bu məhcubə güman eyləmək olmaz.

Ol navəki, ey sineyi-suzanım əritdin,
Yaxşılara bidərd yaman eyləmək olmaz.

Ta olmaya su, nəqdi-dilü cani mühəqqər,
Ol sərvin ayağına rəvan eyləmək olmaz.

Nola ki, ləbi-ləlinə canın verə Qövsi,
Can tərkini, ey cani-cahan eyləmək olmaz.

* * *

Şikəstə könlümü sübhi-visali-yar açmaz,
Neçün ki, qönçeyi-təsviri növbəhar açmaz.

Mənə dedin ki, təsəlli verir gül ol üzdən,
Yeri ki, könlümü neyrəngi-ruzigar açmaz.

Açıldı hər xəsü xarin dili, fəğan ki, hənuz,
Bu bülbülün dilini cövşi-növbəhar açmaz.

Qəfəsdə balü pərim varı sındı gövhər tək,
Niqabin üzdən ol ayinəyi-bahar açmaz.

Qəmində şeştərə düşdüm, ədəm qapısını həm,
Mənə mürüvvət edib çərxi-bədqumar açmaz.

Göyərdi riki-rəvan, neyləyim, məgər yarə –
Ki, danəmin girehin əbri-növbahar açmaz.

Nə gündür ol ki, sənin həsrətində əbri-bahar,
Mənə tərəhhüm edib, çeşmi-əşkibar açmaz.

Vara-vara bədənim göz-göz oldu dam kimi,
Hənuz ayağımı zənciri-intizar açmaz.

Gözüm, haçan açılır ağzı bülbülün sənsiz –
Ki, qönçənin dilini cövşi-növbahar açmaz.

Gireh açılmaz imiş bir əl ilə, əfğan kim,
Könül dügünlərini çərx açarsa, yar açmaz.

Rəqib çün gəlir ol kuyidən, əcəbdir kim,
Tutulmuş öylə kim, abzını zülfüqar açmaz.

Zəbanım açmaq üçün açma ey rəqib ağzın –
Ki, qönçə qiflini növki-kəlidi-xar açmaz.

Bu gün mənim gözü könlümdən ayrı dövri-fələk
Nə qapı ola ki, leyl örtməzü nahar açmaz.

Deyin mənim pərü balimdən özgə gülşəndə,
Nə qönçədir ki, xəzan tökməzü bahar açmaz.

Sözümü yar nə bilsin ki, bu şikəstə zəban,
Onunla söz başı həm açsa, ol ki, var açmaz.

Qarınca öz qədərincə vurar, yıxar, dağıdar,
Haman mənim əlimi dövri-ruzigar açmaz.

Baxa-baxa qalaram şəm tək qiyamətdək,
Əgər mənim dilimi mürvət ilə yar açmaz.

Dönə-dönə məni ha, ey səpənd yandırdın,
Məgər mənim dilim ol atəşin üzar açmaz.

Əgərçi nalə ilə açdı min könül Qövsi,
Fəğan ki, ney kimi öz üqdəsi ki, var açmaz.

Fəğan ki, bir gecə ey mah, şəm tək Qövsi,
Sənin camalına çeşmi-ümidvar açmaz.

Ki, munca açmazü açmaz fəsanədir Qövsi,
Nə müşkül ola cahanda ki, girdigar açmaz.

* * *

Möhnətimdən mənim ol məst xəbərdar olmaz,
Özü öz daminə səyyad giriftar olmaz.

Nə qədər uymuş ola düşməni-dirin yeydir,
Qara bəxtim yuxudan şükr ki, bidar olmaz.

Zahirən kim gözü görməz fələki-xunxarın,
Məni bu gündə görən böylə sitəmkar olmaz.

Ey rəqib, eyləməz iqbal sənə könlüm alan,
Yusifi hiçə alan divə xridar olmaz.

Olmadım bağıda bülbüllər ilə həmdəstan,
Bəli, söz anlayana cürəti-göftar olmaz.

Xarlıqdan çəkinən çəksin özündən ətəgin –
Kim, olan öz gözünə xar, dəxi xar olmaz.

Eşq, pərvanə nə sözdür bu ki, aşiq, Qövsi,
Can verir öylə ki, cananı xəbərdar olmaz.

* * *

Yan eşqilə kim, eşqdə nöqsü zərər olmaz,
Ol bəhrdə tufan olur, amma xətər olmaz.

Didarına əzbəs ki, gözüm xəstə cigərdir,
Dəryalər ilə daməni-mujgani tər olmaz.

Pərva edərəm tiğ ilə gər başıma düşsə,
Hərçənd ki, aşiqdə dil olmaz, cigər olmaz.

Şəbnəm nola gər güllərə iqbal edə sənsiz,
Hər dideyi-tər sahibi sahibnəzər olmaz.

Gər meyli-kəbab etsə gözüm nərgisi-məstin,
Kimdir ki, od olmaz, nəmək olmaz, cigər olmaz.

Hərçənd qulaq tutmaya kimsə sənə ey ney,
Sən naləvü ah et ki, əsər biəsər olmaz.

Qövsi nə gedirsən səri-kuyində özündən,
Aşiqdə səri-seyrü həvayi-səfər olmaz.

* * *

Ney kimi girdarımız bəndindədir göftarımız,
Qulluğa bel bağlamaqdır qövlümüz, iqrarımız.

Ey təbibi-xırdəbin, gər dərdimiz çoxdur, vəli,
Əhli-halız, bir işarətdir bizim göftarımız.

Tökməniz üz suyunu dünyavü mafiha üçün,
Sikkəmiz vardır əgər, yoxdur bizim dinarımız.

Gənci-bad-avər kimi, ey ney, bu viyran dəhrdə,
Gərçi bimiqdarıq, amma haqq bilir miqdarımız.

Gərçi yoxdur naleyi-məstanəmiz bülbül kimi,
Biz xərabət əhliyiz, olmaz bizim hüşyarımız.

İntizari-bimürüvvət etdi viyran səbr evin,
Bilmənəm neçin unutmuşdur bizi memarımız.

Rəngi-zərdü əşki-sürxü bizdən al biyna isən,
İmtəhan lazım deyil, çün arıdır dinarımız.

Cövhəri-puşidəmiz ayinə bağrın ab edər,
Çöhrədən Qövsi bizim arıtsalar jəngarımız.

* * *

Olur hərçənd can şirin, vəli canan yerin tutmaz,
Bir-iki üç nəfəs bir ömri-cavidan yerin tutmaz.

Məni bülbüllər ilə bir tutan bidərd bilməzmi –
Ki, yüz min bülhəvəs bir aşiqi-heyran yerin tutmaz.

Meyi-gülgun, şəbi-hicran nə keyfiyyət verir, saqi –
Ki, sənsiz çeşmeyi-heyvan bir ovuc qan yerin tutmaz.

Əgər yüz min xiyaban şaxi-gül səbz olsa gülşəndə,
Biri, ey bağiban, ol sərvi-xoşcövlan yerin tutmaz.

Nə hasil möhnət artırmaq, nə lazım dərdi-sər çəkmək,
Təbib, ol dərdi-bidərman məgər dərman yerin tutmaz.

Könül hərçənd aliqədr olursa, mehrin əladır,
Sədəf ğəltan həm olsa, kövhəri-ğəltan yerin tutmaz.

Sənə ərzani Qövsi ağız açmaq, gülmək, açılmaq –
Ki, yüz mərhəm mənim zəxmimdə bir peykan yerin tutmaz.

* * *

Yüz hüsn dilü dideyi-heyranə yetişməz,
Yüz gənc həqiqətdə bu viranə yetişməz.

Yüz bağü bahar olsa mənim könlüm açılmaz,
Fəryadıma ta naleyi-məstanə yetişməz.

Ol atəşi-suzanə nə hasil yavuq olmaq,
Ta yanmaya məqsuduna pərvanə yetişməz.

Ey bülbüli-nadan, bu nə ahü nə fəğandır –
Kim, bir yerə fəryadi-zəifanə yetişməz.

Gər yetməsə bülbül mənə, ey gül əcəb olmaz –
Kim, saxi-gül ol sərvixuramanə yetişməz.

Bimərd mənə müjdeyi-dərman nə verirsən,
Qoy mən ölüm ol dərdə ki, dərmanə yetişməz.

Ey əbi-tünükmayə məni sanma tühi-dəst –
Kim, bəhri-göhər dideyi-giryanə yetişməz.

Dünyaya həris olma, unut əql məaşın –
Kim, mur bu vadidə Süleymanə yetişməz.

Ol çeşmi-siyahməsti görən kimsə bilir kim,
Yüz tiri-qəza navəki-müjganə yetişməz.

Gər yandıra öz varını pərvanə rəvadır,
Hərçənd ki, firdövsi-Sifahanə yetişməz.

Təbriz açar könlümi, Qövsi, gər açılsa,
Hərçənd ki, firdövsi Sifahanə yetişməz.

* * *

Aldı məndən aqibət can nəqdin ol əyyar göz,
Zalimü xunriz müjgan, kafəri-xunxar göz.

Eylə kim mən bir zaman səndən götürmən könlümü,
Lütf qıl məndən götürmə sən dəxi zinhar göz.

Ey deyən kim, xəlq ilə xəndan gərəkdir adəmi,
Mən tutum kim, güldüm-açıldım, vəli ağlar göz.

Neyləsin gər giryeyi-pünhanə məşğul olmasın,
Çünki qalmış sənsiz, ey göz mərdümü, bikar göz.

Dərd çəkmişlər bilirlər əhli-dərdin halını,
Vəchi-oldur kim, təbibimdir mənim bimar göz.

Getmənəm meyxanədən ta cami-mey gərdişdədir,
Olmanam hüşyar saqi, olmadan hüşyar göz.

Kimsə olmaz böylə qan sərxoş şərabi-nabidən,
Qan ilə guya siyah məst olmuş ol, xumar göz.

Bir işarətdir sipehrin sabitü səyyari kim,
Şamlar Qövsi gərəkdir sübhətək bidar göz.

Bu haman rəna qəzəldir ki, Nəvai söyləmiş:
“Sürməgun tünlərdə hicran şami tut bidar göz”.

* * *

Görmənəm bir həmnəfəs ta eyləyim izhar söz,
Yoxsa kim, ney tək mənim sinəmdə həm çox var söz.

Doğru söz hər kimsəyə təsir edər, naseh, vəli,
Aşiqi məst eylərü aqilləri hüşyar söz.

Sərfəsizdir gövhəri İsrafilə sərf eyləmək,
Ta zərurət düşməyincə söyləmən zinhar söz.

Hikmət ögrən, uyma hər əfsanəyə zinhar kim,
Həm yuxunu artıq eylər, həm qılır bidar söz.

Mən onunçün göz götürməm çeşmi-məstindən onun –
Kim, mükərrər andırır ima ilə bimar söz.

Dideyi-binurdir təsirsiz göftar kim,
Gövhəri-qəltan əsərdir, əbri-gövhərbar söz.

Bülhəvəs nəzzarəsindən mən də fəryad etmənəm,
Söz bilən yanında həmvar olsa, nahəmvar söz.

Acı ağız yey bilir qəndi-mükərrər ləzzətin,
Etməsin məndən diriğ ol ləbi-şəkkərbar söz.

Hər nigahından gözün bir özgə məni anlanır –
Kim, pərişanü müşəvvəş, çox deyir biymar söz.

Heç dil ilə şəm başdan eyləməz pərvanəni,
Eyləmə zaye mənə, ey atəşin rüxsar söz.

Bizəbanlıq eylədi aləmlərə risva məni,
Ol rəviş kim, özgələr razin qılır izhar söz.

Gövhəri-sirabi etməzlər xəzəfdən imtiyaz,
Yoxsa dəryalərcə Qövsi qətlərdə var söz.

Han, sözün səncidə qıl, Qövsi, Füzulidən eşit:
“Kim nə miqdar olsa əhlin eylər ol miqdar söz”.

* * *

Nə yalnız məndə ol sərvü-rəvan ötgəc rəvan qalmaz –
Ki, gər mən gördüyüm canan gəlir, heç kimdə can qalmaz.

Şəbi-hicran bu bidad ilə gər yəğmayi-can eylər,
Gəlir bir gün ki, aşiqdən gözüm namü nişan qalmaz.

Əgər artar bu yüzdən günbəgün eşqin təbü tabi,
Səninçün huma məndən bir avuc üstüxan qalmaz.

Bu il yarəb, nolur bixaniman bülbüllərin halı –
Ki, heç gülşəndə naləm şöləsindən aşiyan qalmaz.

Bu hamı xal vardır yar rüxsarində heyranəm –
Ki, gün ta gərm olur gülşəndə şəbnəmdən nişan qalmaz.

Bilirsə könlümün halını yüz bitablıq qılsam,
Mənim təqsirimə əlbəttə ol arami-can qalmaz.

Nə babət var tutar Qövsi kimi damənin, əl çəkməz,
Mənim müşti-ğübarım yerdə, ey sərvi-rəvan qalmaz.

* * *

Gərçi qoymaz çəkməyə kamimcə dövran bir nəfəs,
Mən haman nuş eylərəm mey bir nəfəs, qan bir nəfəs.

Çox şərərlər var ki, işlər bərqi-bizinhar işin,
Yandırır bir ömr hərçənd olsa hicran bir nəfəs.

Ey ki, daim badeyi-gülrəngidən sirabsən,
Nəşə istərsən mənimlən içgilən qan bir nəfəs.

Ey nəsimi-nalə ol xunxar gəlmək çağıdır,
Eyləmə övraqi-tərkibim pərişan bir nəfəs.

Şəmə hərdəm yandın, ey pərvanə, gördün ləzzətin,
İmtahan üçün bizim odlara həm yan bir nəfəs.

Göz yumub açınca vari tarü pudim yandırır,
Ah əgər iqbal edə ol bərqi-cövlan bir nəfəs.

Özgələr ney tək edərlər nalələr, fəryadlər,
Qoy çəkim mən dəxi ey gərdini-gərdan bir nəfəs.

Gülşəni-icad içində qönçeyi-təsvir tək,
Kim görübdür Qövsiyi-məhzunu xəndan bir nəfəs.

* * *

Sinədə könlüm sarayın rövşən eylər şəmi-dan,
Öz ayağı altına hərçənd işıq verməz çırağ.

Ta açarsan ağzını göftarə, könlüm açılır,
Qönçəni şəbnəm kimi bir qətrə eylər tərdimağ.

Saqiya, məstəm, əlim tutmaz nə tədbir eyləyim,
Ol ki, qismədir yetər, amma gərəkdir əl-ayağ.

Ərşdən ötmək gərək, ta kuyinə yetmək gərək,
Səy qıl ey nalə kim, yol səbdir, mənzil irağ.

Bağlamın zöhd əhlinə qapısın meyxanənin,
Hörməti lazım gərək, hərçənd kafirdir qonağ.

Sanma ki, bihudə odlandım sərapa şəm tək,
Varisəm, yandırmışam qəbrində Məcnunun çırağ.

Ta dilim var bu çəməndə, ey bahari-arizu,
Əndəlibü gül kimi məndən fəğan, səndən qulağ.

Gülüstanə ta nəsimi-kuyin, ey gül getməyə,
Qönçeyi-atəş zəbanın ağzını açmaz buçağ.

Mən ötürdüm dərdi-sərlən naləni seylabidən,
Arxa lütfündür mənə, selaba dağlardır dayağ.

Nalə birdəm yandırar, birdəm saçar xakistərim,
Gah olur xamuş, gahi odlanır yeldən çırağ.

Nərgisi-təsviri-heyrandır sənə çeşmim kimi,
Laləvaş rəşk atəşindən olmauımmı sinədağ.

Var ümidim qoymaya peymaneyi-çeşmim tühi,
Ol ki, xani-rəhmətindəndir fəlk bir boş çanağ.

Qövsi, ol rəna qəzəlidir Füzulinin bu kim:
“Ey Füzuli, çək ayağ, ol bəzmdən, ya çək əyağ”.

* * *

Yoxdur səbati fəsli-gülün ey həzar, heyf!
Bir göz yumub açınca keçər novbahar, heyf!

Düşdüm gedə-gedə iki aləm bəlalərə,
Bir qatla ol bəla mənə olmaz düçar, heyf!

Mən dəxi bir gül olsa idi tərzəban idim,
Ol novbahar unutdu məni, ey həzar, heyf.

Bülbül kimi mənim dəxi çox var sözlərim,
Lal oldu qönçə tək dilim, ey gülüzar, heyf.

Dövri-zaman əgərçi şərərbardır bu il,
Bidərddir deyən ki, keçən ruzigar, heyf.

Meracə yetdi gərçi səbüklük, şikəstəlik,
Olmadım öz muradım ilə xakisar, heyf!

Heç kimsə dərd qədrini bilməz mənim kimi,
Qədrimi bilmədin heyif, eyruzigar, heyf.

Səyyadə seyd qədrini vəhşət bilindirir,
Qövsi, mən ol kəməndə tez oldum şikar, heyf.

* * *

Bülbül mənim əfğanıma qatlanmadı uçdu,
Yarım gecə qönçə yuxudan durdu və köçdü.

Mən tak tikib mey yerinə xuni-dil içdim,
Sözdür bu ki: "Hər kimsə nə əkdi, onu biçdi".

Hicran gecəsi gəldi yenə başimə ey vay,
Hərçənd yaman keçdi günüm, şükr ki, keçdi.

Qurtulmadı, yarəb, cigərim qanı, nə sirdir,
Hərçənd ki, göz tökdü ayağə könül içdi.

Vəsfi-ruxi-gülrəngin onun başladı Qövsi,
Gülzaridə bülbül yenə gül dəftərin açdı.

## GƏRAYLILAR

Eylə kim, dərman sənindir,
Dərdi bidərman sənindir.
Hər nə etsəm padişahım,
Eylə kim, fərman sənindir.

Təşneyi-didarinəm mən,
Ey güli-tər xarinəm mən.
Bir əmanətdarinəm mən,
Dil sənindir, can sənindir.

Könlümü əvvəl alırsan,
Axırı gözdən salırsan,
Qibləgahım, sən bilirsən,
Ev sənin, mehman sənindir.

Ey mənim çeşmim çırağı,
Könlümün ümmidi saqi!
Qan ilən doludur əyağı –
Kim, bu gün dövran sənindir.

Dini-dildən keçməyimmi?
Hasilimdir biçməyimmi?
Qana-qana içməyimmi,
Kasa-kasa qan sənindir?

Gərçi vəslin oldu müşkil,
Bəs ki, var arada hail,
Olmuşam hicrana qail,
Çün şəbi-hicran sənindir.

Gəl məni ey qafil, öldür –
Kim, mənim məqsudum oldur.
Xah ağlat, xah güldür,
Dideyi-heyran sənindir.

Çox da cövrə mayil olma,
Düşməni-canü dil olma,
Hali-dildən qafil olma,
Çünki ol viran sənindir.

Başın oldu kuyi-meydan,
Qaməti-xəmkəştə çövkan,
İmdi Qövsi, eylə cövlan,
Ərseyi-meydan sənindir.

* * *

Könlümdəki muradım
Ey yar, sən bilirsən,
Hər dil ki, bilmənəm mən,
Dildar, sən bilirsən.

Hərçənd ki, bizəbanəm,
Ləbrizi-əl amanəm,
Mən məsti-cavidanəm,
Hüşyar, sən bilirsən.

Mən sanma meypərəstəm,
Saqidən ötrü məstəm.
Mən bir binayi-pəstəm,
Memar, sən bilirsən.

Qəmzən atanda bir ox,
Qaşın yayın çəkər çox,
Könlümdə tab gər yox,
Gər var, sən bilirsən.

Gəlməz fəğan əlimdən,
Üzr istə qatilimdən,
Ona mənim dilimdən
Yalvar, sən bilirsən.

Gər könlümü alırsan,
Gər yüz çin öldürürsən,
Dildar, sən bilirsən,
Qəmxar, sən bilirsən.

Qövsi sənin xərabın,
İçmiş sənin şərabın,
Olmuş sənin kababın
Xunxar, sən bilirsən.

* * *

Ömürlər xuni-dil içdim,
Gülüzarım, səndən ötrü.
Axırı dağlara düşdüm,
Laləzarım, səndən ötrü.

Sinəmi oxlar dəlibdir,
Qanlı peykanlar qalıbdır,
Canımı qəmlər alıbdır,
Qəmküsarım, səndən ötrü.

Aşiq olan keçər eldən,
Başü candan, xanümandan,
Damənin tək getdi əldən
İxtiyarım, səndən ötrü.

Gözlərim qanilə doldu,
Bilmənəm könlümə noldu,
Kakilin tək qarə oldu,
Ruzigarım, səndən ötrü.

Qövsi ilə həmdəm oldum,
Həmdəmi-dərdü qəm oldum,
Xarü zari-aləm oldum,
Nazlı yarım, səndən ötrü.

## MÜRƏBBE

Könlüm istər ki, ola ol atəşmin rüxsarü mən,
Fürsəti-ərzü niyazü xəlvəti-didarü mən.
Növbaharü əndəlibü guşeyi-gülzari mən,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

İkimiz ol məhvəş ilə bir qədəhdən məst olaq,
Bir nəhalın sayəsində əylənib pabəst olaq.
Bağlarıq gərdun əlin gər bir nəfəs həmdəst olaq,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Ol mənə mənzur, ona seyri-çəmən mənzur ola,
Əngəlü biganə napeydavü məhrəm dur ola,
Mütribi-xoşləhcəvü çəngü neyü tənbur ola,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Biz diyari-eşqdə çeşmi-çırağı-aləmik,
Bir cahan ənduh ilə bibakü rindü biğəmik.
Saxlasın Tanrı yaman gözdən ki, yaxşı həmdəmik:
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Bərgü bar ilə mühəyyadır baharın tuşəsi,
Bir tərəf gül xərməni, bir yanda sünbül xuşəsi,
Günci-deyrü birəhmən, zöhhadü məscid guşəsi,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Biz kimiz, surətdəvü mənində layiq dustlar,
Dostluq dəvasını etməkdə sadiq dustlar,
Bir-birilə az düşər biztək müvafiq dustlar:
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

## MÜXƏMMƏS

Daneyi-ləbtəşnəyəm, ey əbri-gövhərbar hey!
Aşiyansız bülbüləm, ey şəmmi-gülrüxsar hey!
Yüz qəmü dərdü bəla pamalıyam qəmxar hey!
Canə yetdim piçü tabü eşqdən, ey yar hey!
Getdim əldən, ay dolanım başına dildar hey!

Əhli-dil kim, çeşmi-tərdən qan qatarlar aşıma,
Əşkimə seylabi-xunü pül demişlər qaşıma.
Sən ki, şəmi-bəzm tək rəhm eyləyib göz yaşıma,
Ol qəddi-rəna ilə hər gah gəldin başıma;
Getdim əldən, ey dolanım başına dildar hey!

Başımı ta şəm tək sevda oduyla dağladım,
Gahi bitəqrib güldüm, gahi bica ağladım.
Hər nə tutdum dəstimə damani-fürsət çağladım,
Ta ki, durdum qulluğunda əl-əl üstə bağladım,
Getdim əldən, ey dolanım başına dildar hey!

Ey xoş ol saət ki, şəmi-bəzmim ol rüxsar idi,
Bülbülü pərvanədən məclis dolu əğyar idi.
Ol nəfəs kim, guşeyi-çeşmin mənimlə yar idi,
Sən əlim tutdun vəli, mən ta ayağım var idi,
Getdim əldən, ey dolanım başına dildar hey!

Xəstədir Qövsi təbibim, dərd bilmək çağıdır,
Çarə qılmaq, kam vermək, könlün almaq çağıdır,
Çünki gəlmək, çeşmi-eyvanında qalmaq çağıdır,
İntizarın çəkdimü gördüm ki, gəlmək çağıdır,
Getdim əldən, ey dolanım başına dildar hey!

## MÜSƏDDƏS-TƏRCİBƏND

Gəlin ey əhli-vərə aşiqü xummar olalım!
Hamı bir müqbəcə yanında giriftar olalım!
Ney kimi nalə çəkib, çəng kimi zar olalım!
Necə bir böylə gözəl fəslidə hüşyar olalım!
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Camilər zəhrilə məmlü şəbi-hicran içdik,
Eylədik tövbə əgər göz görə, pünhan içdik;
Hər nə kim verdi bizə saqiyi-dövran içdik,
Bu fəna dəhrdə bəsdir bu qədər qan içdik!
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Necə bir şamü səhər xabü xəyal ilə keçə,
Necə bir əxtəri-məsud zəval ilə keçə,
Yüz nişat ilə gəlib ömr, məlal ilə keçə,
Heyfdir belə bahar ayı bu hal ilə keçə,
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Xublar varı çəmən seyrinə zinhar gəlin,
Cəmolun qönçə kimi, gül kimi bir dəm açılın,
Eşidin bülbülün ahəngini, qədrini bilin,
Dustlar, mövsimi-gül getmədən əldən yığılın:
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Yarə can eylərik isar budur niyyətimiz,
Tutarıq damənini yar ola gər dövlətimiz,
Biz onun bəndəsiyik, səcdəsidir taətimiz,
Ömr əgər möhlətimiz versə, fələk fürsətimiz,
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Fariğ olman fələki-mübrəmin ibramından,
Hiç kim səy ilə qurtulmaz onun damından,
Dustlar, dövri-zaman gərdişi-əyyamından,
Etməmişkən bizi bihuş əcəl camından,
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

Nola gər çərx ilə yekru qılıram mən Qövsi!
Dust gər yar ola neylər mənə düşmən, Qövsi!
Bütilən xəlvət edən yerdə Birəhmən Qövsi!
Gəl ki, bir guşədə saqiyü mənü sən Qövsi;
İçəlim bir neçə gün badəvü sərşar olalım!
Bizə yar olmasa saqi, biz ona yar olalım!

## TƏRCİBƏNDLƏR

Ey hay kim, açıldı yenə ey həzar, gül,
Çeşmi-tərimdən eylədi əbri-bahar gül.
Əzbəs ki, abü tab ilə ləbrizidir çəmən,
Sanmın ğərib əgər ola hər növki-xar gül,
Gər lalə-lalə göz yaşıma baxmasan nola –
Kim, öz-özün ayağinə eylər nisar gül.
Şəbnəmtək üz yaşırmaq üçün nəli oddadır,
Bəs kim üzündən oldu sənin şərmisar gül.
Ta olmuşam xəyalinə, ey rəşki-növbahar,
Ta məhvəm abü ranginə ey abidar gül,
Eylərmi qönçətək məni bidar əndəlib
Bülbül kimi qılırmı məni biqərar gül:
Dövri-fələk bu surətilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

Gül birlə etdi aləmi ləbrizi-zər bahar,
Hər bağ küncün eylədi gənci-göhər bahar.
Abi-rəvani eylədi simin şükufədən,
Torpağı qıldı səbzə ilə müşktər bahar.
Bidəstü pa qoyarmı məni ol nigar kim,
Gül bərgin etdi bülbülçün balü pər bahar.

Ol gülüzarə qarşı məgər könlüm açıla,
Verməz təsəlli aşiqi-bitabə hər bahar.
Məhvi-nəzarə olsa gözüm eyb görmə kim,
Ondan mənə xəbər verir ey bixəbər bahar,
Vaiz, yetər fəsanə ki, ta fərşdir çəmən,
Mütrüb, çox etmə nalə ki, ta cuş urar bahar;
Dövri-fələk bu surətilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

Hər kim ki, ol sitəmkər ilə yar edər məni,
Əhya verir mənə, yox ikən var edər məni,
Şərmi-nəzareyi-güli-ruyin nəfəs-nəfəs,
Gər gör nə abü rəngli gülzar edər məni.
Bəs kim, çəməndə yadin ilə əşk tökmüşəm,
Hər gül xəyal əbri-göhərbar edəp məni.
Hərgah bir göz açmağa ahəng edər könül,
Neyrəngi-tazə surəti-divar edər məni.
Ayinətək sərasər bazari-dəhridə,
Heyrət bu halı şüğl ilə bekar edər məni.
Əbri-baharü naleyi-bülbül, nəsimi-sübh,
Hərçənd ləhzə-ləhzə xəbərdar edər məni.
Dövri-fələk bu sürət ilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

Üşşaqə vaizin nəfəsindən nə faidə?
Mənzildə karivan çarəsindən nə faidə?
İki cahanda zahidə mey çün həram imiş,
Cənnət həvasinin həvəsindən nə faidə?
Naseh müdam tövbəyə tərğib edər məni,
Yarəb, ona bu mültəməsindən nə faidə?
Bikardır bədən dili-pürşur olmasa,
Çün əndəlib yox, qəfəsindən nə faidə?
Zülfün nə lazım eyləyə zəncir könlümü,
Ol seydi-bəsməlin mərəsindən nə faidə?
Ey həmsəfər, mənim kimi bir tiflməşrəbə,
Bərdərdə təbli-köç səsindən nə faidə?
Dövri-fələk bu sürət ilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

Saqi, gətir şərab, içəlim hay-hay ilən
Keçsin baharımız necə bir ahü vay ilən.
Öz sinəm etmişəm süpərü qarşı durmuşam,
Bir gözləri hərami ilən, qaşı yay ilən,
Üşşaq gün görərmi bu dövranda kim, çıxar
Ol afitab gah il ilən, gah ay ilən,
Bir əhli-dil bilir nə çəkər didədən könül,
Kim qonşu olmuş ola gözü ac gəda ilən.
Baxmazsan əşki-alimə ey səngidil ki, mən
Dəryayə rəxnə salmışam ol qanlı çay ilən.
Mətləb məni oyatmaqisə bir usanginən,
Ağrıtma xəlq başını Qövsi haray ilən:
Dövri-fələk bu sürət ilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

* * *

Zahid, dolu camimdəki ləbriz səfadır,
Dürdi-meyi-gülrəng deyil, abi-bəqadır,
Təsbihimi, zünnarımı gizlətmərəm eldən –
Kim, tərki-riya aləmi-mənidə riyadır,
Şəbnəm kimi bir gün gözün aç, gör bu çəməndə,
Ömr eylər keçər kim, sanasan badi-səbadır,
Ərz etdi təbibi-dili-bimarə mükərrər,
Əhvalimi saqiyü dedi: badə dəvadır.
Gülşəndə ki, hər lalə dolu sağərə bənzər
Kafər, necə məxmur gəzim, gör nə həvadır!
Hərçənd şəbi-cümə gərək taətə məxsus,
Hərçənd ki, adına günü ruzi-duadır:
Hey-hey dolanım başına ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Saqi ki, yegin qəddü rəsa qaməti vardır,
Ol qaməti-rənayə görə hümməti vardır.
Hərçənd ləbin hər kimi öldürsə dirildir,
Öldürməyə üşşaqi əcəb rəğbəti vardır.
Əşkim göhərin badə kimi tökmə ayağə,
Ey zalım, onun qədrini bil, qiyməti vardır.

Hər bithü bidərd könül qədrini bilməz,
Al saxla bu yaquti ki, xasiyyəti vardır.
Sinəmdə könül badeyi-gülrəngçün oynar,
Qan içməyə hərçənd onun adəti vardır;
Hərçənd deyirlər rəməzan ayı yavuqdur,
Hərçənd ki, mahi-rəcəbin hörməti vardır:
Hey-hey dolanım başına ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Əzbəs ki, bu məhfildə fəğan eylədi mütrib,
Ayinəmizi abi-rəva eylədi mütrib.
Bəzm əhlini yandırdı, sızıldatdı qavurdu,
Yaxşı oxudu, leyk yaman eylədi mütrib
Ömr etsinü pir olsunü tapsın məzəyi-ömr –
Kim, pirləri vari cavan eylədi mütrib,
Bir rəng təmam etdi səmayi-rəvani –
Kim, cismimizi ruhi-rəvan eylədi mütrib.
Mən həm elə ahəng ilə fəryad elədim ki,
Yavınqıdı, yalvardı aman eylədi mütrib,
Çün nalə ilə bağrımı qan eylədi mütrib.
Çün nəğmeyi-tər etdi vücudum bir avuc su,
Hey-hey dolanım başına ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən-ayağı!
Ta könlümü asan aparıb müşgülə saldın,
Dildən məni saldın, məni dildən-dilə saldın,
Saqi dolu minani, məni-xanə xərabı
Neyrəngilə sındırdın, ayaqdan belə saldın.
Əylənmişkən rövzeyi-rizvan arasında,
Yarəb, nədən ötrü məni abü gilə saldın.
Yüz həlqə edib zülfü pərişanını çin-çin
Hər həlqə ilə boynuma bir silsilə saldın.
Ol badəni kim, əqlimi başdan aparıbdır,
Sundun mənə, mən sadədili işgilə saldın.
Hərçənd tünük hövsələyəm bəzmi-bəladə,
Hərçənd ayaqdan məni bir cam ilə saldın:
Hey-hey dolanım başına ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Ol bağda kim, eylədi Mirzə onu zahir
Mirzə ki, onun həqq ləqəbin eylədi Tahir.
Ol bağidə kim, ayineyi-dövr nümadır,
Firdovs onunla ola rifətdə nə qadir?
Təsvir edə bilməz onu yüz rəngilə Mani,
Təqlid edə bilməz onu neyrəng ilə sahir.
Heç fərqi onun rövzeyi-rizvanidə yoxdur.
Ol cənnəti-qaibdirü bu cənnəti-hazır.
Dünyadə bu rifətdə məqam kim eşidibdir –
Kim, aləmi-mənzur olavü aləmə nazir.
Bir vəxtdə kim, əbri-bahar ola göhərbar,
Ol bağidə kim, badə çəkər mömünü kafir:
Hey-hey dolanım başına ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Ol bağidə kim, eylədi Təbrizi gülüstan,
Ol bağ ki, bir guşəsidir rövzeyi-rizvan,
Bir həddi Səhənd olmuş, o bir həddi Urumi,
İki yanı Sürxabdır ol kuhi-Bədəxşan.
Fəvvarələri çeşmeyi-xurşidə tökər su,
Dəryaçələri rəşkilə dəryayə verir qan.
Minayü meyü laləvü xaşxaşü şəqayiq,
Bir rəng bular etdilər ol bağı çırağban –
Kim, pərtövi-xurşid kimi bağ fruği,
Etdi fələyin sabitü səyyarini pünhan.
Ol bağidə kim, göllər olar bəhri-göhərxiz,
Bir vəqtdə kim, əbri-bahar ola dürəfşan:
Hey-hey dolanım başına ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı.

Ol bağidə kim, qələsi əflakə çəkib sər,
Ol qələdə kim, dari-süpehr ilə bərabər,
Cövşi-gülü nərgisü rəyahinü qərənfil,
Dünya üzünü eylədi renginü müəttər.
Pəh-pəh nə gözəl sərvləri var bu bağın –
Kim, faxtəsi kərkəsi-gərdun ilə oynar.

Gül butələri dilkəşü ər-ərləri mövzun,
Cənnət yoludur çar xiyabani sərasər,
Axır necə hüşyar oturum mən bu çəməndə –
Kim, qönçəsi mina kimidir, laləsi sağər.
Ol qələdə kim, bağ kənarına düşübdür,
Dörd canibi bişübhə səkkiz cənnətə bənzər:
Hey-hey dolanım başına ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı.

Mütrib, belə gülzari-tərəbxanə gərəkdir,
Mey nuş elə kim, naleyi-məstanə gərəkdir.
Həm məbədi, həm meygədəsi var bu bağın –
Kim, özgəyə məscid, bizə meyxanə gərəkdir.
Hər qönçə bu gülzaridə bir Leyliyə bənzər,
Hər kimsə ki, Məcnun ola, divanə gərəkdir.
Bu abi-havadan ki, verir aşiqə əhya,
Var canımız, amma bizə cananə gərəkdir.
Ol bağidə kim, sinəmi sədçak elərdim,
Sünbüllərinin kakilinə şanə gərəkdir.
O bağidə kim, bülbüli-pərvanə gərəkdir:
Hey-hey dolanım başına ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı.

Hicran sitəmi bağrımı qan eylədi, ey vay,
Ey dilbəri-hərcayiyü xunxar, mədəd hay!
Qövsi necə dursun xəmi-əbrulərə qarşı,
Ol baziyü pürzurilə netsin bu sınıq yay.
Əzbəs ki, ərindim ləbi-ləlin həvəsindən,
Dəryayi-mühit oldu gözüm, didələrim çay,
Mina kimi nolur bu sınıq könlümü alsan,
Bir sağəri-ləbrizilə, ey kafəri-xudray,
Hər bağidə kim, badi-bahar ola səmənsay,
Mehmanlara var saf suyun özgə səfası,
Derlər ki, yavuqdur ola on dörd gecəlik ay:
Hey-hey dolanım başına ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı.

## TƏRKİBBƏND

Əyyami-bahar oldu fəğan başladı bülbül,
Bir növ ki, gülbanginə məhv oldu onun gül.
Qəm kişvəri könlüm kimi zirü-zəbər olmuş,
Ta oldu tərəb ləşkərinə səbzə qaravul.
Gər əbri-kərəm belə yağar səbzələr üstə,
Seylabə gedər xarü xəsü səbrü təhəmmül.
Mina kimi qaldırdı ələm şaxi-gül, amma
Qəlbinə salır tövbənin ol rəngi-təzəlzül –
Kim, naleyi-məstanəyi-mütrib əsərindən,
Yüz yerdən edər qönçeyi-sirab qədəh gül.
Bir belə bahar ayı ki, həngami-tərəbdir
Saqi, dolanım başınə, hey bəhri-təğafül,
Sən badeyi-gülrəng yetir ta xəbərim var –
Kim, huş aparır kakili-müşgin kimi kakil:
Pəh-pəh bu nə bağü bu nə gülşən, bu nə güldür –
Kim, şəbnəmi göz, qönçeyi-siyrabi könüldür.

Səhba qızarır gül kimi sünbüllərə qarşı,
Sünbül gögərir səbzə kimi güllərə qarşı.
İysar üçün açmış girehin qönçeyi-pürzər –
Kim, ərzi-təcəmmül qıla bülbüllərə qarşı.
Rəşk atəşi dağ etdi məni, lalə süfət kim,
Nərgis neçin açmış gözünü yollara qarşı.
Ol gül məni gər qönçə kimi salmasa dildən,
Görmək gərək ahəngimi bülbüllərə qarşı.
Meyxanə yolun başladılar, el sanasan kim,
Pərvaz qılırlar sonalar göllərə qarşı.
Saqi, dolanım başına ey şuxi-sitəmkər,
Gör iczü niyazım bu təğafüllərə qarşı.
Dur, lalə kimi qoymaya gör əldən əyağı –
Kim, ey görünür sağəri-mey güllərə qarşı:
Pəh-pəh bu nə abü bu nə tabü nə çəməndir –
Kim, xari onun gül, xəsü xaşaki səməndir.

Ey hüsnü firəngi, ərəbi xalları hindu,
Rəftarı dilazar, üzü nazik, qədi dilcu.

Yarəb, bu nə navək, bu nə müjgani-rəsadır,
Vəh bu nə kamandır, bu nə əbru, bu nə bazu?
Sərgəştə qılıbdır məni ol dəstəyi-kakil,
Girdabə salıbdır məni ol həlqeyi-geysu.
Məcnun ilə Fərhad mənim girdimə yetməz.
Ey ləbləri Şirin, sözü Leyli, gözü ahu.
Ol çeşmi-siyəhməst mənim əqlim apardı,
Məzurəm əgər eyləmişəm cam ilə yekru.
Hərçənd ki, cami-meyü gül hüşrubadır
Saqi, dolanım başına ey gözləri cadu,
Amma necə əhvalımı səndən yaşırım kim,
Divanə edibdir məni ol nərgisi-cadu.
Pəh-pəh bu nə sahir, bu nə nərgis, bu nə gözdür –
Kim, hər müjəsi bir dilü nəzarəsi sözdür.

Yarəb, nola gər dərdimi cananə desinlər,
Əhvalımı ol zülfi-pərişanə desinlər.
Sərgəştəliyin vəsfini bu muri-zəifin,
Ərbabi-kərəm nola Süleymanə desinlər.
O Leyliyə qurban oluram mən təhi-dildən,
Qoy bir neçə bitəh mənə divanə desinlər,
Pərvanələr öyrəndi dönüb yanmağı məndən.
Razı deyiləm kim, mənə pərvanə desinlər.
Onlar ki, deyirlər bu nə fəryadü fəğandır,
Barı bu sözü ol güli-xəndanə desinlər.
Saqi, dolanım başına ey hövsələ düşmən
Ta el sənə gəncü mənə viranə desinlər.
Hər yerdə ola tut meyü qoy zahidü vaiz:
Deyrü hərəmü məscidü meyxanə desinlər.
Pəh-pəh bu nə məhfil, bu nə meyxanə, nə meydir –
Kim, abidi mütribdir onun, vaizi neydir.

Gülzaridə yüz min dil ilə bülbüli-xoşxan,
Təkrar qılır müdhəti-nəvvab Zaman xan.
Gəncuri-hünərdir, xirədü məxzəni-daniş,
Dəryayi-kərəm, bəhri-səxa, mənbəi-ehsan.
Xülqi-həsəni bəzm günü əbri-gühərbar.

Mövci-ğəzəbi rəzm günü atəşi-suzan.
Vəsfindən onun söylədim, amma dilədim kim,
Ta dair ola daireyi-aləmi-imkan,
Öz istədiyincə ola ol ərşi-cənabın,
Seyri-fələyü dövri-zaman, gərdişi-dövran.
Hərçənd tünük hövsələvü məsti-xərabəm,
Saqi, dolanım başına ey sərvi-xuraman,
Öz başin üçün dur bir ayağ ilə əlim tut –
Kim, əldən apardı məni ol mürği-xoşəlhan:
Pəh-pəh bu nə bülbül, bu nə əfğan, nə nəvadır –
Kim, şəddi dubaladır onun, məddi rəsadır?

Ey kim, utanır çərx sənin şanını görgəc,
Keyvan əyilir rifəti-eyvanını görgəc.
Gər tövsəni-gərdun səbukseyr yegindir,
Heyrətdə qalır sahəti-meydanını görgəc.
Gizlənsə əgər bəhr hübab içrə rəvadır,
Dəryayi-mühit gər kəfi-ehsanını görgəc.
Od tutsa səba girdi-rəhindən əcəb olmaz –
Kim, bərq ərir atəşi-cövlanını görgəc.
Kimdir ki, meyü saqiyü səhba həvəs etməz,
Eyşü tərəbü bəzmini, dövranını görgəc.
Saqi, dolanım başına ey məsti-güzarə,
Hərçənd ötərsən məni-nalanını görgəc.
Amma məni gör kim, nə qədər getsə ayağım,
Əldən gedərəm sərvi-xuramanını görgəc:
Pəh-pəh nə gözəl sərvi-rəvandır, bu nə qəddir –
Kim, sayəsi şandır, səməri ömri-əbəddir.

Hərçənd siyəh məstdir ol nərgisi-şəhla,
Kəsməz nəzərin Qövsiyi-kəmzərfdən, amma
Ayineyi-sirabın açar hüsn niqabın,
Gər təşneyi-eşq abi-həyat etsə təmənna,
Fəryad ki, bir vadiyə düşmüş güzərim kim,
Şurindən onun qönçələnir qətreyi-dərya.
Yarəb, bu nə aləm, nə tərəşşöh, nə həvadir,
Bilməm bu nə məhfil, bu nə meydir, bun nə mina?

Yüz şükr kim, etmiş nəzəri-saqiyi-kövsər,
Tovfiq müyəssər bizə əsbab mühəyya,
Bir yarü kəbabü, meyi-gülgünü mənü sən,
Saqi, dolanım başina ey ahuyi-rəna!
Bir belə gözəl fəsl ki, ləbrizi-çünundur
Gəl başin üçün, gəl tutalım daməni-səhra:
Pəh-pəh bu nə səhra, bu nə firdovsi-bərindir –
Kim, avı bəşər, avçuları ahuyi-Çindir?

# NİŞAT ŞİRVANİ

*XVIII əsr Azərbaycan ədəbiyyatı tarixində Füzuli ənənələrini davam etdirən, anadilli poeziyamızda özünəməxsus dəsti-xətti olan istedadlı sənətkarlarımızdan biri də Nişat Şirvanidir. Həyat və yaradıcılığı haqqında məlumatımız azdır. Əsərlərindən məlum olur ki, şair Şamaxı şəhərində anadan olmuş, sonralar nə səbəbdənsə oranı tərk edərək Salyan şəhərinə köçmüşdür. Akademik Həmid Araslının fikrincə, Nişat Şirvani XVIII əsrin birinci yarısında yaşayıb-yaradan Azərbaycan şairləri içərisində ən şöhrətlisidir.*

## QƏZƏLLƏR

Sağın, ey ğönçə dəhən, gül kimi xəndan gəzmə,
Dağıdıb zülfi pərişan, pərişan gəzmə.

Gəzmə, qurbanın olum, qədrini bilməzlər ilə,
Qorxuram hüsnünə nagəh yetə nöqsan, gəzmə.

Əzizim, istərisən şöhreyi-şəhr olmayasan,
Seyri-bazar edib əğyar ilə meydan gəzmə.

El yaman, yaxşı deyər, gəzmə bu kafərlər ilə,
Sana yüz kərrə dedim gəzmə, müsəlman, gəzmə!

Ey Nişat, sən səri-kuyində müqim ol yarın,
Gəşti-bağ eyləmə, gəl bağ ilə bostan gəzmə.

* * *

Tazədən düşdü yenə başıma sevda, sevda,
Eşq odu qıldı məni aləmə rüsva, rüsva.

Yarəb, ol günlər olurmu yarı məstanə görəm,
Əldə tutmuş olasan sağəri-mina, mina!

Məni bu Leyli yenə eylədi Məcnun, Məcnun,
Mənzilim oldu yenə daməni-səhra, səhra.

Görüm, ey şux, səni dərdü bəla çəkməyəsən,
Saxlasın cümlə bəladən səni mövla, mövla.

Düşübən eşq oduna sən də mənim tək yanasan,
Biləsən ki, nə çəkir aşiqi-şeyda, şeyda.

Xatirim zikri-ləbindən ola bilməz təskin,
Kimin olur şirin ağzı desə həlva, həlva.

Ey Nişat, eylə müdara sitəmi-yar ilə kim,
Eşq əhlində gərək hövsələ dərya-dərya.

* * *

Vəfa məğzi nə mümkündür ola hər baş arasında,
Bu bir sərmayədir kim, aşiqi-qəllaş arasında.

O qaşilə gözün fikri, mənim könlümdə peyvəstə,
Əlifdir katibi-qüdrət, çəkibdir qaş arasında.

Dutubdur səxt yer könlümdə bir gülçöhrənin mehri,
Necə kim, müstətərdir od şərari daş arasında.

O qaşilə gözün axır, könül sirrini faş etdi,
Xətadır qan işi dutmaq yaman yoldaş arasında.

O bəzm içrə kim, ol xunxar içib mey zövq edər, mən həm,
Oleydim xuni-dil birlə o bəzmin kaş arasında.

Nişata, açma kakildən dəxi bir suzişi-hicran –
Ki kəc səriştə bicadır deмək pürxaş arasında.

* * *

Zülfi-siyahın oldu bu gün hüsnünə niqab,
Axşam arayə düşdü, ğürub etdi afitab.

Xət pozdu isə hüsnünü, qaşın yerindədir,
Mehrab yerindədir, ola məscid əgər xərab.

Qaşdan kənarə çəkdi bu yüzdən özünü xət.
Bir kəs ki, əgri ola, gərək andan ictinab.

Qəddin bərabərində sürahi sücud edər,
Ləli ləbin yanında ayağə düşər şərab.

Əmmək dilər dodağını bu binəva Nişat,
Yaxşı duadır eyləmişəm, olsa müstəcab.

* * *

Gəl, ey badi-səba, söylə dilimdən şəm tək yarə,
Qıl əfqan, ağla, şərh eylə ki, bəsdir, yandım odlarə.

Mənim cananımı görsən, dolan başinə kakil tək,
De əhvali-pərişanım ona yalvarə-yalvarə.

Əzizim, aşiq incitmə ki, heç Allaha xoş gəlməz,
Əlindən gəlsə xeyr eylə, mənim tək xar olan zarə.

Nə müddətdir giriftarəm sana, bir xoş günüm yoxdur,
Olubdur, ey gözüm nuri həmişə meylin əğyarə.

Gəlib rüxsarına xəttin, pərişan oldu əhvalım,
Fəqan kim, eyləmiş dövran, bu vəchilə günüm qarə.

Əsiri-hüsnün oldum, ta tökər qan mərdümi-çeşmim,
Giriftar olmasın heç kəs sənin tək mərdümi-azarə,

Bir insaf eylə vəslindən Nişatın könlünü şad et,
Yazıqdır, qoyma kim qalsın, səri-kuyində avarə.

* * *

Həzər qıl yarın, ey dil, gör gözü küncündəki xali,
O bir əyyari-hindudir kim, olmaz fitnədən xali.

Şəbi-hicran nə nəhvilə ki, sərf olmuşdur əhvalım,
Bəyan etsəm əgər, yarə olurmu, bilməzəm hali.

Vüsalın surəti yoxdur, əgər eşq olmasa kamil –
Ki, dün halım görüb vaiz, bana çəkdi bu timsali.

Bəsa hər yerdə qan tökdüm cigərdən, qalmadı rəngim,
Sürahi tək bu vəchilə uçurdum çöhreyi-ali.

Həvadən düşdü könlüm, cismü can-əfsurdə olmaqdan,
Düşər pərvazdan bir quş, şikəst olsa pərü bali.

Yüzün döndərdi məndən bilməzəm ol məh, nədir vəchi,
Kimin kim, bəxti yar olmaz, dönər idbarə iqbali.

Nigara, bir tərəhhüm qıl, Nişat üftadə qalmışdır,
Onu tək qoyma kim, qalsun bəlavü ğüssə pamali.

* * *

Qönçə tək sirrin kişi eldən nihan etmək gərək,
Aşiqi-yekrəng olan bağrını qan etmək gərək.

Xəlqdən qəti-əlaqə eyləyib Ünqa kimi,
Bir qənaət guşəsində aşiyan etmək gərək.

Yaxşı gündə bilmək olmaz kim, dəyanət kimdə var,
Yaxşı yoldaşı yaman gün imtahan etmək gərək.

Müşkül işdir dərdi hər bidərdə izhar eyləmək,
Dərdi bir dərd əhlinə şərhü bəyan etmək gərək.

Ey nişat, ox tək sözündən hər kimə səhm əglənir,
Beylədir doğru sözü xatirnişan etmək gərək.

* * *

Sevmişəm ta səni, ey müğbeçə, xəndan degiləm,
Mayili-sərvü gülü bağı-gülüstan degiləm.

Rahi-eşqində dilü canı nəzir eyləmişəm,
Hər cəfa eylərisən eylə, peşiman degiləm.

Aşina, sən yetəni məndən edirsən ikrah,
Sənə mən qurban olum, mən məgər insan degiləm?

Sən müsəlman bilibən nifrət edirsən məndən,
Sənə aşiq olalı mən də müsəlman degiləm.

Dili pürğüssə Nişatəm, yüz əgər olsam bəd,
Sən kimi zalimü-bimürvətü biman degiləm.

* * *

Başdan ki, xəyali-kəmərü kakilə düşdüm,
Təng oldu, ara yerdə işim müşkülə düşdüm.

Hər bəzmə ki, basdım ayaq, üftadəlik etdim,
Peymanə kimi dəstinə əldən-ələ düşdüm.

Xali-siyəh etmiş məni avarə vətəndən,
Bir danə üçün quş kimi eldən-elə düşdüm.

Qüdsilər ilən aləmi-əqdəsdə gəzərkən,
Yarəb, neləmişdim ki, bu abü gilə düşdüm?

Hər su özümü şövqilə kim, mövc tək atdım,
Bigövhəri-məqsud genə sahilə düşdüm.

Qürbətdə rəhi-seyridə əsbabi-həzər tək,
Asudəligim olmadı hər mənzilə düşdüm.

Gər misli-hübab, özgə həva başıma düşdü,
Bir dəmdə evin tikdimü yıxdım, yola düşdüm.

Yüz görmədim, əz-bəski Nişat, əhli-vətəndən,
Bu vəchilədir baş alıban yad elə düşdüm.

* * *

Mümkün deyil ki, eşq ola bir kimsədən nihan,
Hər yerdə olsa şöləvü atəş olur əyan.

Ol nuri-çeşmə şəm kimi sərgüzəştimi,
Bir namə göz yaşiylə yazıb eylədim rəvan.

Göz içrə meyli-sürməmidir ya ki, bir əlif,
Göz eyni fitnə olduğunu eyləmiş əyan.

Yarım dedi dodağımı öp, heç kimə demə,
Saldım dişə, dilə əbəs, ol sirri nagəhan.

Bir qönçəni açılmağa səy eylərəm Nişat,
Qorxum budur ki, badə verə səyimi xəzan.

* * *

Hər zaman nəqqaş kim, nəqşi-ruxi-canan çəkər,
Gahi naz, gahi tərh eylər bu, guya can çəkər.

Ta ki, başlar kakilin, dünya gözünə tar olur,
Çox qalır sərgəştə bu surətdə, çox hicran çəkər.

Qaş ilə çeşmi bəinə bağlamış könlündə nəqş,
Öylə kim, nəqqaş bir tağ içrə nərgistan çəkər.

Yandırır pərvanəni ta şəm özü yanmaqdadır,
Özgəyə nöqsan verən axir özü nöqsan çəkər.

Dərdim artar, çəkmə candan eşq oxun kim, doğrusu
Xanədə dilgir olur bir ah əgər mehman çəkər.

Ey Nişat kim, atəşi-eşq istəyən büryan gərək,
Bülhəvəsdir kim ki, bu vərtədən özün yan çəkər.

* * *

Şuri-cünun aşiqin başına rüfət verir,
Hər kəsə dünyadə həq əqlicə dövlət verir.

Qanım içərkən bular çeşminə eyni-səfa,
Eylə ki, meyxanələr bəzminə zinət verir.

Handa ki, gördün könül, yari, dolan başına,
Sanma ki, dövran sənə bir dəxi fürsət verir.

Surəti-halın demək aşiqə lazım deyil,
Yüz verə iqbal əgər, eşq özü seyrət verir.

Gövhəri-nəzmi, Nişat, eyləmə hər yerdə sərf,
Bir belə bazardə kim ona qiymət verir?

* * *

Sənin fərşin ki, zahid, buriyadır,
Həqiqət mənzilində bu riyadır.

Riyadır zahidin gərçi namazı,
Vəleykən, xəlq içində xoş ədadır.

Nigahından ol ahu çeşmin, ey dil,
Özün saxla kim, ol eyni-xətadır.

Düşər güzguyə daim əksi ruyin,
Könül saf olsa hər mətləb rəvadır.

Əcəb yox kakilindən olmasam şad,
Mənim bəxtim ki, var, başdan qəradır.

Sınıq ney tək həvadən düşdü könlüm,
Qalıb qəm guşəsində binəvadır.

Nişatın könlünü incitmə, ey məh,
Sənə nifrin edər, əhli-duadır.

* * *

Eşq ilə bu könlümün xasiyyəti pərvanədir,
Yanaram eşq atəşinə, bilmənəm pərva nədir.

Könlümün bir dilnəvazi olmayıb tapdı şikəst,
Hər evin kim olmasa memarı, ol viranədir.

Vəsli-canan istəyən aşiq gərək candan keçə,
Yarə məhrəmdir, özündən hər kişi biganədir.

Vaiz, etmə çox bənə təklif məscid birlə pənd,
Könlümi azdırma yoldan, doğru yol meyxanədir.

Zahida, ömrün veribsən, badəni nuş etməyib,
Bilməyibsən mərifət sərmayəsi peymanədir.

Rövşəni əsrari-həqdir bağtini ayinə tək,
Hər kimi görsən həvayi-eşq ilə, divanədir.

Aləmi-vəhdaniyyətdən söylərəm daim Nişat,
Hər sözüm, hərfim bənim bir gövhəri-yekdanədir.

* * *

Kəm tutma könül, eşqi ziyafətli deyərlər,
Xovf ilə bu sərmənzili heybətli deyərlər.

Ol kəs ki, içibdir meyi-peymaneyi-eşqi,
Heyvan suyu tək nəşəli, ləzzətli deyərlər.

Ol tayifənin atduğı hərgiz yerə düşməz,
Aşiq olanın ahını ülfətli deyərlər.

Müşküldə qalıbdır, bu Nişatın tut əlindən,
Ya şahi-vilayət, səni mürvətli deyərlər.

## MÜXƏMMƏSLƏR

Görüm, ey şux, səni aşiq olub, zar olasan,
Mən kimi bir neçə gün maili-rüxsar olasan.
Bülhəvəs olmayasan, aşiqi-didar olasan,
İxtiyarın verəsən yarə, diləfkar olasan,
Mən düşən dərdü qəmə sən də giriftar olasan.

Görmənəm çox da rəva, görməyəsən azarı,
Çəkəsən bəndə çəkən qüssəni, bir gün barı,
Qatlanırsanmı görüb yarın ilə əğyarı?
Sevəsən ta bir özün kimi vəfasız yarı,
Bəlkə bir rəhmə gəlib yari-vəfadar olasan.

Şəm tək bir dəm əgər atəşi-sövda görəsən,
Nə gəlir başına ah, ey güli-rəna görəsən,
Göz açanda özünü aləmə rüsva görəsən,
Düşməyibsən, düşəsən eşq oduna, ta görəsən,
Nə çəkir aşiqi-miskin, xəbərdar olasan.

Düşübən mən ki, qəmi-eşqinə möhnət çəkərəm,
Hər yetəndən neçə tənə, neçə xiffət çəkərəm,
Bir yetiş halıma sən, gör nə riyazət çəkərəm,
İldə bir yol üzünü görməyə həsrət çəkərəm,
Nola bir gəz mənə bu həsrət ilə yar olasan.

Bu Nişatın yetə gör dadına ey bipərva,
Tərki-cövr eylə, gəl ey dilbəri-bimehr vəfa,
Bu qədər bəsdir ona etdin isə istiğna,
Yetməsin mahi-novi-hüsnünə nöqsan əsla,
Saxlasın Tanrı səni, illərədək var olasan.

* * *

Eylədi yar dilü dinimi viran axir,
Qoymadı məndə o tərsabeçə iman axir.
Yoxmudur şəhrdə bir mərdi-müsəlman axir –
Ki, edə dərdə biri vəzilə dərman axir,
Nə deyim, eyləsin Allah özü divan axir.

Mənə derlər ki, “unut yarı”, unutmaqmı olur?
Yüz əgər kafər ola, tərkini etməkmi olur?
Hərzə sözdür, bu sözü, vay, eşitməkmi olur?
Mən nə fikr eyləyim, el ağzını tutmaqmı olur?
Deyilir aşiq üçün yüz belə hədyan axir.

Nərgiz açıldı, bəhar oldu, üzüm gülmədi heç,
Hali-aşüftəmi ol qönçədəhən bilmədi heç,
Girmədi eynimə, sandım ki, bəhar olmadı heç,
Onsuz, əlqissə, könül qönçəsi açılmadı heç,
Keçdi əyyami-bəhar, oldu gülüstan axir.

Nola, kafər qızı, bir sahibi-iman olasan,
Bircə saət, mənə sən bir gecə mehman olasan,
Bu yaman gündə mənim dərdimə dərman olasan,
Faidə verməz əgər sonra peşiman olasan,
Cəhd qıl olmayasan sonra peşiman, axir.

Ey gül, incitmə Nişatı bu qədər; eylə həzər,
Həm sənin daxi bu vəchilə günün qarə keçər,
Belədir, “hər kişi öz əkdiyin əlbəttə biçər”,
Qeyriyə badə verən saqi özü daxi içər,
Bir xəyal eylə ki, qalmaz belə dövran, axir.

* * *

Göstərdi mənə dün biri bir qaşı hilali,
El bir-birinə mahi-no eylər kimi hali.
Qayətdə mənə xoş gəlibən hüsnü cəmali,
Çün aldım anın əsl kökündən bu suali,
Bir alinəsəbdir, dedilər, ol güli-ali.

Nadan ləl heyfim gəlir, ey adəmizadə,
Gül yarpağı tək ömri-şəbabın gedə badə,
Bil qədri-süxən kəsbi-kəmal eylə ziyadə.
Gər təbi-lətifin qıla şairlik iradə,
Seyranə gətir hər gecə memari-xəyali.

Ey pakzəmir, ayineyi-ərseyi-dövran,
Şairliyə yüz qoyma, edər kim, səni heyran,
Qürbətdə gərək gün keçirə mərdi-süxəndan,
Kəmqiymət olur suda ikən gövhəri-qəltan,
Yəni hünər avarə qılar əhli-kəmali.

Ney tək nə rəva kim, olasan özgəyə dəmsaz,
Səyyadi-məani ola gər, ey gözü şəhbaz,
Həmcins gərəkdir edə həmcins ilə pərvaz,
Eyni-tələbin şeir isə ol şairə həmraz,
Tuti kimi ta öyrənəsən tərzi-məqali.

Gər qəlbi-Əsəddən çıxar olsan günəşa,
Ay tək on iki bürci təmam eylə təmaşa,
Mizanə düşüb sabit olarsan, dəxi əla,
Gər həmdəm olasan bu Nişat ilə müdama,
Qürbətdə dəxi qalmaz anın dərdü məlali.

## MÜRƏBBE

Hər təbibə söylədim dərdim, dəvasın görmədim,
Möhnətü dərdü qəmin heç intəhasın görmədim,
Bu cəhanın bir həqiqi aşinasın görmədim
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

Cövrünü çəkdim əbəs hər nakəsü bədtinətin,
Payimalı oldum axir gərdişi-kəmfürsətin,
Həm rəfiqü həmdəmin, yarın, həmi həmsöhbətin,
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

Verdi hər dəm könlümü tufanə çeşmi-pürnəmim,
Əskik olmaqdan, mənim gündən-günə artır qəmim,
Olmadı dünyadə hərgiz bir müvafiq həmdəmim,
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

Bəxt isə dönmüş, əgər iqbal isə olmuş yaman,
Möhnətü qəm çəkməkilən öldüm axir mən, aman,

Qövmi, qardaşı, rəfiqi bir-bir etdim imtəhan,
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

Ey Nişat, oldum qəmi-hicr ilə sərgərdan, həray,
Dönmədi rəyimlə hərgiz gərdişi-dövran, həray,
Ya Əmirəlmöminin, Heydər, şəhi-mərdan, həray,
Hər kimin çəkdim cəfasın, bir vəfasın görmədim.

## MÜSTƏZAD

Oldum yenə bir dilbəri-tərsayə giriftar,
Əqlim gedibən zar.
Bir kafiri-sərməst sitayişküni-zünnar,
Dildari-sitəmkar.
Sənan tək olub mötəkifi-babi-kəlisa,
Hər şamü səhərlər.
Aşiqligimi xövf edərəm etməgə izhar,
And qılıram ar.
Yusifdir adı, Yusifi-sani kimi məhbub,
Sevdavü xoş üslub.
Eşq əhlinə qəm verməgə, can almağa tüccar,
Ol gözləri xunxar.
Bir çeşmi-siyəhməstə gözüm düşmüş, igitlər,
Zarəm gecə-gündüz.
Bir eyni-bəla fikrinə etdim özüm əfkar,
Oldum gül ikən xar.
Qurbanın olum, Həzrəti-İsanı sevərsən,
Biganəlik etmə.
Yar ol bu Nişat ilə, bir insafın əgər var,
Olsun sənə həq yar.

## ŞİKAYƏTNAMƏ

Ey cəfapişə ki, ayini-vəfa bilməzsən,
Rahi-birah, nə ola, qeyri-cəfa bilməzsən.
Ey ləbi ləl ki, yox mehri-vəfadan xəbərin,
Səxti-bimürvət olubsan bana, daşdır cigərin.

Şəm tək eşqin oduna ki, bəni yandırdın,
Çünki gördüm yanıram, çəkdin ayaq, yan durdun.
Səni ki, gördüm, əzəl yari-vəfadar oldun,
Sözünü söylədin, iqrarına inkar oldun.
Qürrəsən gər özünə, ey məhi-no, eylə xəyal –
Ki, bu şəhr içrə fələk çoxlara göstərdi zəval,
Əhli-hüsnün aqıdır dövləti, payəndə degil,
Eşqin əyyami kimi xürrəmi-fərxəndə degil.
Ey gözəllik çəmənində açılan laleyi-al,
Bəndənin pəndini dür tək sədəfi-guşinə al,
Tanrı verdi sənə bu hüsni məgər cövr edəsən?
Sən gərək aşiqinə rəhm qılıb qövr edəsən.
Ol zamandan ki, sənə aşiqi-didar oldum,
Gövhəri-hüsnünə canilə xiridar oldum.
Bən ki, oldum səbəbi-zinəti-rüxsar sənə,
Bəndən özgə kim idi, söylə, xiridar sənə?
Degiliyin bu gözəllikdə sən, ey məhvəş əzəl,
Bən sənin ayineyi-hüsnünə verdim siyqəl.

## MƏSNƏVİ

Gövhəri məni idin ab ilə rəngin yox idi,
Xaki-aludə idin girdi-qübarın çox idi.

Mərdi-sərraf kimi girdi-qübarın salubən.
Ta yaman olmaya zatında dəriman bulubən.

Yəni mən gövhəri-rüxsarına zinət verdim,
Canımın nəqdini ol gövhərə qiymət verdim.

Bilmədim heç o zaman cövhəri-zatın nə imiş,
İmdi agah olubam zatü sifatın nə imiş.

Bir xəyal eylə ki, əvvəl nə idin, indi nəsən,
Özgələr rövnəqi-hüsnünmü olubdur, ya mən?

Ol zaman fəsli-xəzan tək ki, əsasın yox idi,
Caməvü pirəhənü qeyri libasın yox idi.

Bəndən özgə dəxi bir istəyənin var idimi,
Ya düri-hüsnünə bir kimsə xiridar idimi?

Bağıbanın oluban qönçə zamanında ki, var,
Gül açan dəmdə gülabın çəkər oldu hər xar.

Zibü zinət veribən eylədim adəm səni mən,
Eylədin adəm olub, aləmə rüsva məni sən,

Ey boyu sərvi-rəvan, şux, qiyamət, qamət,
Bivəfa, müşrüb, həm xoşəda, xoşqamət.

Ey mənim tərkim edən tapdın əgər yoldaşını,
Nə dedim get ki, dəxi həqq ovarsın işini.

Handa olsan dolanım başına, hüşyar ola gör,
Özgə dövrandır əfəndim, bu, xəbərdar ola gör.

Qorxaram kim, olasan mayili-bəzmi-meyi-nab,
Verəsən badəbənim səyimi ey xanə-xərab.

Çox sənin kimləri bəzmdə məst eylərlər,
Qasid əl camə urub şişə şikəst eylərlər.

Həzər et gövhəri-nasiftən edərlər süftə,
Alan olmaz o zaman gər dəxi versən müftə.

İş ki, işdən ötə, yox çarə dəxi, ey bədxu,
Bidimaq olma bu sözdən ki, olan işdir bu.

Bulhəvəsdən dəxi gəl çək özünü bir yanə,
Ciyərim, bəsdir əgər döndü isə büryanə.

Aşiqi-paknəzər dilbərini saf istər,
Eşqi pak olmayan, əlbəttə ki, əclaf istər.

Mətləbə yetməz o aşiq ki, degil paknəzər,
Heyni-iksir ilə olmaz ki, dəmirdən ola zər.

Hüsn əhlində gərək mehrü vəfa ilə həya,
Aşiqin daxi gərək olmaya eşqində riya.

Ey bənimlə qılan iqrar, edən inkar axır,
Rəhmə gəldinmi ola, ey büti-bədkar axır.

Dəxi bir gün bəni ey mahliqa yadına sal,
Olma qafil ki, keçər agəh olunca məhü sal.

Hüsnü dövran bəni həm bil ki, degil bir o qədər –
Kim, bu dövran dolanım başına tez başə gedər.

Düşə bir güşeyi-xəlvət, dutaram damanın,
Yay kimi başinə dönnəm, olaram qurbanın.

Səndən özgə mən yar sevəm namərdəm,
Eşqin avarəsiyəm, kuhi-biyabangərdəm.

Bavərin yox sözümə, ey məh yüz kərrə desəm,
Edərəm müshəfi-rüxsarına billah qəsəm.

Şövqi-dünyayi-fənayə özünün vermə, Nişat,
Mənzili-eyş degil kimsəyə bu köhnə ribat.

# ŞAKİR ŞİRVANİ

*XVIII əsrin birinci yarısında Şirvanda yaşamış, mükəmməl mədrəsə təhsili almış, həm heca, həm də əruz vəznində şeirlər yazmaqla bərabər müasirlərinin bədii əsərlərini toplamağa da səy göstərmişdir. Şakirə məxsus cünglərdə onun öz şeirləri ilə yanaşı, bir çox başqa şairlərin əsərlərindən də nümunələr yazılmışdır. Ən iri həcmli əsəri – "Əhvali-Şirvan" mənzuməsində şair Nadir şahın qoşunları tərəfindən Şirvanın talan edilməsini və şahidi olduğu başqa tarixi hadisələri təsvir edir.*

## MÜXƏMMƏSLƏR

Cahan xubları içrə bir nigarə aşiqəm, aşiq –
Ki, çıxman rahi-eşqindən kənarə, aşiqəm, aşiq,
Əzəl gün qılmışam qövlü qərarə aşiqəm, aşiq,
Dişi lölö, dəhanı höqqəvarə aşiqəm, aşiq,
Yüzü gül, ləli mey, çeşmi-xumarə aşiqəm, aşiq.

Qələtmi qıldı könlüm valeh oldu şol ruxi-alə,
Olubdur bağrımız pürxun misli-qönçeyi-lalə,
Bəla küncündə bimarəm, yetən yox hali-əhvalə,
Degil bihudə qılsam ruzü şəb bülbül kimi nalə –
Ki, bağı-dəhrara bir gülüzarə aşiqəm, aşiq.

Cünun oldum genə eşqində bir şuxi-vəfadarın,
Lətafət gülşənində yəni bir gülbərgi-rüxsarın,
Anı tərk eyləmək mümkünmidir təniylə əğyarın,
Gəl, ey naseh, bəni mən eyləmə eşqində ol yarın,
Əlacım yox dönə peyman, nə çarə, aşiqəm, aşiq.

Könül, ruzi-fəraği-yardır çün məlzəmi-məhşər,
Fəraq-əyyamdan əz bəs ki, yeydir matəmi-məhşər,
Səri-kuyində namərdəm, əgər çəksəm qəmi-məhşər,
Əbirəfşan olur xaki-məzarım ta dəmi-məhşər –
Ki, ömr ilə o zülfi-müşkibarə aşiqəm, aşiq.

Həbiba, xaki-payin bükdü Şakir mülazim tək,
Qılar təzim eşqin müttəsil fərzi-ləvazim tək,
Təmənnasında məhrum olmasın ruyi-niyazım tək,
Qədi-mövzununa, həyatına ey şux Kazım tək,
Degil pünhan, Həbibim, aşikarə, aşiqəm, aşiq.

* * *

Ey gül sənə nisbət güli-xəndan ola bilməz,
Hüsnün kimi heç bağda gülüstan ola bilməz,
Qəddin kimi xoş sərvi-xüraman ola bilməz,
Manəndi-sənə hüriyi-qılman ola bilməz,
Zülfün kimi bir sünbüli-reyhan ola bilməz.

Ey qaşları yay, gözləri nərgis, rüxi ziba,
Hər yerdə ki, vəsfin oxuram mən dəxi əla,
Ey kakili sünbül, dəhəni qönçeyi-həmra,
Yoxdur sənə manənd gözüm dəhrdə həmta,
Yox sən təki bir Yusifi-Kənan ola bilməz.

Rüxsari-lətifin nə gözəl mahi-münəvvər,
Ətrafi-rüxündə düzəlib əncümi-əxtər,
Ey qəmzəsi qanlar alıcı, qaməti ər-ər,
Xali-xəttini çün diləyib müşki-müəttər,
Heç sən kimi bu əsrdə insan ola bilməz.

Məhbubsan ey dilbəri-xoşləhcə sərapa,
Aləmdə bənim tək sənə yox aşiqi-şeyda,
Ey ləbləri püstə, pərivəş, gərdəni mina,
Divanə kimi düşdü bənim başıma sevda,
Saldı məni bir dərdə ki, dərman ola bilməz.

Ey tutiyi-şəkkərşikənü tubiyi-xoşqəd,
Ey dişləri inci, dəhəni ola zəbərcəd,
Bu işvə ilə görsə səni bəlkə əgər bəd,
Şakir ki, görüb səlli əla ali-Məhəmməd,
Yox sən təki bir huriyi-qılman ola bilməz.

* * *

Ey məh, sənə manənd bir oğlan ələ düşməz,
Bir zibi-mələk şəmsi-şəbistan ələ düşməz,
Ləlin kimi bir ləli Bədəxşan ələ düşməz,
Çeşmin kimi bir qarəti iman ələ düşməz,
Əl-qissə, bu tədbir ilə insan ələ düşməz.

Bu dövrdə həmta sənə nərgis başa gəlməz,
Rəna qədinə xələti-ətləs başa gəlməz,
Övsafına təcnis,üxəmməs başa gəlməz,
Əbyati-qəzəl və nə müsəddəs başa gəlməz,
Tərifinə bir şairi-xoşxan ələ düşməz.

Qəvvasi-cəhan bir belə cövhər bula bilməz,
Seyr etsə budünyanı sərasər bula bilməz,
Məhbubi-səfalivü səmənbər bula bilməz,
Xürşid özünü sən kimi zivər bula bilməz,
Səd rəng kimi sərlövheyi-fərman ələ düşməz.

Rüxsarına mən mahi münəvvər desəm olmaz,
Ağzın sədəfin höqqteyi-gövhər desəm olmaz,
Ya qəmzeyi-xunrizinə xəncər desəm olmaz,
Yəni ki, cahangiri-dilavər desəm olmaz,
Bu hüsn ilə bir qüdrəti-yəzdan ələ düşməz.

Şakir necə etsə belə ovsafə yetişməz,
Nadan oxuyub sureyi-Ehqafə yetişməz,
Məyus könül sahibi-iltafə yetişməz,
Bir zalimi-xunxardı insafə yetişməz,
Hüsnündə onun mədi-müsəlman ələ düşməz.

* * *

Dilbəra, ruyin güli-xəndanə-nisbət qılmışam,
Kakilin ahuyi-müşkəfşanə nisbət qılmışam,
Qəmzəni bir xəncəri-bürranə nisbət qılmışam,
Navəki-müjganların peykanə nisbət qılmışam,
Xalların bir afəti-dövranə nisbət qılmışam.

Yox məlahət şəhrdə sən kimi şahi-namdar,
Qütbi-dövrani-fələk, sən türfə süni-kirdigar.
Kim görər sevdayi-eşqin, tərk edər namusu ar,
Cümlə məhrulər qatında çakəri-xidmətgüzar.
Yusifi bir bəndeyi-fərmanə nisbət qılmışam.

Gəlməmiş dövranə ey qibləm, gözün tək şüxü şər,
Höqqeyi-ağzın kimi yox mədəni-dürrü göhər.
Canfəzadır nitqü güftarın gözüm, İsaəsər,
Ləblərin şəhdi-müsəffadırmı, bilmən ya şəkər?
Lövhi-sidrin səfheyi-Quranə nisbət qılmışam.

Mahi-novdur qaşların, amma yüzün mahi-təmam,
Hüsni-gülzarında qibləm, sərvi-qəddin xoşxəram.
Sərv üçün rənalığın şol qəddin etmişdir həvam,
Yox cəhanda ey əzizim sən kimi aliməqam.
Hüsni-təxtində səni sultanə nisbət qılmışam.

Afərin kim, xoş müxəmməs söylədim, təfhim ilə,
Sevdiyim hər dəm səni mədh eylərəm, təkrim ilə,
Dişlərin bir dürri-tərdir, fərq olunmaz sim ilə,
Şakirəm eydi-vüsalın çün əcəb təzim ilə,
Saxlaram bu canımı, qurbanə nisbət qılmışam.

* * *

Gəl ey ustad, fəhm et gör necə ahü fəğanım var,
Təriqi-eşqdə sud etmədim hərgiz, ziyanım var.
Bənim bu şəhr içində bir büti-namehribanım var,
Pərivəşlər cəfasilə sədayi-ələmanım var,
Nə pünhan eyləyim, könlümdə bir dərdi-nihanım var.

Pərirulərdə bir məhbubi-tərsa sevmişəm hasil,
Həqiqət bəhrdə bir dürri-yekta sevmişəm hasil,
Bu vəch ilə könüldən qövmi-İsa sevmişəm hasil,
Olub məcnunsifət bir şuxi-Leyla sevmişəm hasil,
Cünunluq babdə xalq içrə xoş namü nişanım var.

Görən rəşki-ləbin sərçeşməyi-heyvanə meyl etməz,
Tutar kuyində məskən, rövzeyi-rizvanə meyl etməz,
Xəbərdar olsa bülbül, qönçeyi-xəndanə meyl etməz,
Açanda nitqini dil, tutiyi-xoşxanə meyl etməz,
Əcəb Fərhadi-əsrəm, bir belə şirin zəbanım var.

Yəqin pərvanə tək bu şəmə pərva eylərəm axır,
Cigərsuz eyləyib ixlasi-peyda eylərəm axır,
Özüm bu dilbərin eşqində rüsva eylərəm axır,
Dönüb mehrabdən, meyli-kəlisa eylərəm axır,
Təvəqqüf çün deyil mümkün, gözüm sanma, yalanım var.

Şikəstə Şakirəm, qıldım yolunda canım ərzanı,
Ona həsbənd olan yəğmayə vermiş dini-imanı,
Deyildir eyb əgər mən həm tutarsam rahi-Sənanı,
Ona həmta bulunmaz, gər gəzəm İranü Turanı,
Kamalım var, çün fəhm etmişəm, çox imtahanım var.

* * *

Ey şux, sənə huriyi-qılman demək olmaz,
Nazik ləbinə ləli-Bədəxşan demək olmaz,
Dürci dəhənin çeşmeyi-heyvan demək olmaz,
Gülzari-cəmalın məhi-taban demək olmaz,
Ağzın içinə həm düri-qəltan demək olmaz.

Nitqi-nəfəsin möcizi-İsayə bərabər,
Zülfi-siyəhin ol şəbi-yəldayə bərabər,
Ağzında dilin lölöyi-lalayə bərabər,
Kuyin sənəma cənnəti-məvayə bərabər,
Tuba boyuna sərvi-xüraman demək olmaz.

Zülfin görübən müşk ilə sünbül xəcil oldu,
Gülzarinə şükr eyləməsin gül xəcil oldu,
Şəkk etmədi gül gülşəni-bülbül xəcil oldu,
Mədhini təmam eyləmədi dil xəcil oldu,
Ovsafi-rüxun kirşeyi-xuban demək olmaz.

Mən etmə gözüm gər sənə qurban ola Şakir,
Dərgahına bir bəndeyi-fərman ola Şakir,
Pabusun üçün xak ilə yeksan ola Şakir,
Lütfün görübən rayici-ehsan ola Şakir,
Bir sirri çələbin sahibə ehsan demək olmaz.

* * *

Həbibim, mehri-hüsnün tək fələkdə afitab olmaz,
Güruhi-xublərdə sən kimi alicənab olmaz,
Dişin tək filhəqiqət mədən içrə dürri-nab olmaz,
Gözün tək hiç nərgis ki, belə məstü xərab olmaz,
Bəni məst eyləmiş xoş cami-eşqin tək şərab olmaz.

Zəhi bir məzhəri-təzvirdir aşıb cahan qəmzən,
Sökər eşq əhlinin bağrın, içər peyvəstə qan, qəmzən.
Əcəb cəlladi-qatildir, eşitməz əl-əman qəmzən,
Könüldən taqəti-səbrim kəsib arami-can qəmzən,
Nə mürvətdir əzizim ki, belə nazü itab olmaz.

Yığıb cəm eyləmiş üstünə xoş-bu ləşkəri zülfün,
Dili-üşşaq üçün qüllab edibdir çəmbəri zülfün,
Alıbdır Çinü Maçin şəhrdən müşki-təri zülfün,
Dutubdur xəttü xalın tək əlində məhzəri zülfün,
Bu vəchilə ana bir kəsdə imkani-cavab olmaz.

Pərişan kakilin dövrində çox aşüftədir halım.
Fələk qəhr eyləyib qibləm şikəst etmiş pərü balım,
Bənim tək bikəsü zarə özün rəhm eylə, ey zalım,
Əgər keçsə cahanda bir zaman sənsiz məhü salım,
Bu əyyamı qəbul etmən ki, ömrümdən hesab olmaz.

Gəl, ey şuxi-cahan, bir ləhzə təşrifi-gülistan et,
Çəmən bülbüllərin sevdayi-güldən həm pəşiman et,
Sədayi-dilkəşinlə bülbüli-xoşxani heyran et,
Şikəstə Şakirəm, hüsnün zəkatından bir ehsan et,
İbadətlərdə şaha, bundan artıqraq səvab olmaz.

* * *

Ol meyi-mənquş ilə cananım almış könlümi,
Qəddi tuba, gözləri məstanım almış könlümi,
Zümreyi-xubanara sultanım almış könlümi,
Nitqi şirin, tutiyi-xəndanım almış könlümi,
Şəhr içində Yusifi-Kənanım almış könlümi.

Eyləmiş dəfi məlalət bir dili-ğəmnakdən,
Münqəte qılmış sirişkim dideyi-nəmnakdən,
Qübbeyi-fərqim oturmuş səqfi-noh-əflakdən,
Bən kimi miskini lütf iylən götürmüş xakdən,
Bağibani-rövzeyi-rizvanım almış könlümi.

Qalmışam giryan bəni təşbihi-ətfal eyləmiş,
Vəh necə sahib-kərəmdir aləmirsal eyləmiş,
Hatəmi bəxşi-itabında həmi lal eyləmiş,
Şəfqət ilə xatiri-məhzunu xoşhal eyləmiş,
Barəkallah, ol şəhi-xubanım almış könlümi.

Anlamış kim, bir şikəst əfsurdə-əhval olmuşam.
Şükr ilə hicranara, əz bəski, pamal olmuşam.
Cani-tənəndaz hər məkruhi-əfal olmuşam.
Dövri-kəcrəftardə bərgəşte iqbal olmuşam.
Dilişad olmuş məhi-tabanım almış könlümi.

Hər birin bir rəng ilə gör necə gülgun eyləmiş,
Hər birini bir şikəstə könli məmnun eyləmiş,
Yəni insaf ilə Leyli yadi-Məcnun eyləmiş,
Firqeyi-nəqqaşara qədrin humayun eyləmiş,
Təbi-mövzun kilki-müşkəfşanım almış könlümi.

Şakira, gəlmiş bahar əyyami güllər açmağa,
Bülbüli-pəjmürdələr şanında dillər açmağa,
Türfə-çağ olmuş miyan ay ilə illər açmağa,
Hər şükufə bir nizam olmuş könüllər açmağa,
Bu cəhətdən qönçeyi-xəndanım almış könlümi.

## MÜRƏBBE

Çeşmimdir intizar, könlüm biqərar,
Gəlmədi qəmküsar, ta bula təskin.
Gərdişi-kəcrəftar, yəni bədkirdar,
Dərd əhlini besyar eylədi qəmgin.

Zaviyeyi-qəmdə, didəmiz nəmdə,
Bulmadım həmdəmdə könli xürrəmdə,
Canım yüz ələmdə, olmaz mərhəmdə,
Qalmışam aləmdə, qəmnakü həzin.

Gəldim bu cahanə, düşdüm ziyanə,
Olmuşam əfsanə, külli-zəbanə,
Yetmədim cananə, əla-məkanə,
Eşqində divanə qaldım bitəmkin.

Əlindən əl-əman, ey çərxi-dövran,
Dəf olmadı hicran, bulmadı imkan,
Hər baxanda yüz qan, eyləmiş asan,
Mənəm bir hərasan, yox bir həmnişin.

Şakirəm sinə çak, ahım suznak,
Düşmüşəm bəs həlak, bilməzəm idrak,
Əcəb durmuş bibak, övraqi-əflak,
Ya fərdi-biişrak, sən eylə yəqin.

## ƏHVALİ-ŞİRVAN

Ey könül, min-bəd gəl ol xaliqi-yəzdan üçün,
Hörməti-ali-rəsulu rövzeyi-rizvan üçün.
Cəmi-dərki-əql qıl, dərdi-dili-pünhan üçün,
Rəsmi-ayini-qədimin dut, rəhi-ürfan üçün,
Ta qılam bir nəzm inşa bu sınıq dövran üçün.

Nə rəvadır kim, könül ətvari-şeir izhar edə,
Şeri-namövzunumu ustad yox, həmvar edə,

Qorxaram nagəh görüb min–tən ülül–əbsar edə
Bu dili–əfkarımı bundan betər əfkar edə.
Yüz duta tən oxları hər dəm təni–üryan üçün.

Olsa cismim zəxmi–tiri–təneyi–əğyardən,
Bolsa könlüm çak tiği–çərxi–kəcrəftardən,
Tapsa yüz min rəxnə dil ədayi bədkirdardən,
İstərəm hər növ ilən ərz eyləyəm əxbardən.
Guş edin, ey dustlar, bu qisseyi–Şirvan üçün.

Cəm olub əşrar bünyadi–şərarət qıldılar,
Nə əcəb şuri–şəri–xosro xəsarət qıldılar,
Özləriçün dəviyi–hökmi–imarət qıldılar,
Aqibət dünyavü din mülkini ğarət qıldılar,
Hasili–din, nəqdi–iman verdilər üsyan üçün.

Əl–əyaz ol vaqiə hər yerdə buldı iştihar,
Qıldı hər bədbəxt olan rahi–zəlalət ixtiyar,
Qurdu bünyadi–fəsadı tövmi–tirə ruzigar,
Bu fəsadü fitnədən dövran olubdur tarimar,
Gör nə ənva ilə ğövğa saldılar İran üçün.

Çün ol şəhr içrə bir xani–müqərrər var idi,
Təbi xoştər, vəsfi Səftər, nəti–Heydər var idi,
Xülqi behtər, dadpərvər, ədli–küstər var idi,
Dutdular ol şəhsuvari çün müqəddər var idi,
Dəsti–pa dərbəstə irsal etdilər zindan üçün.

Oldu peyda ol zaman Sam adlu bir ali təbar,
Eyləmiş devran anı tiri–cəfadan dilfikar,
Bi–ənisü munisü püriz tirabü xarizar,
Lacərəm ol mülki məlum eyləmiş darül–qərar,
Mənzil olmuş bürci–idbar ol məhi–taban üçün.

Talei yüz versə gər, hər dunü ədna şah olur,
Dəhrara biqədr ikən bir əhli–izzü cah olur,
Bəxt əgər hər kimsədən yüz döndərüb ikrah olur,

İzzi-rifətdən düşər, dövran ana bədxah olur,
Etibar etmək xətadır gərdişi-dövran üçün.

Müxtəsər, cəm etdilər çox ləşkəri-napayidar,
Ləşğəri-xəlqi-Muqanü ləzgiyi-nasazikar,
Küfrdür ol ləzgiyi-bədxişə qılmaq etibar,
Verdilər ol binəvayə təxti-rəxti-şahvar,
Səltənət təxtində mənsub etdilər divan üçün.

Bilmək olmaz felini, bu çərxi-kəcrəftardır,
Fitnədir daim işi, bir sahiri-xunxardır,
Bir kəsə iqbal versə, axırı idbardır,
Bəzminə aldanma kim, bir saqiyi-əyyardır,
Badeyi-zəhrin mühəyya eyləmiş rindan üçün.

Hasilən bu şurişi-əşrar pünhan olmadı,
Bilməmiş bu fitnəni bir əhli-dövran olmadı,
Nuh tufanında həm, bir beylə tufan olmadı,
Munca seyli-fitnəni bənd etmək imkan olmadı,
Aqibət məruz olundu ol şəhi-şahan üçün.

Ol şah irsal eylədi bir rəyəti-əjdərmisal,
Bir neçə xani-əzimüşşən cəngi bərkəmal,
Görsə gər min Rüstəmi-cənganə eylər infial,
Zərrəcə əndişə qılmaz, mərgi-halından xəyal,
Əhdi-möhkəm bağlayıb, baş qoydular meydan üçün.

Çünki oldu varid ol dəm ləşkəri-nüsrətşüar,
Toəman iqbali-banüsrət qərini-bəxtiyar,
Qıldılar mərdanəvəş təhvili-tiği-abidar,
Çıxdı xurşidi-səadət əncüm oldu tarimar,
Ləfzi-Bismillah oxundu firqeyi-şeytan üçün.

Mərd olan min-bədbu dəvayə pərva qılmasın,
Dəhrara bu şüğli-biəncamı peyda qılmasın,
Ta özün bihudə bu aləmdə rüsva qılmasın,

Hiç kim bu səltənət babında dəva qılmasın,
Çərx anı qılmış müsəlləm Nadiri-dövran üçün.

Sən demə şəhri-Şəmaxi mənbəi-fisqü fəsad,
Xişti-bidad ilə qoymuşdur binasın ustad,
Çıxdı zülmin təxtinə şəhzadeyi-alinəjad,
Yer yüzündən mütləqa rəf oldu rəsmi-ədlü dad,
Açdı əbvabi-bəlasın çərx o dəm Şirvan üçün.

Gör nə ənvai-siyasət eylədi izhar çərx,
Eylədi əz xabi-çeşmi-fitnəra bidar çərx,
Əl-aman, fəryad bu zülmündən, ey qəddar çərx,
Qıldın islam əhlini pür-dərdü, pür-azar çərx,
Ya məgər badi-xəzan əsdi güli-xəndan üçün.

Mücrümi namücrümün fərq etməyib divanını,
Filhəqiqət bağladı dövran dəri-ehsanını,
Tökdülər nahəq yerə çox bigünahın qanını,
Xəlq unutdu bu cəfadən Kərbəla meydanını,
Ya kərimi-dadrəs, sən yet bu gün divan üçün.

Çünki fürsət düşdi yaran, kafiristan əhlinə,
Çəkdilər tiği-siyasət çox müsəlman əhlinə,
Verdilər cami-şəhadət, yəni iman əhlinə,
Qaldurub xeyli mələk peyğami rizvan əhlinə,
Düşdi atəş rəşkidən ta huriyi-qılman üçün.

Axdı çün seylabi-xuni-ali-Şirvan əhlinin,
Düşdi yəğma külfətü ətfali Şirvan əhlinin,
Oldu qarət hər nə var əmvali Şirvan əhlinin,
Sərnigun olmuş əcəb iqbalı Şirvan əhlinin,
Kim ola düşmüş belə bir dərdi-bipayan üçün.

Ey diriğa, var idi Şirvanda iki kədxuda,
Hər biri pürkari-Şirvan, qütbi-ərzü vəssəma,
Yəni nuri söylərəm şənində yüz min “la-fəta”,

Həm biri ol Mirzə, dərvişi-dürri-dilgüşa,
Oldular vaqif olar bu afəti-tüğyan üçün.

Bu cahan əsbabdən dəsti-əlaqət çəkdilər,
Aqibət bu bəzmdən xeyli məlalət çəkdilər,
Türfə istedad ilə meyli-iqamət çəkdilər,
Çeşmeyi-şəmşirdən cami-şəhadət çəkdilər,
Oldular qəvvasi-bəhri-rəhməti-rəhman üçün.

Bu mürüvvətdirmi, Şirvan cənnətül-məva ikən,
Zinəti-ruyi-zəmin, arayişi-dünya ikən,
Məlcəi-əhli-dua fəqr əhlinə məva ikən,
Dustlar nüzhətfəza, düşmənləri əma ikən,
Cayi-tənəndaz ola, hər nakəsü nadan üçün.

Sanma kim, dövran özü mundan peşiman olmaya,
Sineyi-əhli-həsəd suzanü büryan olmaya,
Kimdir ol zalım ki, munca zülmə heyran olmaya,
Çıxsun ol gözlər ki, bu əhvala giryan olmaya,
Ehtimal olduqca ta dəm dideyi-giryan üçün.

Əsləhül-əmalisən, ey şəhriyari-xoşxisal,
Yox sənə manənd bir sahib-nəsəb fərxəndə fal,
Təxtigahındır sənin şaha, Ərəş tək xoş məhal,
Ey şəha, ta həşr bulmaz dövləti-hökmün zəval,
Daidir qüddusilər bu dövləti-ərkan üçün.

Afərin idrakına, ey dürri-bəhri-mümkinat,
Olmusan iqbal ilə mümtazi-əhli-kainat,
Nuh tək buldun əcəb bu vərteyi-qəmdən nicat,
Dövləti-pabusinə min Hatəm eylər iltifat,
Məni-sərgərdan gəzər bir loğmeyi-ehsan üçün.

Eylədin tədric ilə tədbiri-əhvali-Ərəş,
Qılmısan ədaları əlqissə pamali-Ərəş,
Cəmdir başında mütləq izzü iqbali-Ərəş,
Astani-pakinə əyanü ətfali-Ərəş,
Mən qılma, ey gözüm, cəm olsalar qurban üçün.

Ey şəha, ol dəm ki, çəkdin tiği-bəxtin əz niyam,
Zərbəti-şəmşir ilə ədadan aldın intiqam,
Söylərəm cürət bilə bir sözünü bi-nəngi-nam,
Bilmiş ol kim, həşrdən bir mülk olmaz bər nizam,
Qılmasan tənbih əgər əşrari-Dağıstan üçün.

Şişeyi-könlüm şikəstdir, təneyi-bədxah ilən,
Qalmışam şimdi bəla küncündə dudi-ah ilən,
Yoxsa bu meydanda mən bazu qılardım şah ilən,
Şakira, sən sidqini möhkəm qıl ol Allah ilən,
Guşeyi-zillətdə qalmaz yüz dutan sübhan üçün.

# MƏHCUR ŞİRVANİ

*XVIII əsrdə yaşamış Şirvan şairlərindəndir. Həyatı haqqında məlumat yoxdur. XVII – XIX əsrlərdə tərtib edilmiş bir çox cünglərdə şairin onlarca qəzəli, müxəmməs və tərkibbəndi, heca vəznli şeirləri saxlanılır. Firidunbəy Köçərli "Azərbaycan ədəbiyyatı materialları" əsərində onun "Gəl, vəqtidir" rədifli tərcibəndini çap etdirib.*

*Ədəbiyyatşünaslıqda "Qisseyi-Şirzad" poemasının Məhcur Şirvaniyə məxsus olması haqqında fikir vardır.*

## QƏZƏL

Yandı canım, ey əzizim, namdar, əylənmə, gəl,
Qoymadı hicrin qəmi məndə qərar, əylənmə, gəl.

Durmuyub, sənsiz dağıldı xubların məcmuisi,
Gül irəngim solubən, getdi bahar, əylənmə, gəl.

Müntəzirdir çeşmimiz ta kim, görə didarını,
Varə-varə həddin aşdı intizar, əylənmə, gəl.

Əhd qılmışdın ki, bir gündən ziyad əylənməzəm,
Noldu axir etdigin iqrar, yar əylənmə, gəl.

Yad qıl, incitmə hər saət, rizayi-həqq üçün,
Məhcuri-biçarədən gəzmə kənar, əylənmə, gəl.

## MÜRƏBBE

Könlüm arzumənda, gözüm yollarda,
Niçün bu gülzarə canan gəlməyir?
Bağrım kabab etdi, cigərim büryan,
Neçün canan bizə mehman gəlməyir?

Cismim cərahətli, könlüm biqərar,
Didələrim xunbar, işim ahu zar,
Ağlaram bülbül tək fəsli-nobahar,
Neçün bağa güli-xəndan gəlməyir?

Gəldik sarayına üç qardaş ilə,
Nə kim ayağ ilə, bəlkə baş ilə,
Bizi qoydu gözü qanlı yaş ilə,
Səbəb nədir, dərdə dərman gəlməyir?

Aman ömri-saqi, çeşmim çırağı,
Mən tək üftadədən kəsmə ayağı,
Açıldı lalələr, bürüdü dağı,
Yüzü gül, kakili reyhan gəlməyir.

Gəlmədi bağ içrə güli-gülşənim,
Neylim, cayi-qürbət olmuş məskənim,
Məhcurəm, əyməzdim şaha gərdənim,
Qaldım boynu əyri, sultan gəlməyir.

## MÜXƏMMƏSLƏR

Bəs ki, ol sərvin ayağınə gözüm tökdi yaş,
Getdi tufani-bəlayə dilü din, canilə baş,
Oldu Məcnun kimi cana, vətənim dağ ilə daş,
Qələmi-sün ilə can almağa çəkmiş nəqqaş,
Bu nə qəddü, bu nə qamət, bu nə gözdür, bu nə qaş.

Qətrə-qətrə dəhənindən tökülür şəhdü nəbat,
Verir, ey mayeyi-can Xızra ləbin abi-həyat,
Səni məhşər günü görgəc deyər əhli-ərəsat,
Bir güli-arizi-canpərvəri Əhməd-səlavat,
Bu nə qəddü, bu nə qamət, bu nə gözdür, bu nə qaş.

Qaşların qövsi-qüzeh, qəmzələrin tiri-şəhab,
Oldu can almaq üçün cüllənişin rəngi-xəzab,

Cigərim qanə dönüb, oldu gözüm mərvü meyab,
Xəmi-əbrü ilə yıxdın evim, ey xanə-xərab,
Bu nə qəddü, bu nə qamət, bu nə gözdür, bu nə qaş.

Məhi-taban görücək qaşlarını, oldu hilal,
Zinəti-ovci-fələksən, məhi-pakizə-xisal,
Qamətin nazü nəzakətdir, əya tazə-nihal,
Mən çəkim yayını, çəkməz ola kim Rüstəmü Zal,
Bu nə qəddü, bu nə qamət, bu nə gözdür, bu nə qaş.

Əndəlibəm məni-Məchur, işim cəh-cəhü cəh,
Kəlbi-xakindir nə kim, çağıra gör gəh-gəhü gəh.
Qəhr çox etməvü lütf eylə və gül qəh-qəhü qəh,
Dolanım başına mən "səlli-əla" pəh-pəhü pəh,
Bu nə qəddü, bu nə qamət, bu nə gözdür, bu nə qaş.

* * *

Cahanda hal bilməz yar sevmək, ey könül, müşkül,
Vəfasın tərk edən dildar sevmək, ey könül, müşkül,
Vüsali-yar içün əğyar sevmək, ey könül, müşkül,
Həvayi-güldən ötrü xar sevmək, ey könül, müşkül,
Anub dildar zülfün mar sevmək, ey könül, müşkül.

Əzəl gün yazdı çün kilki-qəza hər bada bir sevda,
Odur kim, hər bir adəm qıldılar bir məqsədə pərva,
Bənə qismət qılıb sevdayi-eşqi eylədi rüsva,
Keçirdim ömri-dini Əhmədi-Muxtar ilən hala,
Bu gün tərsa olub zünnar sevmək, ey könül, müşkül,

Saraldı rəngi-ruyim, qəm yükündə qamətim xəmdir,
Ənisim guşeyi-möhnətdə, hər dəm xuni-didəmdir,
Bu nə sözdür deyərlər, yarimzi əğyarə həmdəmdir,
Yarın qeyr ilə görmək aşiqə nari-cəhənnəmdir,
Cəhənnəm istəmək, ya nar sevmək, ey könül, üşkül.

Diriğa, bəs bəni-biçarəyə yar elədi dövran,
Bu möhlük dərdə heç tədbir ilə bir bulmadım dərman,
Degil təğyirə qabil, olsa gər təqdirdən fərman,
Nə müşkül hal olursa əql ilə həll eyləmək asan,
Nə hasil kim, büti-əyyar sevmək, ey könül, müşkül,

Yetər, ağlatma gəl hicran ilə bu çeşmi-xumarı,
Vəfasız həmdəmin munca nədir olmaq giriftarı,
Sığışmaz şərhi-nəzmə qüssəvü dərdü qəm izharı,
Tükənməz gecə-gündüz söyləsə Məhcur göftarı,
Mühəssəl yari-bi-iqrar sevmək, ey könül, müşkül,

* * *

Ey yanağı gül, xəti növrəstə, qurban olduğum,
Dişləri inci, dəhanı püstə, qurban olduğum,
Gərdəni mina, ləbi mül-məstə, qurban olduğum,
Yaşmağı gülgün, dəhanı cöstə, qurban olduğum,
Nazənin rəftar, qəddi bəstə, qurban olduğum.

Eşq bazarında yox qan ağlayan bülbül kimi,
Heç kimin məşuqi, yarəb, olmasın ol gül kimi,
Dilbəra, qan etmə bağrım, ləli-xunin-dil kimi,
Bilmişəm axır qaraldar niki-ruyin gül kimi,
Atəşi-eşqin yanar hər kəsdə, qurban olduğum.

Qalmışam giryan ğəmin küncündə zari-binəva,
Nola qılsan dərdü hicranə vüsalından dəva,
İstəmən huri-mələk dünyadə səndən masəva,
Olmaq istər xatirim xaki-dərindən aşina,
Qapına gəldim bəni-dilxəstə, qurban olduğum.

Şöleyi-xurşidi-ruyin aləmi bənd eyləmiş,
Ğönçəni diltəng gördükdə nə rəngi-xənd eyləmiş,
Nərhisi-çeşmin xumar içrə sərəfkənd eyləmiş,
Məhcurun cani-dilin hər tarə peyvənd eyləmiş,
Kakilindir nafeyi-sərbəstə, qurban olduğum.

* * *

Bu nə qaşdır, bu nə göz, ey təbi-pakizə xisal,
Nə gözəl qaməti-bala, nə əcəb hüsni-camal,
Bu nə simin təni-mövzun, qədi-bir tazə nihal,
Bu nə dişdir, nə gülüşdür, bu nə rüxsareyi-al,
Bu nə ləbdir, bu nə ağız, bu nə xətdir, bu nə xal.

Afərin hüsni-xudadan gözəlim məhrəmi-raz,
Ki, pənahində səni saxlasın ol bəndənəvaz,
Mən deyərdim sənə canan olasan sən həmraz,
Bu nə işvə, nə girişmə, bu nə şivə, bu nə naz,
Bu nə ləbdir, bu nə ağız, bu nə xətdir, bu nə xal.

Məqsədim sənsən əya dilbəri-sahib əyyaş,
Yad vəslinlə dəmadəm tökərəm bağrıma daş,
Sanasan qüdrət əlilən rəbim etmiş nəqqaş,
Sənə qurban olayım mən, bu nə gözdür, bu nə qaş,
Bu nə ləbdir, bu nə ağız, bu nə xətdir, bu nə xal.

Nöki-müjgan kimi qəmzə oxun san eylər,
Ki, çəkib tiği-səfa qəsdi-dili can eylər.
Din arasına salıb qarəti-iman eylər,
Gündə nahəq yerə zalım neçə min qan eylər.
Bu nə ləbdir, bu nə ağız, bu nə xətdir, bu nə xal.

Gülşəni-hüsnünə qurban olayım bulsam rəh,
Edərəm müxlisi-şeyda kim yüz cəh-cəhi-cəh,
Çoxu naz etmə əfəndim bənə lütf et gəh-gəh
Barəkallah gözəlim, bəs gözəl isən pəh-pəh
Bu nə ləbdir, bu nə ağız, bu nə xətdir, bu nə xal.

* * *

Çıxdılar seyr etməyə bir neçə məhruxsarlər,
Bir-birindən nazənin şuxi şəkərgöftarlər,
Verdilər şümşadə xiclət sərvi-xoşrəftarlər,
Hər tərəf xidmətlərində cəmi-xidmətkarlər,
Kimi aşiq, kimi məşuq, kimi müşfiq yarlər.

Hurilər kim, bu cahanda yoxdu bir həmtaləri,
Dərsi-nazü işvə təkim eyləmiş ustaləri,
Şəhrə saldı qülqülə avazeyi-sevdaləri,
Geydilər çapük müzəyyən xələti-dibaləri,
Çıxdılar seyr etməyə bir neçə məhruxsarlər.

Cəm olub meyxanədən sərməsti-cami-badələr,
Vardılar səhralərə bir neçə hurizadələr.
Qaməti mövzun, xəti növrəstə, hüsni sadələr,
Təni-bədgudən müərra, eybidən azadələr,
Bir-birindən nazənin şuxi şəkərgöftarlər.

Dərsi-ülfətnameyi-dildən səbəqxan oldular,
Duşbərduş, əlbəəl, damənbedamən oldular,
Pirəhən çak eyliyib, gül kimi xəndan oldular,
Seyr ilə baği-bahar üzrə xuraman oldular,
Verdilər şümşadə xiclət, sərvi-xoşrəftarlər.

Kimi gülgun cam tutmuş, saqiyi-məstanədir,
Kiminin nazik əli üzrə müzəyyən şanədir,
Kiminin şəhla gözü xunab ilə peymanədir,
Kimi aqil bənd elər, kimi dəli, divanədir,
Hər tərəf xidmətlərində cəm xidmətkarlər.

Qaş gözü təhrik birlə kimisi güftar edər,
Kim çəkir, əğyar vəhmin qövlünə inkar edər,
Hər biri həmdərdinə dərdi-dilin izhar edər,
Kimisi Məhcur tək sərəgəştəni bizar edər,
Kimi aşiq, kimi məşuq, kimi müşfiq yarlər.

* * *

Bəlayi-eşqə, ey dil, yox nəhayət, intəhasızdır,
Bulunmaz çarə hərgiz dərdinə bil kim dəvasızdır.
Neçə laf eyləyənlər munda bisəbrü rizasızdır.
Rəqiblər purcəfa, məşuq bimehrü həvasızdır.
Əcəb müşkül hekayət kim, bilinməz, macərasızdır.

Düşübdür mədələtdən şahi-hüsnün ədl divanı,
Dəxi cövr etməsin üşşaqə, minbəd eşq soltanı,
Alınmaz oldu çün məşuqdən aşiqlərim qanı,
Gəlin ey dərdməndlər, çəkməyin çox dərdi-hicranı,
Zəmanə özgədir, həmdərdü həmdillər vəfasızdır.

Götürmüş əllərin xunbar edib çeşmin, dua eylər,
Könüldə izzü cahü mülkü dövlət iqtiza eylər,
Götürməz tab cövri-alahə, yüz min nasiza eylər,
Təmədən ötrü qılmış qamətin xəm, iltica eylər,
Cahan safilərinin sanma əmalın, riyasızdır.

Təriqi-mərifət tut arifa, iç badeyi-ürfan,
Düşüb dərdən-dərə salus olmaz adı, əşk-əfşan,
Mey iç, seyri-çəmən qıl, naz ilə üz qönçeyi-xəndan,
Sorulmaz şahlar bəzmində çün təqsiri-sərməstan,
Əgər hərçənd ədəb tərkin qılur şux, həyasızdır.

Düşüb divanə könlüm, məclisi-ürfanə lal olmuş,
Qılub mey tövbəsin, kamillər içrə bakəmal olmuş,
İtirmiş cami-mey səriştəsin sərgəştəhal olmuş,
Bükülmüş qaməti bir bədr eşqindən hilal olmuş,
Demin Məhcuri-zarın şöleyi-ayın, ziyasızdır.

## MÜSƏMMƏT

Ey həbibim, həsrətindən çıxdı can, gəl, vəqtdir,
Ey büti-növrəstə, şuxi-mehriban, gəl, vəqtdir.
Ey müəttər qönçeyi-baği-cəhan, gəl, vəqtdir,
Ey yüzi gül, kakili ənbərfəşan, gəl, vəqtdir,
Ey xoş əlhan, tutiyi-şəkkərzəban, gəl, vəqtdir,
Ey nihali-qaməti sərvi-rəvan, gəl, vəqtdir.
Ey bizimlə həmdəmi-yari-canan, gəl, vəqtdir,
Ey cəmalı mahtab, əbrukəman, gəl, vəqtdir,
Ey gözü cəllad, əli peyvəstə qan, gəl, vəqtdir,
Ey kərəmlü xosrovü əlaməkan, gəl, vəqtdir,
Ey gözəllik mülkünün təxtinə xan, gəl, vəqtdir.

Neçə müddətdir səni tək şəhriyarı gözlərəm,
Salmazam sənsiz gülüstanə güzarı, gözlərəm,
Firqətindən yandırıb səbrü qərarı, gözlərəm,
Türfi-rüxsarında xətti-müşkbarı gözlərəm,
Gözlərim yollarda, getdiyin diyarı gözlərəm,
Düşmüşəm qəm küncünə, mən qəmgüsarı gözlərəm,
Çox çəkib hicrində cörü intizarı, gözlərəm,
Neçə vaxtdır ki, mələk, sən gülüzarı gözlərəm,
Şimdi səndən əl çəkib, rahi-məzarı gözlərəm,
Tapmazam dünyadə bir dövrü mədarı, gözlərəm,
Ey Həbibim, həsrətindən çıxdı can, gəl, vəqtdir.

Ay ilə gün dövr edər eydi-vüsalın görməyə,
Mahi-növ sərgəştədir mişkin hilalın görməyə,
Şahi-hindu müntəzirdir xəttü xalın görməyə,
Xizr sərgərdan gəzər şəhdi-zülalın görməyə,
Yer yüzün tutmuş günəş, ta payimalın görməyə,
Sərv baş almış qiyami-etidalın görməyə,
Lalənin bağrında daği, rəngi-alın görməyə,
Hurilər həsrət çəkir fəzlü kəmalın görməyə,
Tutilər dilxəstədir, şirin məqalın görməyə,
Arzu eylər məlayiklər cəmalın görməyə,
Ey buti-növrəstə, şuxi-mehriban, gəl, vəqtdir.

Söylə ey dilbər, nədir bizdən bu bizar etməyin?
Yarini əğyar edib, əğyarın yar etməyin?
Ey güli-navik, nə işdir ülfəti-xar etməyin?
Hər yetən naməhrəmə dərdi-dil izhar etməyin?
Dustların düşmən sanıb qeyri-həvadar etməyin
Tərgit, Allahın sevirsən, böylə rəftar etməyin,
Xoşmudur eşq əhlini hicr ilə bimar etməyin?
Qəm bucağında işin əfğan, günün zar etməyin,
Dərdi nadərd əhlini yetməzmi tumar etməyin,
Mövsümu güldür ki, lazım seyri-gülzar etməyin,
Ey yüzü gül, kakili ənbərfəşan, gəl, vəqtdir.

Payibusun çün bahar əyyamı bağ istər səni,
Baş əyib olmuş bənövşə bidəmaq, istər səni,

Rindlər meyxanədən çəkmiş əyaq, istər səni,
Nərgisü reyhanlar açmış qulaq, istər səni,
Həsrətindən lalənin bağrında dağ, istər səni,
Seyr üçün qurmuş şəqayiqlər otağ, istər səni,
Cəm olub məhbublar açmış buxaq, istər səni,
Gülbini-möhnətzədə əymiş budağ, istər səni,
Bülbüli-zarə əsər qılmış fəraq, istər səni,
Hər çiçək tutmuş əlində bir çırağ, istər səni,
Ey müəttər qönçeyi-baği-cəhan, gəl, vəqtdir.

Buyi-zülfündən cəhanə can verir hər dəm səba,
Aləmi avazeyi-hüsnün tutubdur cabeca,
Dərdməndlər dərdinə şəhdi-ləbindən ver dəva,
Ey fəda olsun sənə yüz huri səndən ma-səva,
Ah neylim, eyləmiş dövran məni səndən cida,
Səbrə müstəhkəm olaq, çün böylədir əmri-xuda,
Sən daxi bir lütf qıl, gəl, etmə çox cövrü cəfa,
Aşiqi zar eyləmək bunca nədir, ey bivəfa?
Bülbülün fəryadı qıldı dəhr gülzarın fəna,
Hər səhər mürği-bəharistan oxurlar mərhəba,
Ey xoşəlhan tutiyi-şəkkərzəban, gəl, vəqtdir.

Çün məni sərməst edib, divanə qıldı zövqi-cam,
Ey pəri, sövdayi-eşqin tutdu könlümdə məqam,
Bu nə firqətdir, gözüm hicrində qan ağlar müdam,
Yox mənim sənsiz qərarım hərgiz, ey tuba-xüram,
Nola xaki-dərgəhin olsam bəni-qomgəştənam,
Yanaram hicranına pərvanəvəş hər sübhü şam,
İstərəm nari-fərağından aləm bir intiqam,
Aşiqə yarından amma intiqam almaq həram,
Padişahım, təxtinə bizdən səlam olsun, səlam!
Əzmi-gülzar etdilər şümşadi-ər-ərlər təmam,
Ey nihali-qaməti sərvi-rəvan, gəl, vəqtdir.

Gözlərin yad eylərəm, ey şux, can qəsdindədir,
Noki-müjganın sənin, ruhi-rəvan, qəsdindədir,
Qaşların əndişəsi min xaniman qəsdindədir,

Arizivü sünbülün dinü iman qəsdindədir,
Hər səri-muyin xəyali bir məkan qəsdindədir,
Hər düləlin fikri yüz min mehriban qəsdindədir,
Növxətin şirazəsi xəlqi-cəhan qəsdindədir,
Hər kəməndi-kakilin həft asiman qəsdindədir,
Mehri-hüsnün baş çəkib, külli-İran qəsdindədir,
Cismimi yandırdı hicrin, şimdi can qəsdindədir,
Ey bizimlə həmdəmü yarü cinan, gəl, vəqtdir.

Cəm olub məhbublər, hər yerdə məhfil bağlamış,
Dəstə-dəstə hurilər reyhan ilə gül bağlamış,
Bir sənəm rüxsarına susənlə sünbül bağlamış,
Gərdəni aşiqlərin guya səlasil bağlamış,
Eşq zənciridir ol, ustadı-kamil bağlamış,
Gör nə möhkəm bənd qılmış, gör nə qabil bağlamış,
Zivəri-rüxsar edib, hüsn üzrə hayil bağlamış,
Bir neçə eşq əhlinin ol qeydə mayil bağlamış,
Hər tərəf güllər açılmış, lalə kakil bağlamış,
Hər şükufə yüz açıb, hər səbzə bir dil bağlamış,
Ey cəmali mahtab, əbru kəman, gəl, vəqtdir.

Can verib didarına, aləmdə bir ad istərəm,
Sanma eşqin tərk edib mən bir pərizad istərəm,
Bəndeyi-dərgahınam, mən səndan irşad istərəm,
Gecə-gündüz eyliyib əfqanü fəryad, istərəm,
Hüsnünə qarşu duran əğyarı bərbad istərəm,
Dörd çəkmiş xatirim hicrindən azad istərəm,
Künci-möhnətdə dilim zülmünlə mötad istərəm,
Cövşəni-sinəm xədəngi cövrə fulad istərəm,
Yüz tutub pabusuna hər ləhzə münqad istərəm,
Qəm hücum etmiş mənə, mən səndən imdad istərəm,
Ey kərəmlü Xosrovi-əlaməkan, gəl, vəqtdir.

Mehri-eşqin, ey sənəm, məstü xumar etmiş məni,
Taci-zövq ilə cəhandan namdar etmiş məni,
Səbrü aramım alıb, biixtiyar etmiş məni,
Xublar kuyində xaki-rəhgüzar etmiş məni,

Cövrilə dövran dönüb, bədruzigar etmiş məni,
Suzi-dil yıxmış vücudim, tarimar etmiş məni,
Qəm bucağında sədayi-eşq zar etmiş məni,
Ey güləndamım, fəraqın biqərar etmiş məni,
Mübtəlayi-möhnəti-sədgunə xar etmiş məni,
Təneyi-şəmşir çəkib əğyar, zar etmiş məni,
Ey gözü cəllad, əli peyvəstə qan, gəl, vəqtdir.

Yığdılar bazari-eşqi əhli-sevda, getdilər,
Dərdü qəm tərkin qılıb, pakü müərra getdilər,
Qaldılar bidərdilər, həmdərdi, həmta getdilər,
Gördülər dəhrin vəfasın, cümlə hər ca getdilər,
Rövnəq arayiş olub, bazari-dünya getdilər,
Vamiqi-qərqi-bəla, Fərhadi-şeyda getdilər,
Vərqəvü Gülşa ilə Məcnuni-rüsva getdilər,
Dözməyib ol firqətə Şirinü Leyla getdilər,
Bir dəxi dövran dönüb Yusif, Züleyxa getdilər,
Qoydular Məchuru tək, məzlumi tənha, getdilər,
Ey gözəllik mülkünün təxtinə xan, gəl, vəqtdir.

## A R İ F   Ş İ R V A N İ

*XVIII əsr Şirvan şairlərindəndir. S.Mümtaz onun Lahıcdan olduğunu və Şirvanlı Mustafa xan dövründə yazıb-yaratdığını müəyyənləşdirmişdir. Aşiqanə qəzəlləri və həcvləri məlumdur.*

### QƏZƏLLƏR

Aləmin məmurəsin hər gündə bir sultan tutur,
Nikibəxt ol kəs ki, ol məmurəni viran tutur.

Gah məliki-mülk həft iqlimə bir məmluk olur –
Gah, onun hökmüni yüz min sahibi-fərman tutur.

Gah bir hinduyi-müqbil əl tapar Çin mülkünə,
Gah bir Rumi sərasər xitteyi-İran tutur.

Gah olur məhrəm hərimi-vəsldən məhrum olur,
Gah bəzmi-vəslə məhrəm guşeyi-hicran tutur,

Bəzmi-dövran xali qalmaz, hər gələn durmaz, gedər.
Ey bəsa, bu bəzmidə Arif yerin nadan tutur.

* * *

Tutan kuyində məskən həsrəti-baği-İrəm çəkməz,
Görən bir gəz səni, ömründə hərgiz dərdü qəm çəkməz.

Ləbindən busə hər kim alsa əl-ömri-əbəd billah,
Zülali-Xizri yad etməz, xəyali-Cami-Cəm çəkməz.

Tamaşayi-fəzayi-gülşəni-kuyin edən aşiq,
Keçər başından, amma ol tamaşadan qədəm çəkməz.

Cəfalərdir mana əğyardən, cövrü sitəm səndən,
Mana rəhm eylə kim, bunca bəni-adəm sitəm çəkməz.

Deyirlər tərk qıl yarı ki, aləm oldu əğyarın,
Düşən sevdayi-eşqə, aləm əğyar olsa qəm çəkməz.

Dəma-dəm ahü fəğan eyləməkdən halımı, Arif,
Nə bilsin ol kim, etməz ahü ah, dəm-bədəm çəkməz.

* * *

Əbləh oldur ki, cahan mülkündə daim qəm qılar,
Ey xoş ol kəs, bivəfa dünyayə rəğbət kəm qılar.

Öz qəmin hərgiz yeməz, dərviş əgər dana ola,
Ahi-nadan padişahə daim ğəmi-aləm qılar.

Kafirəm dünyavü mafihayə gər meyl eyləsəm,
Xanlığa, sultanlığa rəğbət məgər adəm qılar.

Kim ki, görsə yar-kuyin, cənnət etməz arizu,
Hansı kafirdir ki, cənnət xahişin bir dəm qılar.

Arifin könlü olur dərhəm pərişan zülf tək,
Hər zaman zülfinə canan şanəni məhrəm qılar.

* * *

Xudaya, mən düşən dərdə, sən əğyarı giriftar et,
Mənim tək yar yanində, xudavənda, onu xar et.

Mana rəhm etməz ol, dərd üzrə dərdim artırır gündə,
Onu bir dərdi-bidərmanə, mən kimi giriftar et.

Məni məhrum qıldı yarımın rüxsarına yüz gəz,
Onu bari ilahi daima məhrumi-didar et.

Mənim hər ləhzə eylər bağrımı qan ol sitəmpişə,
Onun yarını əğyar kimi, ya-rəbbim, siətmkar et.

Ömrdən qalsa gər bir ləhzə Arif, özgə fikr etmə,
Onu sərfi-duayi-izdiyad ömri-dildar et.

* * *

Hərimi-bəzmi-vəsli-yarə məhrəm çün rəqib oldu,
Mana ol bəzmdən məhrumluq daim nəsib oldu.

Durub dərdimə mən dərman tələb qıldım təbibimdən,
Üzün döndərdi məndən, səlbi-aramü şəkib oldu.

Mənə can qəsdin eylər, müddəilər kimsə rəhm etməz,
Kimə izhar edim kim, düşmənim axir həbib oldu.

Gözüm hər ləhzə əğyarı görər, bağrım dönər qanə,
Vətəndən əl götürmək həsrət ilə ənğərib oldu.

Ömürlər sərf edib, canlar verib canadən ötrü,
Yetişdi kamına əğyar, Arif binəsib oldu.

* * *

Könül sirrinə hər kəs məhrəm olmaz,
Və gər nə, olsa, yüz min qəm, qəm olmaz.

Müqərrərdir mənə həqdən bəlalər,
Bəlayi-nagəhan məndən kəm olmaz.

Əsiri-dərdi-bidərmani-eşqəm,
Anınçün bir zəman dil xürrəm olmaz.

Səba çəkdi əyağın, ol səbəbdən,
Mənə qəmdən səvayi həmdəm olmaz.

Olan məhrumi-bəzmi-yar, Arif,
Əziza, bəzmi-vəslə məhrəm olmaz.

## QƏSİDƏ

Ey mənə tənə vuran Mustafa xani-Şirvan,
Bax bu dibaçeyi-məzmunum eşit, ərzimi qan.

Bu necə fikr idi ol kim, məni xoşhal etdin,
Bilmədim noldu səbəb, aqibətin oldu yaman.

Bu necə lütfü ətadır, bu necə qəhrü qəzəb,
Sabit et, varsa günahım, elə ədlilə divan.

Mən əgər etdigim iqrarimə inkar oldum,
Hökm qıl, boynumu vurdur, sana canım qurban.

Ər kişinin sözü mərdanə gərəkdir olsun,
Sahibi-rütbə olan şəxsdə olmaz yalan.

Kimiyadır nəzərin, surəti-əhvalına bax,
Hər gədazadələrə verməgilən şövkətü şan.

Bir məsəldir ki, gəda oğlu gədazadə olur,
Başına cıqqa qızıldan vura, olmaz sultan.

Sana ixlası olan dostun edərsən məhrum,
Nəzəri-mərhəmətin özgəyə var bi-payan.

Məni əclaf görüb, ğeyri-xəyal etməgilən,
Mahi-nov qaidəsidir, olur üç gün üryan.

Gənci-bəhrimdə mənim dürri-cəvahir çoxdur,
Bu xiridarə gərək talibi-sərrafi-cahan.

Çəkməyincən sədəfin cinsi ki, barani-bahar,
Qədrü qiymət tapa bilməz ana dürrü ğəltan.

Alicaha mənim eybim budu: Şirvanliyəm,
Yoxdu ərbabi-kamal içrə vəzirü xaqan.

Sədri-məclisdə mana laf vuran kəs çoxdur,
Şəxsi-bir kimsənədir sahibi-mərdi-meydan.

Bu səxavət ki, sənin var, bu vəzirü bu nəzir,
Kərəmin cuşə gələ, Hatəmi eylər dərban.

Bir nəfər şəxs bu dərgahdə var əslinəcib,
Eşik-ağası Ağa bəy, özü tək yoxdu cavan.

Hacıya Kəbə qənim oldu ki, gəldi qapıya,
Həcər-ül əsvədi sevda eləyir, yoxdu alan.

Vələdi-Ağa Səlim Mirzəli, ərzayi-həkim,
Ələ düşməz belə məluni-ləinü şeytan.

Baxma şeytan sözünə, qövlü anın batildir,
Həzrəti-Adəmi yoldan çıxarıb bi-iman.

Bu vilayətdə mənim zərbimi hər kim ki, tutar,
Özü bicdir, anası …, atası rəhban.

Mənim həqqimdə sana hər kişi bəd-guluq edər,
Nəslini puç eləsin batini-şahmərdan.

Mundan artıq danışam, pərdeyi-batin açılır.
Ki, gərək olmaya naməhrəmə bir sirr əyan.

Dadrəs hakimsən, ğürrə yetiş, eylə nəzər,
Hiç kimin rəyi-içən dönmədi çərxi-dövran.

Bu qədər … xərabata ki, bel bağlama çox,
Neçə İskəndəri mənzildə qoyub sərgərdan.

Noldu Kavusilə Key-Xosrovu Cəmşid ilə Cəm,
Hikmətü dəbdəbeyi-tənteneyi-Nuşirəvan.

Hind, həm Rum, Dağıstandan alan bacü xərac,
Ciqqeyi-Nadiridən qalmadı asari-nişan.

Fikri-üqba elə bu şövkətə məğrur olma,
Məsnədü təxti-Süleymanı qılıbdır viran.

La-şəriki-əhədü qadiri-yekta özüdür,
Cümlə müşküllər açan ismi ğəfuru rəhman.

Saxlasın hifzi-amanında səni rəbbi-cəlil,
Düşmənin zillətilə xakilə olsun yeksan.

Qəsəm ol xaliqi-yektayə, ana zahirdir,
Çox riyazət çəkirəm, möhnət ilə çıxdı bu can.

Ya mana rüsxəti ver, bir də cahan kəştə olum,
Zəhrimardır mana bu şəhrdə bir parçə nan.

Mirzə Cəfər ola Şirvanidə çavuşbaşı,
Gəncədə rəqsə gəlir, qəbrdə ol Şeyxi-zaman.

Bu nə namus, bu nə qeyrət, bu necə himmətdir,
Sən məni ac qoyub, qeyrə edirsən ehsan.

Həqqə mürvətdimi bir parça çörəkdən ötrü,
Öldürürsən məni, axırda olursan peşman.

Tutaram bəndi-yaxa çaki-giriban ollam,
Xətmi-peyğəmbər olan dəmdə qurulmuş mizan.

Səndən əhval tutar saqiyi-yövmül-məhşər,
Çəkilir taqəti-nitqin, dəxi qalmaz imkan.

Arifa, bəndədən əl çək, sığın, Allaha pənah,
Mustafa vasitəm, ilahidən allam fərman.

# AĞA MƏSİH ŞİRVANİ
(? – təqr. 1766)

*XVIII əsrin tanınmış şairi Ağa Məsih Şirvani Şamaxının Dədəgünəş kəndində doğulmuşdur. Füzuli ədəbi məktəbinin davamçılarından biri olmuş, dövrünün görkəmli şairi Nişat Şirvaninin təsiri ilə yaradıcılığa başlamış, xalq şeri ruhunda əsərlər yaratmışdır. Şeirləri XVIII əsrdə geniş yayılmış, XVIII-XIX əsrlərdə Azərbaycan şairlərindən bir çoxu Ağa Məsihiyə bənzətmələr yazmışdır* (*M.P.Vaqif, Q.B.Zakir, M.Ə.Sabir və s.*)

*Klassik ədəbi üslubda qəzəllər, müxəmməslər və s. yaratmışdır. Xalq şeri üslubunda yazdığı qoşmalar ağızdan-ağıza keçərək geniş yayılmış, XVIII-XIX əsrlərdə tərtib olunmuş cünglərə daxil edilmişdir.*

## QƏZƏLLƏR

Könül, ixlas tutmaq bivəfa cananə müşküldür,
Həqiqət bilmiyəndən dağ çəkmək canə müşküldür.

Yaman gün düşmənindir, yaxşı gündə yari-həmdərdin,
Yemək namərd ilən nanü nəmək mərdanə müşküldür.

Müjəm mənzuməsi zəbt edə bilməz əşk seylabın,
Həsarü sədd çəkmək bəhri-bipayanə müşküldür.

Nedim bərbad olur, yoxdur dağılmış könlümün yarı –
Ki, şahi olmuya mülkün, qalar viranə, müşküldür.

Yanarsan eşq oduna şəm tək rovşən degil sirrin,
Məsiha, qeyrilə xasiyyəti-pərvanə müşküldür.

* * *

Aşiqə təlimi-yar feyzi-bəşarət verir,
Hər necə gül bülbülə, dərsi-fəsahət verir.

Ol səhi qəd, püstələb gülşənə olsa rəvan,
Qönçəni dilxun edər, sərvə xəcalət verir.

Düzəx odu söylənir, şiddəti məşhuridir,
Canda fəraq atəşi özgə hərarət verir.

Çərxə vəfa bağlama, eyş edə gör vəqt ikən,
Vədə irişsə əcəl sanma ki, möhlət verir.

Əmməyə mümkün ola gər ləbi-dildaridən,
Çeşmeyi-heyvan kimi gör necə ləzzət verir.

Gövhəri-nəzmin Nişat, düşsə Məsih əlinə,
Rayici-bazar edib, aləmə şöhrət verir.

* * *

Köksümdə könül işrəti-peykanım üçündür,
Cismimdə bu can, ülfəti-qurbanın üçündür.

Şirin hərəkat iylə çıxıb cilvə qılınca
Hey-hey, nə gözəllər gözü heyranın üçündür.

Torpaq kimi gər olmuş isəm yollara yeksan,
Qurbanın olum, tutmağa damanın üçündür.

Mən eyləmə pərvanə kimi başına dönsəm,
Binaylığım tələti-rəxşanın üçündür.

Boynumda qolum minnəti kim qamətim əydi,
Peyvəstə tutub qarşı sənaxanın üçündür.

Təşrifi-həyayi-əbədi hər kimə yetməz,
Bu xələt ona yetdi ki, fərmanın üçündür.

Kimdir diləməz mərhəmi-lütfin ki, Məsiha,
Çərx üzrə dəxi xəstə o dərmanın üçündür.

## MÜXƏMMƏSLƏR

İki aləmdə gözəl bəhsin qılan hala gərək,
Hər xərabati-muğanat içrə bipərva gərək.
Arifi-sahib-nəzər gəzmiş ola dünya gərək.
Nazəninlər bəzmini seyr eyləmiş bina gərək.
İntixab içrə bu nisbət şuxi-bihəmta gərək.

Əvvəla şəkk olmuya zati-əbavi-cəddinə,
Demiyə bir kimsə hərfi-namünasib rəddinə,
Yetmiş on dörd gecəlik ay tək büluği-həddinə,
Çün şəbi-yelda qəra saçı bərabər qəddinə,
Həm mübarək başı misli-qübbeyi-Mina gərək.

Üzü güldü, bərgi-gül təki yanaği alü tər,
Burnu zanbaq qönçəsi, manənd kuçik ətrivər,
Həm zənəxdanları çahi-Yusifi-əhli-nəzər,
Ləbləri həmvar, nazik, ləlü dürdən bəhrəvər,
Ağzı eyni püsteyi-xəndan kimi guya gərək.

Dişləri incuyi-qəltan, bəlkə dürri-bimisal,
Gahi-gah etsə təkəllüm tökülə şəhdi-zülal.
Dili şirin, sözü şəkər, sovti yekraq, xoş məqal.
Eyliyən dəmdə təkəllümlər qıla tutini lal,
Ləhceyi-göftarəsində əndəlibasa gərək.

Qırmızısı-qırmızı, qarəsi-qarə, ağı-ağ,
Həm zəğən tərkibli, pakizə məşrəb, xoş buxaq,
Gərdəni əndək uzun, yəni çiyinlərdən iraq,
Müttəsil bir köynək ət, nə çox arıq, nə xeyli çağ,
Alçaq olmaq yey deyil, qəddi boyu bala gərək.

Həlqeyi-çeşmi müdəvvər, ucları əndək diraz,
Almış ola hər qıya baxmaqda min təlimi-naz.
Səhveyi-ruxsarəsində xali-hindu hiyləbaz,
Xoş həya ismətinşanü müdrükü fəhmidəraz,
Aqilü agahü halü hər işi əla gərək.

Alnı altından sərəndazı ura bir növi bərq,
Etməyə sübhün tiluundan anı bir kimsə fərq,
Əhli-dil, mürği-səhər tək eyləyə gördükdə zərq,
Sünbüli-sövdayi-zülfü bəhri-sövdasinə qərq,
Misli-zənciri-cinunluqda olan rüsva gərək.

Nəstərən gül tək qulağı rövnəqi-fəsli-bahar,
Misli-şəbnəm, tər yanağda cuyi-dürri-şahvar,
Çatma qaşı yaya nisbət qəsdi-can etmək mədar,
Qəmzələr xunrizi-qatil, navüki peykan səvar,
Sürməli göz məst, saqi tək qədəhpeyma gərək.

Sinəsi gen, təxteyi-taqim kimi nərmü səfid,
Nani-şəkkər kimi püstan tuşeyi-rahi-ümid.
Sərv qədd, şimşad qol, bel incə, qurşaq natəbid,
Əl yədi-bəyzavü barmaqlar hilali-növrəsid,
Hər olan dırnaqları əncüm sifət bərca gərək.

Söylədin varın, Məsihə, müxtəsər eylə kəlam,
Tapmıyan bu tövr göyçək etmiyə dəva gərək.

* * *

Ey mənim canım alan, səndə nə adətdir bu?
Rəhi-insaf deyil, bəlkə ədavətdir bu,
Hasili-ayinə tək təbi-küdurətdir bu,
Mənə hər yerdə deyirsən: “Necə xiffətdir bu”,
Bari, ey zalimü yağı, nə mürüvvətdir bu.

Rəhi eşqində sənin var müsibət, bilirəm,
Verəcəkdir mənə bu xeyli üquvvət, bilirəm,
Bu cəfadən özümə qəbri fərağət bilirəm,
Belə dirlikdən isə ölməyi minnət bilirəm,
Dolanım başına, öldür ki, məhəbbətdir bu.

Getdi könlüm nəzəri-mahvəşi-dünyayi,
İntiqam ilə gözüm sən ki, büti-zibayi,

Səbəb oldur ki, verirsən mənə istiğnayi,
Demək olmaz sənə bu siffət ilə hərcayi,
Tanrı islah qıla, bari, təbiətdir bu.

Dili-suzanıma, bəsdir, bu qədər vurduğun ox,
Neməti-vəslin ilə eylə bu ac didəmi tox,
Bax bir Allahə, məni-zarə cəfa eyləmə çox,
Mənə bir sənsən, aradə dəxi bir maneə yox,
İltifat eylə, gözüm, guşeyi-xəlvətdir bu?

Məsihəm, öz əlim ilə oda saldım özümü,
Tikmişəm qapuna manəndeyi-həlqə gözümü,
Sürtərəm fərşi-ğübarə qədəm ilə yüzümü,
Səni görcək ki, dəmadəm deyə bilmən sözümü,
Çəkilir qüvveyi-nitqim, nə əlamətdir bu?

* * *

Dila, etmə təvəqqe rastguluk qanda qalmışdır?
Qərinə özgədir, onlar keçən dövranda qalmışdır.
Nəməkdə qədrü qiymət, nə kəramət nanda qalmışdır.
Nə asari-şəfa bimar üçün dərmanda qalmışdır.
Bəla çəkməkligə nə tabü taqət canda qalmışdır.

Həvali kimsələr bəhri-həramə misli-yelkəndir,
Nə yan olsa çəkər məllah, nəfsin kəştisi təndir,
Dolanır dövri-zülmət sahili-insafdən gendir,
Nə fərq edən həlali dari-dünyada müəyyəndir,
Nə xofi-axirət xəlq içrə bir insanda qalmışdır.

Tutan məlum yox şəri-rəsuli, əmri-Allahı,
Rəiyyətlər qılırlar dəstigir beş gündə bir şahi,
Çələbdir şiveyi-ləfzi bu rumuzun, yoxdur agahi,
Sədaq oxu kimi gəc təbilər tutmuş nəzərgahi.
Olar kim doğrudur, əgri qılınc tək yanda qalmışdır.

Olubdur qəlb xain, həq bilir bir saf tiynət yox,
Düşəndə satmıyan dinara dinin hiç millət yox,

Ünas əhlində bir zərrə hicabü şərmü ismət yox,
Zükur əqsamının təbində əsla əhdü beyət yox,
Nə tövri-adəmiyyət yolda, nə ərkanda qalmışdır.

Məsiha, kəs təməllüq bu cahandan kim xəsarət var,
Nə təsiri-dua zahir ərənlərdə, nə hümmət var,
Nə alimlərdə şəriyyət, nə xanlarda ədalət var,
Nə bir doğru sözü xəlqin, nə bir kəsdə dəyanət var.
Həqiqət aşinada, nə vəfa yaranda qalmışdır.

* * *

Eşidin etdiyini Şahsevən Əhməd xanın,
Xahişi-zülmünü ol zalimü biimanın,
Yox imiş zərrəcə şanında mürüvvət anın,
Qıldığı aləmə cövrü sitəmin dünyanın,
Nə qədər olsa olur baisi nahəq qanın.

Qanda idi ona əvvəldə belə rütbeyi-xub?
Rəşdilər verdi, bəsi eylədi Nadir mənsub,
Döndü andan yazıb ətrafa xəyanət məktub,
Qıldı iqbali-bədi leşkəri-sayi məğlub,
Qaçdı dağın qumuğun, bəklədi Dağıstanın.

Anda həm durmadı ol başı qara, nikbəti şum,
Oldu əndişeyi-nahəqlər ilə azimi-Rum,
Qıldı Xotkara bilavasitə ərzin məlum,
Bəxşişi-bihəd anın isminə oldu mərsum,
Şəhdən açıldı qapısı kərəmi-ehsanın.

Və dəxi malını Xotkarın alıb etdi fərar,
Bilmədi qədri-nəmək, tutmadı ol yerdə qərar,
Tazədən qıldı yenə, suyi-Dağıstana güzar,
Verdi yəğmayə olan malını ol dəm nə ki var,
Özünün bəxti-güdazinə salıb talanın.

Qıldı Surxayın evin soməə, misli-dərviş,
Taki dövrani-fələkdən necə vaqe ola iş,

Haq gətirdi nəzərə ölməgi Nadir şəhi piş,
Kim cilus eylədi Adil şah olub xeyrəndiş,
Mülkü təxtini təsərrüf qılıban İranın.

Surxay oğluna töküb xəlvəti yüz tərh xəyal,
"Yetürüm şahə özüm, ver mənə bir vəqt məcal,
Bu hökümət mənə mənsub olur əvvəlki misal,
Alıram bəyliyi Şirvan ilə bihədd sənə mal,
Bəlkə sərkarlığın külli-Azərbaycanın".

Gəh Qumıqdan enib öz məqsədinə getdi rəvan,
Oldu ellər yığıban sakini-ölkeyi-Muğan,
Qıldı Sərdarə hər ənva ilə yüz qulluq əyan,
Eylədi hasil özün hakimi-mülki-Şirvan,
Oldu ixlas ilə bəylər bəyi Əmiraslanın.

Çıxdı avazə ki, Təbrizə gəlir Adil şah,
Əmiraslana buyurmuşdurur əfvaci-sipah,
Ağsu qələsini tərk edib ol ruyi siyah –
Ki, Muğana keçib oldu qəmu işdən agah,
Yazdı Adil şaha: "Əmr et nə isə fərmanın".

İbrahim şah, Əmiraslan gətirib ikisi zur,
Dəstigir eyliyibən etdilər Adil şahı kur,
Aldılar əldə olan malü büsatın məqdur,
Oldu mərcə bu ikisinə həm əsbabi-ümur,
Görəlim dəxi nədir gərdişi bu dövranın.

Bir tərəfdən bu olub yaği Əmiraslana,
Verdi ol ölkələri çapqına vü talana,
Tab qılmadı döyüş mənzili-Sarı xana,
Qırılıb sındı vü qaçdı Talışü Gilana,
Girdi cəngəldə kəsib yollarını hər yanın.

İbrahim şah ki, öldürdü Əmiraslani,
Qıldı tabe özünə məmləkəti-İrani,
Tapdı fürsət bu, varıb eylədi pabus ani,

Anə həm rahi-xəyanət tapıban pünhani,
Qaçdı eldən-elə keçdi qolunu Səlyanın.

Şirvanın torpağına gəldi o xayin bir çaq,
Var idi xəlqin arasında küdurətlə nifaq,
Cümləsi olmuş idi bir-birinin üzünə ağ,
Yeri xali görübən bəklədi kuhü yaylaq,
Birbaşa basdı əlin çöllərinə Şirvanın.

Hacı xan eylədi hərçənd fəqanü fəryad:
"Mayeyi-fitnədürür kim bu haramzadə fəsad,
Rəfi lazımdır ola olmadan aşubi ziyad".
"Əkrəmüzzeyf" hədisini qılıb bəzisi yad,
Dedilər: "Hər nə isə hörməti var mehmanın".

Qıldı sərkar Səfərəli bəy ülfətlər ona,
O ki var lazimeyi-səy ilə xidmətlər ona,
Yeməkü içməyi verməkdə məhəbbətlər ona,
Oların qəsdinə tapıldı xəyanətlər ona –
Ki, uzatdı olara tənə dilin ölkanın[1].

Qaldı bir qədr süluk oldu arada var gəl,
Olmadı əvvəl ayaqda qoyan əl üstünə-əl,
Zahirən azmış idi ol qanı dolmuşa əməl,
Deyilir aləmarə türfə misaldır bu məsəl:
"Yaxşılıq başı götürməz bu yaman insanın".

Bir olub Şahsevən Əhməd xan hər baisi-şər,
Səlyanü Baki, Muğan, külli-Qumuqu yeksər,
Qələnin üst yanın bağladı Qasım səngər,
Ona asanlıq ilə şərh müti olmasa gər,
Qeyrə xəlqin dağıda varını xanimanın.

Hər iki-üçdə urub qələyə xəlvət çapavul,
Hacıxan ilə çıxır bir neçə bəyzadə vü qul –
Ki, olur hasili-mərdanə döyüşlər sağü sol,

[1] Ölkənin

Yetişər qətlə, başarmaz qayıdır xarü məlul,
Bu gün olmadı deyər fikrin edər fərdanın.

Bu imiş məqsədi hər iş ona dilxah olsun,
Badkubə, Qubba, Qumuq, İlusu agah olsun –
Ki, bu Şirvan yıxılıb hər dəmü dəsgah olsun,
Xəlqi ram eyliyibən cıqqa vurub şah olsun,
Sonra qəsdinə dura ol İbrahim Mirzanın.

Şirvanın xalqına bunlar əsər etdi qayət,
Xanü divanbəyi, soltan, vəkil etdi qeyrət.
Yazdılar namələr ətrafa gələ bir millət:
"Nə bizə, kim yetişir cümlənizə bu xüffət,
Dəfini ölmək edər beylə qəmü tuğyanın".

Gəldi Hacı Çələbi xan, Cavanşir dəxi zud,
Ərəş, Ağdaş, Quba, Xançobanı, Səda zud,
Lahıc, Houz, Qıssalı, Bəlakən on çe ki bud,[1]
Daxili-qələ yanında olan ellər mövcud,
Şıxmüzəydən aşağa basdı üzün səhranın.

Rəcəbin on doqquzu, şənbə günü oldu yeriş –
Ki, bular səngərin ətrafın alıb ta görə iş,
Gəldi Əhməd aşağa, qoşunu ilə pəsü piş,
Zahirən kim, o pəlidin əcəli yetmiş imiş,
Vurdu yol, gəldi qılıncına şəhi-mərdanın.

Qələnin gündoğanında qurulub meydanlar,
Müjdeyi-cəngə nisar oldu olacaq canlar,
Laləzar eylədi Ağsu çölünü al qanlar,
Kimidən nifrət edər, kimə dönür dövranlar,
Bəxti nadidə qalır bəzi dili-viranın.

Öydü kim özünü bibak misali-Rüstəm,
Yeddi-səkkiz top edib yerbəyer açdırdı ələm,
Badikübə qoşunun, Mirzə Məhəmməd xan həm,

[1] O ki var

Pişi-cəng eylədi Məmmədrza xanı ol dəm,
Dəstəsi birlə alıb durdu onun meydanın.

Durdu üç topla bərabərdə sipahi-Şirvan,
Qarşıda zənburəki top, ələm feyzi nişan.
Biri Hacı Çələbi, Həmzeyi-dövrani-cahan,
Biri nayibi-Pənah xan və biri Məmədəli xan,
Birisi dəxi Hacı xani-əzimüşşanın.

Buyuran tək Hacı xan çərxəçilər etdi savaş,
Dəstəyi-Xançobanı əvvəlki-cəng etdi təlaş –
Ki, Məhəmmədrza xan gəldi basıb bağrına daş.
Biri Ağa Rza bəy, Ağakişi eylədi baş,
Gəldi Əhmədxan və "yazıq – dedi – qardaş canın".

Birbəbir eylədilər Ağarza üstə hücum,
Oldu aradakılar toz arasında mədum,
Fili-sərxoş kimi hər yana dolayıb xortum,
Tökdülər nizə-qılınc hər tərəfindən məlum,
Necə başına döyər dəmirçi ol zindanın.

Bir yanında tərpədib Əbdürrəhman soltan at,
Bəlkə sərkar Muradxan bəy və bəzi qazat,
Dəsteyi-Xançobanı müttəfit etdi hərəkat –
Ki, bayaq eylədi şənlik bu ki həqq verdi nicat,
Yara Əhmədxan alıb döndü cilavi anın.

Çünki Qurban bəyü minbaşı ba çənd nəfər,
Aldı səngər önünü saxlamaq üçün bisər,
Dəxi Cəfər bəgü Zahid bəgü pansənd başılər,
Hər biri mərəkədə yüz belə meydanlara ər,
Özgədir cürəti illah o Məlik ağanın.

Topçubaşı Əlibəy tiz rovu tünd süvar,
Bu Məhəmməd Rza bəy miraxurbaşı ki, var,
Həm Hüseynəli bəyü Kamil cəng ilə mədar –
Ki, bular düşmənini gah yolar şahinvar,
Yarıban bağrını qanın axıdar ədnanın.

Dəxi Hacı Çələbi oğlu, həm Ağakişi bək,
Xəlqi də, ordusu da biri-birindən yegrək,
Ara qarışdığı dəm çərxəçiyə getdi kömək –
Ki, nə mümkündür anın döyüşünü dildə demək,
Yoxdurur nami-xuda tayı o bihəmtanın.

Tanrıverdi bəyü Yəqub ilə etdi tifaq,
Qoymadılar olara tuş gələn düşməni sağ,
Möhtəsib talıb ağa çərxəçi qarışdığı çağ,
Atı oynadığı çağ, özünü qürtardı bayaq,
Sağ çıxmağı onun lütfi idi mövlanın.

Əlisultani Məlikzadeyi-ölkəyyi-Ərəş,
Gündoğandan yeriyirdi deyəsən şəhrə günəş,
Cəmi-Ağdaş salıb vurhavurü kəşha-kəş.
Xaçmazü Bumu qılıb düşməni qərqi-atəş,
Dud tutdu üzünü mehri-həmən Aranın.

Neçə Dərbənd igidi, adları ismi-Şamxal,
Şah pabusuna getmək idi təmhid xəyal,
Afərin, onlara şahın çörəyi ola halal,
Bir tərəfdən həm olar, vermədi ədayə macal,
Çaşdırıb səhmü sədasından oxu peykanın.

Hacı xan taleinə lütfi-ilah ola mədəd,
Bağladı adəmara yəni İskəndər kimi sədd,
Tərpənən tək elədi kəlləsini topnan rədd,
Şahsevən sındı vü üz qaçmağa tutdu bihədd,
Kəsdi səngər yolunu, yeddi Ağamoğlanın.

Vari Əsgər yeridi baydaq açıb rəngarəng,
Düşmənə ruzi-təəddi elədi Ərsəni təng,
Vardı namərd qaçaq, mərd qılıb qeyrətü nəng.
Badikubə qoşunu xanı ilə haləti-çəng,
Dözmədi gülləsinə Səfərəli soltanın.

Mənzili-hərb də Əhməd xan alıb üç yarə,
Özü vurulubani düşdü qoşun avvarə,

Aparan meyyidini gördü ki, yoxdur çarə,
Buraxıb bir dərəyə rast gəlib bunlarə,
Kəsdilər qaraca başın o həsud ədanın.

Şahsevən verdi nəhiq ata ki, çıxsın tələdən,
Bəlkə başın alıban qurtula bu məşğələdən,
Qıla pünhan əsirdən, dəxi yükdən, şələdən,
Arxadan getdi qoşun saxladı malu gələdən,
Aldı qarşısını qaytardı elin-obanın.

Qapıçı Əhməd bəy eylədi bir türfə əda,
Aldı Məmmədrza xanın olan əsbabını ta,
Yetdi Eyvaz bəyə ol cəngdə bir özgə həva –
Ki, bular yengi yetişəndi qəmu nami-xuda,
Olacaq yavəri Kazım bəyi-bi-pərvanın.

Mərdə tapşırdı kəsər sidqilə namərdi yola,
Bu məsəldir: "Boşalar, bəlli ki, hər kasə dola".
Gedə baş ölkələrə, həm cəsəd atıla kola,
Belə ölməkdən o kafir necə həzz etdi ola? –
Ki, onun həşri ilə həşri qopa tərsanın.

Talei şumdur onun ki, belə işləri var,
Şəhri-Dərbənddə çıxmaq yeddi yüz göz izhar,
Qətlü ölkəyi-Muğan, Cisridə həm kəllə minar,
Ağsu Allahdadı təhlukə sam nigar,
Sarı xan eyliyə fərqin o qədər nöqsanın.

Ağzı çaxırlı həmişə, özü məstu məxmur,
Mayili-büdət işi aləm ara fisqü-fücur,
İsməti-rahi-ədəb, şərmü həyadan dəxi dur,
Eyni madər: bəxəta nütfə, həramü mənfur,
Oğulu necə olur beylə ata-ananın?

Ki, bu çox fəthdurur, bilməsin aqil bunu kəm,
Şahsevən birlə Muğan on iki min el həşəm,
Leşkəri-pil tənan səhmdən eylərdi dəjəm,

Kimi qərq oldu Kürə, kimisi də çaylara həm,
Kimi azuqə olub nəhənginə dəryanın.

Bu imiş məqsədi alsın ələ Dağıstanı,
Qolunun zərbi ilə tabe edə Şirvanı,
Özü səhrada gəzə, zəbt qıla ölkanı,
Fəsli-xərməndə belə tələb edə buğdanı.
Qalmadı hörməti bir arpaca bu buğdanın.

Ol igidlər ki, qəmu tiğzənü sahibi-şəst,
Qoydu əl dəstəyi-şəmşirə elə dəstbədəst,
Necə ki, Əhməd xanın eylədilər adını pəst –
Ki, bular verdilər ol Rüstəmi-dövranə şikəst,
Acizəm etməyə tərifini bu dastanın.

Ey Məsih, eylədi həqq mərhəməti birlə nəzər –
Ki, bu xeyriyyət ilə xaru zəlil oldu əgər,
Kimə isə belə dövlət olacaq idi məgər?
Dəmü saət, gecə-gündüz, dəxi həm şamü səhər,
Necə şükr etməyəlim qüdrətinə Yəzdanın.

## MÜSTƏZAD

Ey şövqi-rüxün gün kimi əşyayə mücəlla,
Üşşaqə tamaşayi-camalın fərəhəfza.
Mənidə rümuzi-dəhənin elmi-müəmma,
Sən kimi tapılmaz büti-ziba sənəm, əsla!
Hər ziyb sənə süni-xuda birlə mühəyya,
Dəxi nə bəzənmək.

Məşşatə nə lazım sənə, ey afəti-dövran –
Kim, ayinəni eyləyəsən hüsnünə heyran,
Nazik yüzünə, qazi nigah etsə düşər qan,
Təpsin gözünə sürməsini əhli-Sifahan,
Çeşmi-siyəhin kim ala hər işvədə yüz can,
Dəxi nə bəzənmək.

Bəzm içrə yüzündən götürən dəmdə niqabın,
Qanını ləbin şişəyə tutdu meyi-nabın,
Başına həva gəldi qədəhlərdə hübabın,
Bitab düşüb saqi, nə mümkün verə tabın,
Yıxdın evini mən kimi yüz xanəxərabın,
Dəxi nə bəzənmək.

Basanda qədəm naz ilə seyr etməyə bağə,
Ruyin gülü səhrayə qovub, laləni dağə.
Gər bərgi-həna düşsə əcəb yox əl-ayağə.
Şayistə degil ağ vərəq al yanağə,
Gündüz günə bənzər, gecə mehtabi-çirağə,
Dəxi nə bəzənmək.

Ey tazə lətafət çəməni içrə güli-tər,
Olmaz bu nəzakət belə hər şuxə müyəssər,
Bi-lütf verir qeyri-vəfakar mükərrər,
Təbdili-libas olsa deyil məni-sərasər,
Nəqqaşi-qəza kim, sənə vermiş belə zivər,
Dəxi nə bəzənmək.

Ey qaməti sərvü ləbi qönçə, rüxi lalə,
Gəz mərdüməki məhv yüzündə xətü xalə,
Zülfi-siyəhin mah yüzün dövrünə halə,
Peyvəstə qaşın tənə urar göydə hilalə,
Kim görsə deyər "Səlli-əla" böylə cəmalə!
Dəxi nə bəzənmək.

Nitqində Məsiha dilər asari-məqalət.
Ol Xizr kimi abi-dəlilə rəhi-zülmat.
Səndən aparır feyz bədən mürdeyi-mirat.
Heyhat, bu növ ilə nəzirin ola, heyhat!
Mehtab kimi aləmə məqbulluğun isbat,
Dəxi nə bəzənmək.

## TƏRCİBƏND

Ey türfə nigar, mahi-ruxsar,
Ey huriliqa, fəriştəkirdar,
Bu hüsn ilə olmamışkən izhar,
Oldun məni-dilşikəstəyə yar,
Bilmən necə hiylə qıldı əğyar,
Sonra səni məndən etdi bizar.
Bəs indi sözüm budur ki, təkrar:
Bir ad ilə et məni günahkar.
Xalq eyləsə tənə eyləmə ar,
Qanımı həlal qıldım, ey yar!
Al dəstinə tiğ, durma, zinhar,
Öldür məni, olsun əllərin var!

Ey hüsnü camalı mahi-parə,
Əhvalıma qılmasan nəzarə,
Yar oldu rəqib sən nigarə,
Oldun mənə yaği varə-varə.
Saldın məni ahi-pürşərarə.
Yox məndə rizadan özgə çarə,
Rəhm etsən əgər məni-fikarə,
Salmaz məni qəm bu ruzigarə.
Xəlvət özünü çəkib kənarə,
Bir könlünə eylə istixarə,
Təqsirimi söylə aşikarə,
Öldür məni, olsun əllərin var!

Ey rəngi-üzari şöleyi-nur,
Qilmanə misal, nisbəti-hur,
Bir şux ki, oldu hüsnə məğrur,
Çox olmaz anın ədası mənzur,
Gəl sən dəxi qılma fitnəvü şur,
Etmə özünü bu tövrim məşhur,
Ta vəslidən eylədin məni dur,
Ancaq ki, budur dilimdə məzkur:
Üftadeyi-eşqə eyləmə zur!

Qoyma məni dərd evində rəncur.
Xublarda əgər bu isə dəstur:
Öldür məni, olsun əllərin var!

Ey şah, qapında bir gədayəm,
Yad etmə məni ki, aşinayəm.
Kuyində əgərçi xaki-payəm,
Bil qədrimi, eyni kimiyayəm,
Əfsürdeyi-dərdi-bidəvayəm,
Sərgəşteyi-vadiyi bəlayəm.
Hərçənd ki, eşqə mübtəlayəm,
Əhvalı şikəstə, binəvayəm,
Sirrini desəm üzü qərayəm,
Baş ilə ayağına fədayəm.
Bu məsləhətə ki, mən rizayəm:
Öldür məni, olsun əllərin var!

Ey qətlimə eyliyən iradət,
Məqsuduna yetgilən səlamət!
Açılsa əgər bu bağı-rəhmət –
Kim hasil olur mənə bəşarət
Qalman məni namürad rahət.
Dəxi haçan eylərəm şikayət?
Səndən bunu istərəm nəhayət:
İqrarına olma bidəyanət!
Can məndə səninkidir əmanət,
Al, sonra ki, çəkməyim xəcalət.
Düşməz ələ dəxi böylə fürsət:
Öldür məni, olsun əllərin var!

Ey gül, desələr Məsihə: "Qafil
Bir özgə nigarə oldu mayil".
Təhqiq elə kim, dolansa yüz il,
Səndən dəxi qeyrə verməzəm dil.
Ərzim bu ki, eyləmə təğafil,
Bir ğurə yetiş, günahimi bil!
Cəm et neçə əhli-halü aqil,

Onlardan həqiqət eylə hasil –
Kim, şərə həmin budur müqabil,
Mən həm oluram bu əmrə qayil,
Gördün neçə şahid oldu adil:
Öldür məni, olsun əllərin var!

## TÖVBƏNAMƏ

Sənə zahirdir, əya, heyyi-xəbirü dana,
Olsa hər mazivü müstəqbəlü məxfi peyda.
Qul şəhindən eliyən cürmü yaşurmaq nə rəva?
Əfv qıl, eyləmişəm çox qələtü səhvü xəta.
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Qoymaz öz halıma şeytan, qoyi nəfsi-şum,
Nə tutam zümreyi-təqvadə ibadətə nüzum,
Feli-bəd birlə tamam etdiyim işlər məlum,
Məni – biçarəni etmə kərəmindən məhrum,
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Olmuşam mayili-həmsöhbəti-bəzmü badə,
Daima həm nəfəsi-mütribü sazü sadə,
Axirət layiqi iş tutmamışam dünyadə,
Bu iki misrəi rəhmət söyləyən ustadə:
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Vay, torpaq mənim başıma, küllər gözümə,
Bilirəm mən nə cəfa eyləmişəm öz-özümə,
Köksümə həsrət əliylə döyərəm, gah dizimə,
Var ümidim, açasan tövbə qapısın üzümə,
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Vay o gündə yaxamdan ki, tuta dəsti-əcəl,
Ola nazil mələkəlmövt və tədbiri-əzəl.
Qəbzi-ruh eyliyə şiddət ilə varib çəkə əl.
Xəcilləm etməməyimdən sənə şayistə əməl,
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Can gedə, düşə cəsəd, həm qala azu çox mal,
Çəkə varis hərə bir yanə, qala müzd vəbal,
Qoyalar qəbridə münkirü nəkir edə sual,
Fayda verməz və əlqissə peşimanlıq o hal,
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Gəzmişəm şamü səhər cəhlü xəyanət bilə mən,
Etmişəm sərf tamam ömrü bu halət bilə mən,
Durub əylənməmişəm şivei-taət bilə mən,
Necə varım sənə bu növi-xəcalət bilə mən?
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Suri, ol dəmdə ki, əmrinlə çala İsrafil,
Dağılan ruh edə hər biri öz əzasına meyl,
Kim ki, ruhu tuta hər kəs belə bir tövr səbil,
Bir hidayət məni-zarə o zaman eylə dəlil,
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Fövc-fövc onda gedər şamə ki, əhli-ərasat,
Cümlə boynunda kəfən, kəllədə göz məxluqat,
İstidən başda beyin, olmaz ayaqda hərəkat,
Dilərəm iczlə səndən mədəd ol vəqtə nicat,
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Sən olub qazi şəfaətçi bəniu mədəni,
Payi-mizanidə hazır ola əlavü dəni,

Baxıban nameyi-əmalə xəfif etmə məni,
Üzrməndəm, bilirəm məlcəi-ümmid səni,
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Ola divan bilinə, cümlə günah ilə səvab,
Sorula hər nə sirat üzrə olan şeyxü şəbab,
Köçə mömin, qala asi, qıla maliklər əzab,
Edə bilmən ələmi-düzəxə bu vəch ilə tab,
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

Tutma mənzur əgər tutmuş isəm kari-zeşt,
Ənbiyayi-həşəri eylə həşrim ilə ağeşt,
Cənnətilər ki, haman fəsl olur azimi-geşt,
Məsihə mərhəmətin birlə nəsib eylə behişt.
Tövbə, yarəbb, xəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilmiyib etdiklərimə.

## TƏXMİS

*Nişat Şirvanidən*

Sevmişəm ta səni ey müğbeçə, xəndan degiləm,
Yüzü gül kimi açıq çaki-giriban degiləm.
Lalə tək dağım əgər var, nümayan degiləm.
“Qeyri səndən dəxi bir özgəyə heyran degiləm,
Mayili-sərvü gülü bağі-gülüstan degiləm”.

Küfri-zülfünə bu imanımı nəzr eyləmişəm,
Qədinə ömri-firavanımı nəzr eyləmişəm.
Payinə dideyi-giryanımı nəzr eyləmişəm,
“Rahi-eşqində dilü canımı nəzr eyləmişəm,
Hər cəfa eylər isən eylə, peşiman degiləm”.

Salma gözdən məni-hicranzədəni, yad elə gah,
Bəd günündə qulunu yada salar rəhmli şah,

Səni tari, necə fəryad qılıb etməyim ah,
"Aşinasən yetənə məndən edərsən ikrah,
Sənə mən qurban olum, mən məgər insan degiləm?"

Mən ki, öz aşiqinəm, dövr edirəm ta gendən,
Qeyrilər məhrəmi-bəzmin dəxi pirahəndən,
Necə dad etmiyim, ey dilbəri-kafər səndən –
"Ki, müsəlman bilibən nifrət edirsən məndən,
Sənə aşiq olalı mən də müsəlman degiləm".

Məsihəm, olsa əgər üzri-günahım bihədd,
Var ümidim kərəmindən ki, xuda qılmıya rədd,
Sirri-eşqin deməNəm hər yetənə ta bə əbəd,
"Dili-pürqüssə Nişatəm, yüz əgər olsam bəd,
Sən kimi zalimü bimürvətü biman degiləm".

## B A B A   Ş İ R V A N İ

*Baba Şirvaninin yaradıcılığı XVIII əsrin ikinci yarısında Azərbaycan şerində özünü göstərən realist meylləri təzahür etdirir. Şairin həyatı haqqında məlumat yoxdur. Dünyəvi mövzulara daha çox meyl göstərən "Can ilə Cəsədin bəhsi" əsərində müəllifin dövründə gedən dünyəvi ədəbiyyatla dini ədəbiyyat arasındakı mübarizə öz ifadəsini tapmışdır.*

### CAN İLƏ CƏSƏDİN BƏHSİ

Bir gün bəhs eylədi Can ilə Cəsəd,
Can dedi Cəsədə – iman yaxşıdır.
İstərisən əgər arif olasan,
Zəbur, Tövrat, İncil, Quran yaxşıdır.

Cəsəd dedi Cana – doğru deyirsən,
Mən də ki, bilmişəm iman yaxşıdır.
Qılıncım, qalxanım, bir də bir atım,
Qolumda qüvvətim, meydan yaxşıdır.

Can dedi Cəsədə – istəmə meydan,
Neçə sənin kimi getdi pəhləvan,
Rüstəm, Gərşasib, Samü Nəriman,
Dəxi bu sevdadan usan, yaxşıdır.

Cəsəd dedi Canə – düşməm xəyaldan,
Hələm kef eylərəm dövləti-maldan.
Nökərdən, nayibdən, oğuldan, quldan,
Sürəlim dünyada dövran yaxşıdır.

Can dedi Cəsədə – yoxumuş arun,
Dövləti neylədi Harunü Qarun?
Məgər kim, heç yaduva düşməyir tarun?
Onun birliginə inan, yaxşıdır.

Cəsəd dedi Canə – həqq olmaz razı,
Necə tərk eyləyim söhbəti, sazı?
Geyərəm bəy rası şali-qırmızı,
Görməyə dostü vü düşman yaxşıdır.

Can dedi Cəsədə – qılma bu sözü,
Yezid də taxtında geydi qırmızı,
Qırdı imamları, puç oldu özü,
Qaldı məhşərəcən peşman, yaxşıdır.

Cəsəd dedi Canə – peşman olmanam,
Bir güləm ki, saralmanam, solmanam.
Heç kimsənin nəsihətin almanam,
Hər kəsənin özü bilən yaxşıdır.

Can dedi Cəsədə – eylə əlacı,
Bir gün olluq ayrılığın möhtacı.
Əzrayıl çəngəli, zəhərdən acı,
Yatmısan qəflətdən oyan, yaxşıdır.

Cəsəd dedi Canə – ölüm varimiş,
Məndən başqa kəslər xəbərdarimiş.
Bu fahişə dünya biilqarimiş,
Mən elə bilmişəm cahan yaxşıdır.

Can dedi Cəsədə – rəbbim-əhəda,
Sirat ül-müstəqim vardır arada.
Nari-cəhənnəmə yannuq əbəda,
Eyləyim istiğfar-qüfran yaxşıdır.

Cəsəd dedi Canə – əstəğfürüllah,
Bəxş eyləsin Allah, həqq Rəsulüllah,
Əmirəlmöminin ya vəliyüllah,
Başım üstə Şahi-mərdan yaxşıdır.

Can dedi Cəsədə – gəldin əmanə,
Səni götürmüşəm rahi-ərkanə,
Xülusi-qəlb ilən girdin imanə,
Gəl gedək, cənnəti-rizvan yaxşıdır.

Cəsəd dedi Canə – Allahü əkbər,
Xatəmün-ənbiya saqiyi-kövsər.
On iki kimsə var dilimdə əzbər.
Baba da olara qurban yaxşıdır.

# XƏSTƏ QASIM

*Təbriz yaxınlığındakı Tikmədaş kəndində anadan olmuşdur, Aşıq şerinin qüdrətli ustadlarından olmuş, Şərq poeziyası sirlərini də dərindən bilmişdir. Nəsihətamiz-əxlaqi şeirləri ilə şöhrət tapmış, ustadnamələri bir sıra dastanlara daxil edilmişdir. Öz yaradıcılığı ilə aşıq şerinin inkişafına ciddi təsir göstərmişdir.*

## QOŞMALAR

Usta, məni gözlərinə fəda qıl,
Səndən saz istərəm, amma saz ola!
Dindirəndə imran dillə danışa,
Şeyda bülbüllər tək xoşavaz ola!

Yamanı yamana, yaxşını mərdə,
Tərifini edim hər düşən yerdə.
Dolaşmaya simlər, vurmaya pərdə,
Gözəllər tək onda işvə, naz ola!

Xəstə Qasım, sözüm söylərəm əyan,
Elə car eylərəm bəyanbəbəyan.
Qiymətin soruşsan, tamam on tümən,
Nə ondan çox ola, nə də az ola!

* * *

Ay ağalar, gəlin sizə söyləyim,
Əzəl yaxşı olar, yar aşnalığı.
Sən sevəsən, yarın səni sevməyə,
Olar bülbül ilə xar aşnalığı.

Bağban odur zəhmət çəkə, əlləşə,
Saldığı bağ çiçəkləşə, gülləşə.
Əgər gücsüz güclü ilə güləşə,
Olar tərlan ilə sar aşnalığı.

Xəstə Qasım qəm əlindən məst ola,
Əhli-dərviş xırxasında pust ola,
Bir adam ki, loxma ilə dost ola,
Olar yağış ilə qar aşnalığı.

* * *

Tərifli gözəllər gəlhagəl oldu,
Yaşıllı, zərbaflı, allı Sənəm, gəl!
Ovçunu görəndə maral baxışlı,
Ay üzü birçəkli, xallı Sənəm, gəl!

Aşıq odur bir söz desin özündən,
Aləm bada gedər ala gözündən.
Danışanda şəkər damar sözündən,
Qaymaq dodaqları ballı Sənəm, gəl!

Xəstə Qasım deyər: hənək hənəkli,
Ağ üzündə qoşa xallar bənəkli,
Ətlas nimtənəli, ipək köynəkli,
Üstü başı tirmə şallı Sənəm, gəl!

* * *

Bir nazənin sevdim məktəbxanada,
Haqq kəlamın dil əzbərdən oxurdu.
Əlinə almışdı eşqin kitabın,
Mənim dərsim dil əzbərdən oxurdu.

Mən tanıram öz yarımı nəfəsdən,
Ol səbəbdən könlüm düşməz həvəsdən.
Tavus kimi səda verər qəfəsdən,
Bülbül kimi xoş dəftərdən oxurdu.

Xəstə Qasım kömək dilər mövladan,
Naz qəmzəsi aşıqları aldadan,
Həya eylər, hicab eylər molladan,
Gah yavaşdan, gah hündürdən oxurdu.

* * *

Qəriblikdə mənə həmdəm olan yar,
Bir bəri gəl, ayaqların qurbanı.
Şikəstə könlümə məlhəm olan yar,
Dilin, dişin, dodaqların qurbanı.

Könlüm istər yara qurban olmağa,
Dolanıb başına, heyran olmağa,
Ala gözlü yara mehman olmağa –
Fərş döşənmiş otaqların qurbanı.

Xəstə Qasım, sən yolundan azarsan,
Məcnun kimi səhraları gəzərsən,
Ala gözlü yara namə yazarsan,
Qələmdanın, barmaqların qurbanı.

* * *

Bir gözəl sevəsən boyu tamaşa,
Görən kimi könül ona bənd ola,
Gözəlliyi, gül camalı bir yana,
Dil-dodağı şəkər ola, qənd ola.

Bir gözəl sevəsən qaməti bəstə,
Görəndə aşiqi eyləyə xəstə,
Çoxdan axtarıram bir elə kəs də,
İşarə anlaya, dərdimənd ola.

Mən Qasımam, əl götürməm canandan,
Canan qarşı gəlsə keçərəm candan.
Rəngi artıq ola güldən, reyhandan,
Zülfləri boynuma bir kəmənd ola.

* * *

Üç gündür çıxmışam o Tikmədaşdan,
Qapına gəlmişəm canım əlimdə.
Ayağın torpağı, qovma qapından,
Sızıldaram giribanım əlimdə.

Şeyda bülbül kimi yaman ağlaram,
Sinəm başın düyünlərəm, dağlaram.
Ləzgi[1] kimi yüz aşığı bağlaram,
Əgər olsa süxəndanım əlimdə.

Xəstə Qasım, kəsilibdir xitabım,
Qızılgül tək çəkilibdir gülabım.
Büllur qaşlı, qızıl üzlü kitabım,
Yoxdur zərli qələmdanım əlimdə.

* * *

Köhnə Şamaxının seyrin eylədim,
Əl dəyməmiş təzə bağlar qalıbdı.
Elə köçüb gedib ulusu, eli,
İşlənməmiş ağ otaqlar qalıbdı.

Fələk, şad könlümdən alma həvəsi,
Ayırma yarımdan, tutaram yasi,
Necə oldu bu seyvanın yiyəsi?
Dərd-qəmi var, tamam ağlar qalıbdı.

Xəstə Qasım idim, şaha deyili,
Çərxi-fələk, səndən mənəm gileyli,
Elə köçüb gedib bivəfa Leyli,
Bircə Məcnun, bir də dağlar qalıbdı.

* * *

Yaxşı fikir elə, qafil dolanma
Qəlbini şeytandan yad elə, insan!
Halal yaşa, bir kimsədən utanma,
Yıxma könülləri, şad elə, insan!

Dünya dediyin bir fanidir, fani,
Əzəl Nuh gəlmişdi, görünmür, hani?
Yola saldı İskəndər tək xaqani,
Bizə də əsəcək bad elə, insan!

[1] Ləzgi Əhməd

Xəstə Qasım, düşünməyin bihuşdu,
Bənadam dediyin vətənsiz quşdu.
Səxasız dövlətin axırı puçdu;
Ye malın, dəhanda dad elə, insan!

* * *

Dəli könül, məndən sənə əmanət,
Demə bu dünyada qalım yaxşıdı.
Bir gün olar, qohum, qardaş yad olar,
Demə ulusum var, elim yaxşıdı.

Bir məclisə varsan özünü öymə,
Şeytana bac verib, kimsəyə söymə,
Qüvvətli olsan da yoxsulu döymə,
Demə ki, zorluyam, qolum yaxşıdı.

Qoçaqdan olubsan, qoçaq olgunan,
Qadadan, baladan qaçaq olgunan,
Aşıq ol, comərd ol, alçaq[1] olgunan,
Demə, varım çoxdur, pulum yaxşıdı.

Xəstə Qasım, kimə qılsın dadını?
Canı çıxsın, özü çəksin odunı,
Yaxşı igid yaman etməz adını,
Çünki yaman addan ölüm yaxşıdı.

* * *

Obalarımız səf-səf olub yüklənir,
Başı ala qarlı dağlar, qal indi.
Biz içmədik abı-kövsər suyundan,
Soyuq sular, tər bulaqlar, qal indi.

Bivəfasan, heç görmədim vəfan, yar,
Tifil ikən çox çəkmişəm cəfan, yar,
Mən öləndə kimlər sürər, səfan, yar,
Fərş döşənmiş ağ otaqlar, qal indi.

[1] Sadə

Bivəfasan, vəfan yoxdu dünyada,
Aşnanın sirrini verərsən yada.
Şamamanı dərdirərsən xoryada,
Səbzə-bostan, sarı tağlar, qal indi.

Xəstə Qasım, tamam oldu sözlərim,
Eşq ucundan kabab oldu gözlərim,
Qərib yerdə, yad ölkədə gözlərim,
Vətən deyib ağla, ağlar qal indi.

* * *

Bir elə kişinin tut ətəyindən,
Bil sənə imdadı ol eylər-eylər.
Zərrəcə üstündə olsa nəzəri
Yerdən daş götürsən, ləl eylər-eylər.

Böhtan demə, böhtan tutar adamı,
Qul eylər, bazarda satar adamı.
Cəhənnəm odundan betər adamı
Yoxsulluq yandırar kül eylər-eylər.

Aqil insan deməz hər gördüyünü,
Daldalar düşməndən vay dərdiyini,
Görməzsən nakəsin pay verdiyini,
Versə də, töhmətin bol eylər-eylər.

Xəstə Qasım deyər sözün bu başdan,
Pay umma qohumdan, yaddan, qardaşdan,
Özün əmək çəksən, su çıxar daşdan,
Əridər dağları yol eylər-eylər.

* * *

Dörd dərviş istərəm, Əhmədi-Ləzgi,
Dünyanın boyunca yaşı bir ola.
Yeməz, içməz, zikri-şükür eyləyər,
Onların kəlməsi, işi bir ola.

Bir otaq istərəm, gümüşdən kanı,
Onun kərpicini gətirən hanı?
Bir heyvan istərəm qırx iki canı,
Başı qoltuğunda, döşü bir ola.

Bir nər istəyərəm götürə dağı,
Ovsarını çəkə Əliynən Nağı,
Altmış min bostanın, yetmiş min tağı,
Səksən min binanın daşı bir ola.

Xəstə Qasım deyər: neçə min neçə,
Səksən min darvaza, doxsan min küçə.
Bir alim istərəm bu sirri seçə,
Hər biri min kəlmə, başı bir ola.

* * *

Neçə qəhrəmanlar gəldi dünyaya,
Köç vaxtı yetişdi, tez oldu getdi.
Rüstəmin zərbindən titrədi dağlar,
Düşdü dastanlara söz oldu getdi.

Hakimlik eylədi, çox uzun vaxtı,
Bütün kainata Süleyman baxdı,
Tərsinə döndü şah Cəmşidin taxtı,
Firudinin dərdi yüz oldu getdi.

Necoldu Keykavus, hanı Keyqubad,
Hansı bu dünyadan almışdı murad?
Allahlıq eylədi Fironla Şəddad,
Nəmrudun qalası düz oldu, getdi.

İskəndər Daranı taxtından saldı,
Cahana şah gəldi, sonu nə oldu?
Yarı yolda öldü, Misirdə qaldı,
Qasım kimi yandı köz oldu getdi.

* * *

Dəli könül, nə divanə gəzirsən,
Bivəfa dilbərdən sənə yar olmaz.
Düz çıxmaz ilqarı, əhdi, peymanı
Hərcayıda namus, qeyrət, ar olmaz.

Üz vermə nadana, sirr vermə pisə,
Axır qəlbin ya inciyə, ya küsə,
Ot bitər kök üstə, əsli nə isə,
Yovşan bəsləməklə çəmənzar olmaz.

Vəfalıya əmək çəksən itirməz,
Bədəsil nəsihət, öyüd götürməz,
Qabaq tağı tər şamama bitirməz,
Göy söyüddə heyva olmaz, nar olmaz.

Təklif olunmamış bir yerə varma,
Nər olmaz meydanda hər bığıburma,
Seyraqıb adama sən yaxın durma,
Xain çıxar, onda düz ilqar olmaz.

Xəstə Qasım günü keçmiş qocadı,
Gələn bəzirgandı, gedən xocadı,
Sərv ağacı hər ağacdan ucadı,
Əsli qıtdı, budağında bar olmaz.

* * *

Yeri gözəl, yeri, sənə qarğaram;
Ölənədək işin ahu-zar olsun.
Siyah zülfün dar gərdəndə sərasər,
Halqa-halqa, çinbəçindən mar olsun.

Gözəllər içində giryan olasan,
Yanasan odlara, büryan olasan,
Vəfalı yarlara qurban olasan,
Onlara baxanda sənə ar olsun.

Mən qurbanam yaxşıların muyuna,
Hündür qamətinə, gözəl boyuna,
Sənin soyun dönsün sonsuz soyuna,
Gül açmasın bağçanızda, xar olsun.

Ay qız, bir kəs bilməz sənin sirrini,
Qiyamətdə yandırsınlar dərini,
Yatan vaxtda şahmar vursun ərini,
Naləsindən qulaqların kar olsun.

Xəstə Qasım dost yolunda qalanda,
Əl uzadıb qol boyuna salanda,
Kefin durulanda, könlün olanda
Bizə gələn ayaqların var olsun.

* * *

Mən gedirəm sizi kimə tapşırım,
Dam üstündə duran sona kəkliklər.
Al-yaşıl geyinib, tirmə bağlarsız,
Nə girmisiz dondan-dona, kəkliklər.

Fərə kəklik daş başında səs eylər,
Qaqqıldaşıb bir-biriylə bəhs eylər.
Heç bilmirəm, toymu eylər, yas eylər,
Əllər batıb qızıl qana, kəkliklər.

Kəkliyin ovlağı qayalar başı,
Qaqqıldaşıb tapar yoldaş yoldaşı,
Bərəsi bərk olsa, ovçusu naşı,
Uçub gedər ol asimana kəkliklər.

Gözəl kəklik dam üstündə durubdu,
Gərdən çəkib, necə boynun burubdu.
Heç bilmirəm ovçusunmu görübdü,
Üz tutdular biyabana kəkliklər.

Hər ikiniz yaşıl başlı sonasız,
Mənim gizli dərdim pünhan qanasız,
Ayrılıq, sağlığınan qalasız,
Qasım gedir Dağıstana, kəkliklər.

* * *

Ay ağalar, gəlin sizə söyləyim,
Yalqız daşdan olmaz divar deyərlər.
Bəzirgansan, aç mətahın, xırd eylə,
Ararlar: yükündə nə var? – deyərlər.

Ovçu olan bəslər alıcı quşu,
Sərraflar tanıyar qiymətli daşı,
Bir oğul atadan artırsa işi,
El içində ona tavar deyərlər.

Qızılgülü dəstə-dəstə dərginən,
Dəribən də yaylıq üstə sərginən.
Hər nə versən öz əlinlə verginən,
Yüz qadanı başdan sovar deyərlər.

Neynirəm bir bağı, barı olmasa,
Alması, heyvası, narı olmasa,
Bir igidin dövlət-varı olmasa,
Yeləksiz ox kimi çovar deyərlər.

İskəndər atlandı, çıxdı zülmatdan,
Qasım, Xızr içdi abı-həyatdan.
Bəhs düşsə igiddən, qılıncdan, atdan,
Süfrəni hamsınnan kübar deyərlər.

* * *

Qəm əlindən şikəstəyəm, ovraqam,
Dilim eylər nalə indi, zar indi.
Xeyli vaxtdır camalına müştağam,
Soruş indi, danış indi, yar, indi.

Bizim yerdə naz çəkməyə tab olmaz,
Vallah, hüsnün kimi mahitab olmaz.
Şuxluğuyla məmələrə bab olmaz
Narınc indi, turunc indi, nar indi.

Mənim yarım illərətən sağ ola.
Dörd çövrəsi behişt ola, bağ ola,
Nə həddi var sədrin kimi ağ ola
Kağız indi, bəyaz indi, qar indi.

Bülbül olan hərgiz dönməz gülündən,
Dindirərsən bal tökülər dilindən.
Yeddi yerdən sarmaşıbdır belindən,
Xəbərdar ol, səni çalar mar indi.

Mən Qasımam, miskin-miskin baxaram,
Ümman olub dəryalara axaram,
Ah çəkəndə yandırıban yaxaram,
Dolanmasın gül yanına xar indi.

* * *

Ay ağalar, nakam getdim dünyadan,
Yarəb, mənim xanımanım necola?
Gövhərtək sözlərim, bayatılarım,
Ləbi-şirin süxəndanım necola?

Anam yoxdur, gözlərindən yaş tökə,
Halalım yox, sinəm üstə saç tökə,
Qardaşım yox, qəbrim üstə daş tökə,
Yarəb, mənim ağlayanım necola?

Hayıf ola, ağ biləklər, bazılar,
Ahum otlar ceyran ilən yazılar.
Qohumum yox, qardaşım yox, qazılar,
Yarəb, mənim hal-soranım necola?

Bu gen dünya üstümüzə dar ola,
Biz köçərik, yurdumuzda kim qala?
Əhmədimin gül əndamı sarala,
Mənim sərvi-xuramanım necola?

Mən Qasımam, daha qalmadı tabım,
Qızılgüldən çəkilibdir gülabım,
Cədvəl-kəş Quranım, qırx cüt kitabım,
Üstü zərli qələmdanım necola?

* * *

Tər getdim tər yarın tər xanəsinə,
Tər mehman, tər eylər, tər gülər Sənəm.
Tər xubdur, tər şuxdur, tər nazənindir,
Tər deyər, tər söylər, tər gülər Sənəm.

Tər zülfün, tər burmuş tər buxağında,
Tər bəyaz, tər əhmər, tər yanağında,
Tər şəkkər, tər damar, tər dodağında,
Tər tutub, tər dişlər, tər gülər Sənəm.

Tər qəmzən, tər xədəng, tər sinəsində,
Tər atmış, tər peykan, tər sinəsində,
Tər asmış, tər narın, tər sinəsində,
Tər dəyməz, tər saxlar, tər gülər Sənəm.

Tər çeşmi, tər cadu, tər fitnəlidir,
Tər lalə tər dərib tər tutmalıdır,
Tər miyan, tər gərdən, tər sonalıdır,
Tər durub, tər gəzər, tər gülər Sənəm.

Tər bülbül tər qonar tər budağında,
Tər Məcnun, tər gəzər, tər budağında,
Tər lalə tər bitər tər budağında,
Tər Qasım, tər dərər, tər gülər Sənəm.

* * *

O necə quş idi yaz gələr bağa,
Sinəmi çəkiblər düyünə, dağa,
Bir şana, bir bafta, bir də bir cığa,
Bu üçü bir olsa, teldə gizlənər.

O necə quş idi qayada səkər,
Caynağı nəştərdir, qanımı tökər,
Bir noğul, bir nabat, bir də bir şəkər,
Bu üçü bir olsa, dildə gizlənər.

O necə quş idi anasın əmər,
Havada dövr edər, şəms ilə qəmər,
Bir qılınc, bir xəncər, bir də bir kəmər,
Bu üçü bir olsa, beldə gizlənər.

Aladır gözləri şəhlayi-nərgiz,
Sənintək bir gözəl bulunmaz hərgiz,
Bir bulaq, bir hovuz, bir də ki kəhriz,
Bu üçü bir olsa, yerdə gizlənər.

Yar ki, yara şirin verər salamı,
Təbibimsən, özün bağla yaramı,
Bir oğru, bir əyri, bir də haramı,
Bu üçü bir olsa, kolda gizlənər.

Xəstə Qasım deyər, ləbi ballı qız,
Bir şirin göftarlı, üzü xallı qız,
Bir qələm, bir davat, bir də bir kağız,
Bu üçü bir olsa, əldə gizlənər.

* * *

Nə müddətdir həsrətini çəkirdim,
Zənəxdanı etdin mənə, al indi.
Talan salmış Hində, Bəlxə, Həbəşə,
O qaş indi, o göz indi, xal indi.

Məclisində al şərablar içilir,
Buxağından ətri-güllər saçılır,
Dindirəndə dəhanından açılır
Şəkər indi, nabat indi, bal indi.

Qurban olum ənisinə, elinə,
Zərnişan şəddəsin çalmış belinə,
Payəndazdır nazlı yarın yoluna
Bu baş indi, bu can indi, mal indi.

Yar geydiyi atlas ilə xaradır,
Məni qoyub özgələrə varadır,
Ay ağalar, mənim baxtım qaradır,
Kitab açdım, belə gəldi fal indi.

Xəstə Qasım, dost kuyinə varanlar,
Namus anlar, qeyrət anlar, ar anlar,
Hərf içində əlif idim, yaranlar,
Fələk əydi qəddim, oldum dal indi.

* * *

Qəriblikdə qamxarımsan, əzizim,
Yetirəsən bir də dosta nə məni.
İkidilli yardan həzər eylərəm,
Salır dildən-dilə, dastana məni.

Qarşı durdum Leyli dağı göründü,
Boyun tək sürahi sağı göründü;
Qoynunda şamama tağı göründü,
Bəs niyə qoymursan bostana məni?

Ağzını oxşatdım zənbura, şana,
Naşı bülbül qonar uçub gülşana.
Yar, qəmzənə sinəm tutdum nişana,
Bəs niyə vurmursan, qəsdən, a məni?

Mən Qasımam, uzaq atdın daşımı,
Didəmdən axıtdın qanlı yaşımı,
Dost yolunda mən qoyaram başımı,
Doğru qəbul etsə astana məni.

## GƏRAYLILAR

Ay həzarat, ay camaat,
Dağa qar düşdü, qar düşdü.
Özüm qaldım qürbət eldə,
Yada yar düşdü, yar düşdü.

Gedin deyin anasına,
Sığal versin sonasına.
Yar, sinənin arasına,
Bir cüt nar düşdü, nar düşdü.

Xəstə Qasım, qəm basdı,
Yar bizi zülfündən asdı.
Şeyda bülbül güldən küsdü,
Gülə xar düşdü, xar düşdü.

* * *

Gözəl səndə nə qaydadı,
Gedəni yoldan eylərsən.
Salarsan eşqin oduna,
Ulusdan, eldən eylərsən.

Mən ha billəm sən əttarsan,
Qənd ilə noğul satarsan.
Dəryalara tor atarsan,
Sonanı göldən eylərsən.

Gözəl nə bildin halımı,
Əyibsən qəddü-dalımı.
Mən Qasıma bu zülümü,
Kim eylərdi, sən eylərsən.

* * *

Yaxşı olar qohum, qardaş,
El başına dolandığım.
Harda görsən, yara yalvar,
Dil, başına dolandığım.

Budur gəldi bahar vaxtı,
Sinəm oldu yarın taxtı.
Soyuldu bülbülün raxtı,
Gül, başına dolandığım.

Qaşların qurar divanı,
Taxtdan salar Süleymanı,
Xəstə Qasımın canını
Al, başına dolandığım.

* * *

Gəl bir səndən xəbər alım,
Süleymandan qalan dünya.
Əzəli gül kimi açıb,
Axırında solan dünya.

De görüm nəyə talibsən,
Dərsini kimdən alıbsan?
Neçə min yol boşalıbsan,
Neçə min yol dolan dünya.

Xəstə Qasım qalıb naçar,
Bu sirri bəs kimlər açar?
Gələn qonar, qonan köçər,
Hey salarsan talan dünya.

* * *

Ay qəsrdə duran gözəl,
Niyə təksən, elin yoxdur?
Niyə pozğundu tellərin,
Əl şanada, telin yoxdur?

Mən gəlirdim dağdan-daşdan,
Sinəm yanır qəm-ataşdan,
Ayrılmısan yaşıl başdan,
Tək sonasan, gölün yoxdur?

Gəl dərdin Qasıma söylə,
Bağrımın başını teylə,
Qonağa xoş gəldin eylə,
Yoxsa, lalsan, dilin yoxdur?

* * *

İsfahanda bir dəllək var,
Baş qırxanda zol çıxarır.
Ətindən az-az götürür,
Dərisini bol çıxarır.

Ayağını qoyur qoşa,
Ülgücünü çəkir daşa,
Zərbi elə gəlir başa,
Tikmədaşa yol çıxarır.

Bir fitəsi vardır bezdən,
Durub gəlir səhər tezdən.
Yarı haqqın alıb bizdən,
Yenə acı dil çıxarır.

Ülgücünü çapışdırır,
Suyu tasdan qapışdırır.
Kəsir pambıq yapışdırır,
Başımızdan kol çıxarır.

Bu usta necə ustadı,
Həmişə gözü tasdadı.
Xəstə Qasım can üstədi,
Elə bilir pul çıxarır.

* * *

Nə baxırsan oğrun-oğrun,
Mənə biganələr kimi.
Durum dolanım başına,
Şama pərvanələr kimi.

Bağbanlar bəslər meyini,
Dönsün seyraqub löyüni.
Yıxıbsan könlüm öyüni
Top dəymiş qalalar kimi.

Gəl gedək Çinə, Maçinə,
Qurbanam zülfün ucunə,
Al məni qoynun içinə
İstəkli balalar kimi.

Dost qapısında dustağam,
Tellərinə çox müştağam.
Yar əlindən düyün, dağam,
Dağdakı lalələr kimi.

Xəstə Qasım Tikmədaşlı,
Könül qəmli, gözü yaşlı,
Göldən uçdu yaşıl başlı,
Silkindi sonalar kimi.

* * *

Bu zamanda, ilqar handa,
Aşnaları yad eylərlər.
Yeyərlər nanü-nəməki,
Beş gündə bərbad eylərlər.

Yaram sızlar, təbib naşı,
Didəmdən axıdır yaşı.
Yar yolunda verrəm başı,
Bilsəm ki, imdad eylərlər.

Mənim yarım fitnə qaşlı,
Cigərim tuğyan ataşlı,
Dostu qoyub gözü yaşlı,
Düşmənləri şad eylərlər.

Məcnun kimi divanəni,
Şəm yandırır pərvanəni.
Xəstə Qasım biçarəni,
Öldürübən ad eylərlər.

## QOŞMA-MÜSTƏZAD

Bir çarsıda dörd dərvişə uğradım,
Dördü bir-biriynən eylər ixtilat.
Dördünün də dili ayrı, dini bir,
İki də biz, onlarınan şəş cahat.
Əsl kainat.

Bir şəhərin gördüm padşahını,
Qulun, yasovulun hər dəsgahını,
Üç yüz altmış altı xoş süpahını
Onlar bir kişidən istədi sürsat,
Xoş çəkər səffat.

Altı, səkkiz, doqquz idi binasi,
Otuz cəlalı var, bəyaz sinəsi,
Altı min altı yüz məddü mənasi.
Ərəb idi, əcəm idi, türkü tat.
Bir ismə fəryad.

Altıdan qırxatan sərgərdən idi,
İki yüz otuzda özün tanıdı;
Altı min altı yüz pasiban idi,
Kimi yahu çəkər, kimi əsalat,
Kim edər fəryad.

İki dərya xoş görünmür gözünə,
İki qırx, dörd gəlməz ərin dizinə;
Xəstə Qasımın bu şerinə, sözünə
Qazı, molla, müctəhidlər qaldı mat,
Tapmadı kəlmat.

## TƏCNİSLƏR

Yatmışdım, üstümə gəldi bir pəri,
Yenə yar sevdası ha mayil oldu.
Dərdi-qəmim cana əsər elədi,
Qolların boynuma həmayil oldu.

Təbib görsün yaralarım, sinəm aç,
Öz əlinlə bu düyünüm, sənəm, aç.
Demiş idin, hər gün verrəm sənə maç,
Günüm aya döndü, həm ay il oldu.

Vardım dost kuyinə, səg sana durdu,
Dərdim tək bir ikən, səksənə durdu.
Qasımı görəntək səksənə durdu,
Gözəllər qəflətən həm ayil oldu.

* * *

Lal olur bülbüllər sovulanda gül,
Lalə libas geyinmisən, Sənəm, al!
Ləblərindir mənə abı-səlsəbil,
“La” demərəm, bir canım var, Sənəm, al!

Lazım olur yoxsul üçün bircə mal,
Leyli isən göstər, mənə bir camal,
Laf eyləmə, var, saqidən bir cam al,
Leysan çeşmim məni eylər sənə mal.

Aç süfrəni, hər məclisdə sini sal,
Oxu dərsi, lam, mimdən sini sal,

Bir o günü var, yadına sini sal,
Laşərikə yoldaş olmaz, Sənəm, al!

* * *

Bir gözəlin camalına mayılam,
Nə müddətdir gözəl məndən yayınur.
Mən qurbanam ağ üzündə o xala,
Zənəxdanın şöləgahı yayı nur.

Xəstə könlüm yar bəsləmiş, həmdərdi,
Dərd bilməzsə demək olmaz həm dərdi.
Bir igidin yaxşı olsa həmdərdi,
Qışı nurdur, yazı nurdur, yayı nur.

Xəstə Qasım bu ləzgini yaratar,
Çətin gündə çətin səni yar atar,
Üz çevirsə, müjgan oxun yar atar,
Əli nurdur, oxu nurdur, yayı nur.

* * *

Payız dərdim, qış möhnətim, yaz mənim,
Hicran tapdaq etdi yayılan məni.
Götür qələm, sərxəttimi yaz mənim,
Qoyma dərgahından yayılan məni.

Hüsn içində yar almısan, yar alım,
Soruşmadın, halın nədir yar alım.
Gəncin üstən götürmərəm yar əlim,
Ya əqrəb dişləyə, ya ilan məni.

Məhrum olmaz, şəcər qucub nar əmən,
Sənsiz getməm, behiştə mən, narə mən.
Təcüb qaldım, qoynundakı narə mən,
Niyə atar sərxoş, yay ilan məni?

Xəstə Qasım, gördü, əmanə gəldi,
Qəvvaslar dürr üçün əmanə gəldi,
Sinəm ox zərbindən əmanə gəldi,
Dəxi nə tapdarsan yayılan məni.

* * *

Bu iki sultan bir taxta çıxmış,
Ox atarlar bir-birinə çaphaçap.
Nazlı dilbər mənə sitəm eylədi,
Könlümün şəhrinə saldı çaphaçap.

Ağlaram didəmdən yaş, irin gələr,
Əmər ləblərindən ya şirin gələr,
Deyərlər, qəsrindən ya Şirin gələr,
Fərhad kimi vur dağları çaphaçap.

Xəstə Qasım deyər, yar dada gəlsin,
Eşqin atəşindən yar dada gəlsin,
Bir namə göndərim yar dada gəlsin,
Qurban ollam sənə, qasid, çaphaçap.

* * *

Gecə-gündüz ağlaram mən dərində,
Qocaltdı nalalar, ahular məni.
Yarəbim, bu dərdü nalam eşidib,
Gəlibdir qapında ahular məni.

Həkkak istər həkk etməyə qaimdir,
Həqiqətin qapısında qaimdir,
Çox yaxşıdır öz dinində qaimdir,
Cahil müsəlmanlar ahular məni.

Xəstə Qasım, kim yaraşır əğyara,
Bayqunu gör, məskən salmış ağ yara,
Bilmənəm ki, neyləmişdim əğyara,
Yatar, durar hər dəm ahular məni.

## CIĞALI TƏCNİSLƏR

Gözəllər gözəli, şahi-gülbədən,
Didəm ağlar məh camalın görüncə.
    Aşıq deyər: görüncə,
    Siyah telin görüncə.
    Get bir mərdə qul ol sən,
    Namərd üzün görüncə.
Mina gərdən, büllur buxaq, diş inci,
Çəkilibdi hilal qaşlar görüncə.

Kim yetikdir həqiqətin evinə,
Həqiqətin, mərifətin evinə,
    Aşıq deyər: evinə,
    Xanəsinə, evinə,
    Yağıb qəmlər yağışı
    Viran könlüm evinə.
Dolanmayın heç namərdin evinə,
Gözü çıxar bir qonağı görüncə.

Kim cahanda aşıq oldu a vara,
Dolandı dünyanı, qaldı avara,
    Aşıq deyər: avara,
    Məcnun gəzər avara,
    Uyma namərd felinə,
    Səni qoyar avara,
Xəstə Qasım, nə gəzirsən avara,
Ölüm yeydir bu günləri görüncə.

* * *

Həqiqət bəhrində qəvvasam deyən,
Qəvvas isən, gir dəryaya üzhaüz...
    Aşıq deyər: üzhaüz,
    Sonam göldə üzhaüz,
    Qarı düşmən dost olmaz,
    Yalvarasan üzhaüz.

Bir mərd ilə ilqarını vur başa,
Namərd ilə kəs ülfəti üzhaüz.

Parçalandı gəmim qaldı dərində,
Qərq oldu ümmana, qaldı dərində,
Aşıq deyər: dərində,
Dayazında, dərində,
Sidqi, qəlbi düz olan
Hərgiz qalmaz dərində.
Qismət olsa o mövlanın dərində
Üz döşəyək, səcdə qılaq üzhaüz.

Xəstə Qasım cananına can deyə,
Can danışa, can eşidə, can deyə.
Aşıq deyər: can deyə,
Vəfalıya can deyə,
Görmədim hərcayilər
Cananına can deyə.
Yox vəfalım, can deyənə can deyə.
Bivəfasan çək əlini, üzhaüz.

* * *

Səhər tezdən əzmi-gülşən elədim,
Qəm məni çulğadı, ay hayıf-hayıf!
Aşıq deyər: ay hayıf,
Kimlər oldu ay hayıf,
Sən ilə mən sevişdim,
Ayrı düşdüm, ay hayıf!
Bağban oldum, bağ bəslədim çifayda,
Dərmədim gülünü, ay hayıf-hayıf!

Sərrafın dəstində nə danə gördüm,
Mürğü dəhanında nə danə gördüm,
Aşıq, nə danə gördüm,
Xalın nə danə gördüm,
Tülək tərlan tuş oldu
Axır nadanə gördüm.

Gövhəri verdilər nadanə gördüm,
Bilmədi qiymətin, ay hayıf-hayıf!

Oxudum dərsimi, çıxdım yasinə,
İyid olan ixlas bağlar yasına.
            Aşıq deyər: yasına,
            Namərd boynun yasına,
            Nanəcibə söz demə,
            Ya inciyə, ya sına.
Qasım ölər, dostlar gələr yasına,
Eşidənlər deyər: ay hayıf-hayıf!

## AŞIQ ABBAS TUFARQANLI

*XVII əsrin məşhur ustad aşıqlarındandır. Cənubi Azərbaycanın Tufarqan qəsəbəsində dünyaya gəlib. Həyatı haqqında məlumata əsərlərində, şeirləri əsasında yaradılmış "Abbas və Gülgəz" dastanında rast gəlirik. İncə lirik şeirlər yazmaqla bərabər, əsərlərində zəmanəsindəki zülm və ədalətsizliyi kəskin tənqid edib. Yaradıcılığında Azərbaycan təbiətinin gözəlliklərinin tərənnümü mühüm yer tutur.*

### GƏRAYLILAR

Duman, gəl get bu dağlardan,
Bahar gəldi, qar əylənməz.
Bu dünya bir bivəfadı,
Gözəldə ilqar, əylənməz.

Gözəlin qaşı qaradı,
Bayqunun meyli haradı?
Bu dünya karvansaradı,
Hər gələn qonar, əylənməz.

Abbas deyər hac olanda,
Kəbəyə merac olanda,
Doğru yoldan kəc olanda,
Namus gedər, ar əylənməz.

* * *

Gecə-gündüz qan ağlaram,
Göz yaşım ümmana getdi.
Şirin canım yar yolunda
Olmağa qurbana getdi.

Doymadım yarın dilindən,
Qucmadım incə belindən,

Aldılar yarı əlimdən,
Qarğana-qarğana getdi.

Hər nə oldu mənə oldu,
Qaynadı peymanəm doldu,
Desələr, Abbas necoldu?
Deyin, Tufarqana getdi.

* * *

Yenə gəlib bahar fəsli,
Süsən, sünbül, Məzə dağı,
Açılıb güllər, nərgizlər,
Bənövşələr bəzə dağı.

Siyah zülfləri hörünsün,
Dal gərdənində bürünsün,
Alçaq olsun yar görünsün,
Bir görünsün gözə dağı.

Bülbüllər uçdu gülümdən,
Oldum ulusu elimdən,
Abbas qara qul əlindən,
Qan ağlayıb gəzə, dağı.

* * *

Gecə-gündüz fəğandayam,
Mənəm eşqin natavanı.
Tarladaram mahalları,
Boş qoyaram bu meydanı.

Bilmirsənmi haralıyam?
Ağlı, göylü, qaralıyam.
Yüz yerimdən yaralıyam,
Sinəmdə zənbur nişanı.

Hökmünlə yazdım fərmanı,
Kim eylər dərdə dərmanı,
Pəriyəm, şahın qurbanı,
Abbassız istəməm canı.

* * *

Xəbər aldım təbrizlidən,
Məni hərcayi çağladı,
Viran bağlar xəzəl oldu,
Didələrim qan ağladı.

Bülbüləm, bağa qonaram,
Zərgərəm, gümüş yonaram,
Elə bu dərdə yanaram,
Xoryat söz məni dağladı.

Abbasam, yoxdu məkanım,
Sənə qurban şirin canım,
Ölkəmizdə Pəri xanım,
Sidqimi mövla bağladı.

* * *

Nə ağlarsan, nə sızlarsan,
Bir dərdi beş olan könlüm!
Axırda zünnar[1] bağlarsan,
Qəmə yoldaş olan könlüm!

Bir yar gəlir obasından,
Alım dərdü-bəlasından,
Çərxi-fələk badasından
İçib sərxoş olan könlüm!

Abbas ağlar arsız-arsız,
Dünya olub etibarsız,
Deyirdin, dözərəm yarsız,
Döz, bağrı daş olan könlüm!

[1] Burada "quşaq", "kəmər" mənasında işlənmişdir.

Oğrun yollara baxmaqdan,
Bağrım qan oldu, yar gəlmir,
Ağlamaqdan eynim yaşı,
Sel ümman oldu, yar gəlmir.

Mənim yarım boyu bəstə,
Dərdindən olmuşam xəstə,
Yəqin çıxıbdı taxt üstə,
Yoxsa xan oldu yar, gəlmir.

Dağların qarı söküldü,
Axdı, çaylara töküldü,
Abbas deyər, bel büküldü,
Qədd kaman oldu, yar gəlmir.

## QOŞMALAR

Qədir mövlam, budur səndən diləyim,
Görüm yarın ömrü yetsin yüz ilə.
Artıq ola malı, mülkü, dövləti,
Altmış nəri bir qatara düzülə.

Sədəf incə, dodaq incə, dil incə,
Canım çıxdı yar könlünü alınca.
Ölüm yeydi bu dünyada qalınca
Bir igid ki, qatarından üzülə.

Qaşlarına çəkilibdi, bil, qələm,
Ağız davat, göz mürəkkəb, dil qələm,
Yalan desəm çək gözümə mil, qələm,
Sənəd verrəm, qulun ollam yüz ilə.

Abbas deyər: dildəki hərf neçədir;
Neçə göhər, neçə ləlü neçə dür,
Sanamadım zülfün muyu neçədir,
Qorxuram ki, şanə dəyə, üzülə.

* * *

Özündən kiçiyi işə buyurma,
Sözün yerə düşər, heç miqdar olmaz.
Hər nə ki, kar görsən, əz əlinlə gör,
İnsan öz işində cəfakar olmaz.

Özündən böyüyün saxla yolunu,
Düşən yerdə soruş ərzi-halını,
Amanat, amanat qonşu malını,
Qonşu yox istəyən özü var olmaz.

Soruşun, qul Abbas, halın necədi?
Gündüzlərin ay qaranlıq gecədi,
Sərv ağacı hər ağacdan ucadı,
Əsli qıtdı, budağında bar olmaz.

* * *

Ay həzarat, bir zamana gəlibdi,
Ala qarğa şux tərlanı bəyənməz.
Oğullar atanı, qızlar ananı,
Gəlinlər də qaynananı bəyənməz.

Adam var ki, getməyəsən işinə,
Adam var ki, dolanasan başına,
Adam var ki, ayran tapmaz aşına,
Dindirərsən, yağlı nanı bəyənməz.

Adam var, dağları gəzir sərsəri,
Adam var, geyinər pustinən[1] dəri,
Adam var, mərfətdən yoxdu xəbəri,
Adam var, soltanı, xanı bəyənməz.

Adam var, dolanar səhranı, düzü,
Adam var, döşürər gülü, nərgizi,

[1] Pustin – kürk

Adam var, geyməyə tapammaz bezi,
Adam var, al geyər, şalı bəyənməz.

Adam var, çox işlər eylər irada,
Adam var ki, yetə bilməz murada
Adam var ki, çörək tapmaz dünyada,
Adam var ki, yağ yeyər, balı bəyənməz.

Adam var ki, adamların naxşıdı,
Adam var ki, anlamazdı, naşıdı.
Adam var ki, heyvan ondan yaxşıdı.
Dindirərsən, heç insanı bəyənməz.

Adam var, dəstinə verəsən güllər,
Adam var, gözünə çəkəsən millər,
Tufarqanlı Abbas, başına güllər,
Nə günə qalmısan, qarı bəyənməz.

* * *

Ağlaya-ağlaya düşdüm yollara,
Yar ayrısı dərdü möhnət, yara yüz.
Dərdim oldu əvvəlkindən beşbetər,
Şan-şan oldu qara bağrım, yara yüz.

Tutdum yar əlindən bəlkə sağalam,
Saqi məstü, saqi sərxoş, saqi lam,
Çətin, çətin bu yaradan sağalam,
Dərd bir oldu, dərman doxsan, yara yüz.

Mən Abbasam, yara qurban yar üçün,
Doğra bağrım, kəs ciyərim, yar üçün,
Yar oldur ki, bu dünyada yar üçün
Yaxa yırta, zülf dağıda, yara yüz[1].

---
[1] Üz

* * *

Başına döndüyüm alagöz Pəri,
Gahdan ağla, gahdan yada sal məni.
Qara bağrım şan-şan oldu, dəlindi,
Gahdan ağla, gahdan yada sal məni.

Bağban idim, bağım təğayir2 oldu,
Gözüm gördü, ağlım təğayir oldu,
Xoyat əli dəydi, təğayir oldu,
Gahdan ağla, gahdan yada sal məni.

Mən sənə can dedim, sən də mənə can,
Alış eşq oduna, mənim kimi yan,
Adım Aşıq Abbas, yerim Tufarqan,
Gahdan ağla, gahdan yada sal məni.

* * *

Ay camaat, gəlin tərif eyləyim,
Nə əcəb düşübdü yeri Dərbəndin.
İskəndər əlilə olub bərqərar,
Çəkilibdi bürcü, barı Dərbəndin.

Mən gəlmişdim bu Dərbənddə qalmağa,
Bir tülək tərlanı ələ salmağa,1
Düşmən öldürməyə, qisas almağa,
Qoçaq olur igidləri Dərbəndin.

Dərbənd dedikləri bağçadı, bağdı,
Alt yanı dəryadı, üst yanı dağdı,
Abbas deyər: əcəb meyvəsi çağdı,
Xəstəyə şəfadı narı Dərbəndin.

---

[1] Pozuldu
[2] Ələ keçirmək

* * *

Şikəstə könlümün məqsudu usta,
Bu Təbirizin sonaları necədi?
Tikilibdi çarşıları yanaşı,
Sarayları, binaları necədi?

Ərənlər üstümdə oldu nümayan,
Bir camal göstərdi, bəyan və bəyan,
Bir səf mələk gördüm, bir səf də qılman,
Dal gərdəndə siyahları necədi?

Müştaq oldum bir Pərinin tağına,
Canım qurban olsun xoş yanağına,
Mən Abbasam, girsəm xublar bağına,
Eyvan, otaq, xanaları necədi?

* * *

Gedər ikən bir ümmana tuş oldum,
Bəhrlər çalxanır, göl bu yandadı.
Boy gedər bir yana, buxaq min yana,
Cığa pərvaz eylər, tel bu yandadı.

Gülgəz dəli olub, yoxsa divana?
Üz çevirib gedir çöl-biyabana,
Burdan bir yol gedir ol Tufarqana,
Tamam qohum-qardaş, el bu yandadı.

Hökmün Malik Əjdər, ismindi Ədhəm,
Didələrin qan-yaş tökər dəmadəm,
Lütf eylə Abbasa, qibleyi-aləm,
Qadasın aldığım, yol bu yandadı.

* * *

Başına döndüyüm alagöz Pərim,
Apardın ağlımı, ay bu yanda dur!
Ağıl başda deyil, ruh da bədəndə
Eylədin tarimar, ay bu yanda dur!

Halaldandır mayam, bulunmaz haram,
Qırxlar məclisində bil mən də varam,
Seyraqub adamla heç olmaz aram,
Şeytandı, felindən ay bu yanda dur!

Abbasam, dövranım ay belə keçdi,
Dolandı ruzigar, ay belə keçdi,
Sallandı bir Pərim, ay belə keçdi,
Ol səbəbdən dedim, ay bu yanda dur!

# SARI AŞIQ

*XVII əsrdə yaşamış ustad aşıqlarımızdandır. Daha çox yüksək poetik formada yazılmış cinas qafiyələri bayatıları ilə məşhurdur. XVI əsrdə yaşaması haqqında da fikirlər mövcuddur.*

*Əsl adı, doğulduğu və yaşadığı yer haqqında fikir birliyi yoxdur. XIX əsrin təzkirəçisi Qaradağinin mülahizəsinə görə şair əslən Qaradağ mahalından olub, Qarabağın Zəngəzur mahalında, Həkəri çayının sahilində – Güləbürd kəndində yaşamışdır. Bəzi tədqiqatçıların dediyinə görə, təzkirədə adı çəkilən Qaradağ Cənubi Azərbaycanda olan mahal deyil, indiki Laçın rayonunun ərazisindədir.*

*Ən məşhur ustad aşıqlardan biri kimi, Sarı Aşıq haqqında da dastan vardır.*

## QOŞMALAR

Şikar edib tutdum bir şahi tərlan,
Sən etdin ağlımı zail, a Yaxşı!
Səni sevən keçər canü-sərindən,
Olar camalına mail, a Yaxşı!

Məhəbbəti olan istər sazını,
Mən çəkərəm hər dəm sənin nazını.
Şəmsü-Qəmər kimi görkəz üzünü,
Gün təki aləmə yayıl, a Yaxşı!

Qaşların bir oxdu, kirpiyin almaz,
Haramdan oxlasan, oram sağalmaz.
Gedər bu gözəllik, sənə də qalmaz,
Əgərçi sərxoşsan, ayıl, a Yaxşı!

Məni sənə aşiq etdi yaradan,
Seyraqubu haqq götürsün aradan.
İstəyirsən xəbər tutgil Saradan,
Yollarında mənəm sail, a Yaxşı!

* * *

Bir namə yazmışdı gözəllər şahı,
Gəldi məni-mübtəlaya yetişdi.
Guşeyi-külahım fəxri-namədən,
Çərxə dəyib, Məsihaya yetişdi.

Şəhbazi-aləmdən istərəm səni,
Xudanı sevərsən, unutma məni,
Guya ki, Yusifin gül pirəhəni,
Gəldi Yəqub binəvaya yetişdi.

Sən qərib aşiqin qibləgahısan,
Məlamət mülkünün padişahısan,
Aşiqi-sadiqin sən pənahısan,
Səadətin Sürəyyaya yetişdi.

* * *

Gəldi qasid, dedi mən biqərara,
Şuxi-dilrübanın iztirabı var,
Şöleyi-ah Sürəyyadan keçibdi,
Gündüz nə arami, nə şəb xabı var.

Bu xəbər ki, yetdi mən dili-zara,
Xalqdan mən özümü çəkdim kənara,
Ağlayıb yalvardım pərvərdigara,
Dərdimin nə həddi, nə hesabı var.

Nə xoş çəkib səni nəqqaşi-əzəl,
Qəza şövkətinə vermisən xələl,
Gözəllikdə sənsən şəxsi-bibədəl,
Hərçəndi-fələkin afitabı var.

Xəm qılıb qamətin fələk aşikar,
Rüyəti camalın çəkər intizar,
Dolanır başına hər leylü nahar,
Əlində təsəddüq[1] mahi-tabı var.

---

[1] Sədəqə

## BAYATILAR

Mən Aşıq, yara bağlar,
Yar meylin yara bağlar.
Yaramı yar bağlasın,
Yar yaxşı yara bağlar.

Bu bulud yağın eylər,
Şam yanar, yağın eylər,
Bir çıraq haqdan yansa,
O çıraq yağı neylər?

Mən Aşığam, gündə mən,
Kölgədə sən, gündə mən.
Qurban ildə bir olar,
Sənə qurban gündə mən.

Aşıq bir buğda gördü,
Buğdanı dağda gördü,
Gözəli Çanaqlıda,
İgidi Tuğda gördü.

Mən Aşıq, ağzındayam,
Aləmin ağzındayam.
Əslim Qarabağlıdır,
Məzməzək ağzındayam.

Mən Aşıq, ay qır ağı,
Heç olmaz ay qırağı.
Açıldı bulud zülfün,
Göründü ay qırağı.

Aşıq naşı əlindən,
Ağlar naşı əlindən.
Yastıq şikayət eylər
Gözüm yaşı əlindən.

Mən Aşıq qaşı-qaşı,
Bişirər qaşıq aşı.

Aşığı yoldan eylər,
Yaxşının qara qaşı.

Aşığam, Yaxşı qala,
Ocağı yaxşı qala.
İstərəm bu dünyada,
Pis ölə, yaxşı qala.

Mən Aşıq Mirov səndən,
Heç getməz qırov səndən.
Yüz il ovçuluq etdim,
Vurmadım bir ov səndən.

Aşıq min ayə gələ,
Qurban Min ayə gələ,
Sənsiz qərarım gəlməz,
Göydən min ayə gələ.

Mən Aşığam, lələ mən,
Qəflətdəyəm hələ mən.
Dərddən, qəmdən, hicrandan
Bağlamışam şələ mən.

Mən aşıq, zarı canım,
Saralıb sarı canım.
Səndən ayrı düşəli
Qalmayıb yarı canım.

Şirvanda Qəbələ var,
Şəki var, Qəbələ var.
Hicran düşkünü Aşıq,
Əlində qəbalə var.

Aşıq ilahi neylər,
Gərdən sürahi neylər.
Sən orda dur, mən burda,
Görək ilahi neylər.

Mən Aşıq, qara baxtım,
Ağ baxtım, qara baxtım.
Sinən yadıma düşdü,
Dağlarda qara baxdım.

Mən Aşıq, göz izi var,
Kababda göz izi var.
Sənə yadlar baxıbdır
Üzündə göz izi var.

Mən Aşığam, sarı gül,
Yarı qönçə, yarı gül.
Tez açıldın, tez soldun,
Açmayaydın barı, gül.

Mən Aşıq, öz günümə,
Kababı köz günümə.
Fələk əlimə düşsə,
Salaram öz günümə.

Mən Aşıq, o gün eylər,
O quzey, o güneylər.
Yar yara qovuşanda
Bayramın o gün eylər.

Mən Aşığam, əsən gəl,
Qara bağrım kəsən gəl.
Aləm Kəbəyə getsə,
Mənim qibləmə sən gəl.

Mən Aşıq, oda salmas,
O Xoydu, o da Salmas,
Heç pərvanə mənimtək
Özünü oda salmaz.

Aşıq başına bağlar,
Zülfün başına bağlar.

Bülbül öldü, gül soldu,
Qaldı başına bağlar.

Aşığa köhnə dağı,
Gəzirəm köhnə dağı.
Təzədən bir dağ çəkdin,
Unutdum köhnə dağı.

Mən Aşığam baxtıkəm,
Taleyi kəm, baxtı kəm.
Mən fələyə neylədim,
Fələk mənə baxdı kəm.

Mən Aşıq, ay nədəndir?
Aynalı ay nədəndir?
İnsan əsli torpaqdan,
Torpaq əsli nədəndir?

Qarşımızda ya dağlar,
Ya dügünlər, ya dağlar.
Aşıq, Yaxşın ölübdür,
Qohum gülər, yad ağlar.

Aşıq Qarabağlıdı,
Xalın qara bağlıdı.
Nə gedən var, nə gələn,
Yollar qara bağlıdı.

Mən Aşıq, gözəl ayaz,
Meh əsər, gözəl ayaz,
Əlinə qurban Aşıq,
Gözəli gözələ yaz.

Aşıq qan ara yerdə,
Qəssab qan ara yerdə.
Öldürdü Yaxşı məni,
Getdi qan ara yerdə.

Aşığam, o yar mənim,
Qəm bağrım oyar mənim.
Məkkəmdi, Mədinəmdi,
Kəbəmdi o yar mənim.

Mən Aşığam, göy bağlar,
Göy otlaqlar, göy bağlar.
Gözəlin qaydasıdır,
Ağ buxağa göy bağlar.

Aşığa yaz, incə gül,
Görübdür yaz incə gül.
Bülbül yüz kitab oxur,
Bir əlif yazınca gül.

# MOLLA VƏLİ VİDADİ

*XVIII əsr Azərpbaycan poeziyasının görkəmli nümayəndələrindən biri olan Molla Vəli Vidadi 1709-cu ildə Şəmkirdə doğulmuş, dövrünün ədəbi-bədii fikrinə Molla Pənah Vaqiflə yanaşı güclü təsir göstərmişdir. Klassik Şərq poeziyası ənənələri ilə tərbiyələnmiş, əruz vəznində gözəl nümunələr yaratmış, xalq üslubunda yüksək sənətkarlıq səviyyəsinə ucalaraq heca vəzninin incəliklərinə sahib olmuş, bu vəzndə zərif təbli şeirlər yazmışdır.*

*Dövrünün ədəbi prosesi ilə maraqlanmış və tanınmış sənəkarlarla sıx yaradıcılıq əlaqəsi saxlamışdır.*

*Feodal dərəbəyliyinin törətdiyi ictimai və siyasi ədalətsizliklər, müsibətlər incə qəlbli şairin yaradıcılığında öz dərin poetik əksini tapıb. Şeirlərinin bir çoxunda kədər, hicran, ümidsizlik motivləri üstünlük təşkil etsə də, humanizm ideyaları aşılayan şairin əsərlərində realizm duyğuları güclüdür. Aşiqanə şeirləri Azərbaycan məhəbbət lirikasının qiymətli nümunələridir. Orijinal bədii təsvir vasitələrindən kamil sənətkar kimi istifadə etmiş, heca vəznində xalq danışıq dilinə uyğun üslubda yazdığı şeirləriylə Azərbaycan poeziyasını zənginləşdirmişdir.*

*Bir əsr ömr sürmüş, 1809-cu ildə Qazaxın Birinci Şıxlı kəndində vəfat etmişdir.*

## QOŞMALAR

Dəli könül, gəl əylənmə qürbətdə,
Bin gün olur vətən deyib ağlarsan.
Yadlar ilə ömür çürür həsrətdə,
Bir gün olur vətən deyib ağlarsan.

Yaxşı gündə yarü yoldaş çox olur,
Yaman gündə heç bulunmaz, yox olur.
Yad ellərin tənə sözü ox olur,
Bir gün olur vətən deyib ağlarsan.

Mən görmüşəm bu qürbətin dadını,
Yanıb-yanıb çox çəkmişəm odunu,
Qəmlənirsən hər görəndə şadını,
Bir gün olur vətən deyib ağlarsan.

Oxuduqca qəmgin şeri-qəzəli,
Köhnə yaraların bir-bir təzəli,
Yada düşər keçən günün əzəli,
Bir gün olur vətən deyib ağlarsan.

Yada düşər bağçaların, bağların,
Ala qarlı, boz dumanlı dağların,
Qocalırsan keçər cavan çağların,
Bir gün olur vətən deyib ağlarsan.

Keçən günü bir-bir xəyal eylərsən,
Dolar qəm könlünə məlal eylərsən,
Gələndən-gedəndən sual eylərsən,
Bir gün olur vətən deyib ağlarsan.

Hər məzara düşər olsa güzarın,
Yada düşər ata-ana məzarın.
Vidadi xəstə tək artar azarın
Bir gün olur vətən deyib ağlarsan.

* * *

Qatar-qatar olub qalxır havaya,
Nə çıxıbsız asimana durnalar!
Qərib-qərib, qəmgin-qəmgin ötərsiz,
Üz tutubsuz nə məkana, durnalar?

Təsbih kimi qatarınız düzərsiz,
Havalanıb ərş üzündə süzərsiz,
Gah olur ki, danə-xuriş gəzərsiz,
Gah düşərsiz pərişana, durnalar!

Ərz eyləyim, bu, sözümün sağıdır,
Yollarınız haramıdır, yağıdır,
Şahin-şonqar sürbənizi dağıdır,
Boyanarsız qızıl qana, durnalar!

Əzəl başdan Bəsrə, Bağdad eliniz,
Bəylər üçün ərməğandır teliniz.
Oxuduqca şirin-şirin diliniz
Bağrım olur şana-şana, durnalar.

Bir baş çəkin dərdməndin halına,
Ərzə yazsın, qələm alsın əlinə.
Vidadi xəstədən Bağdad elinə
Siz yetirin bir nişana, durnalar!

* * *

Ey həmdəmim, gəl ki, gedər can durmaz
Sənsiz tutmaz söyləməyə dillər hey.
Kəsilibdir, yoxdur səbrü qərarım,
Bir saətim olub uzun illər hey.

Heç bilmədim dövran necə dolandı,
Yandı cismim atəşlərə qalandı.
Könül şəhri gündən-günə talandı,
İndi oldu bir xərabə çöllər hey.

Həsrətindən əlif qəddim büküldü,
Cismim bəndi yerbəyerdən söküldü,
Gözüm yaşı yol-yol oldu töküldü,
Üzüm üstdən axdı qanlı sellər hey.

Nə şirindir, məhəbbət tək zad olmaz,
Ölənətən könül ondan yad olmaz,
Müddətdir ki, məlul könlüm şad olmaz
Məgər əsməz dost kuyindən yellər hey?

Vidadi xəstəyəm günlər sanaram,
Dərd əhliyəm qəm hərfini qanaram,
Qəriblikdə yada düşər yanaram:
Aşna, yoldaş, yar, müsahib, ellər hey.

* * *

Aylar, illər həsrətini çəkərdim,
Şükür yetdim vüsalına, sevdiyim!
Müştaqinəm, canı qurban eylərəm,
O xəttinə, o xalına, sevdiyim!

Eşqin elə bu könlümə fənd elər,
Danışdıqca göftarını qənd elər,
Zülfün ilə hüsnün birdən bənd elər,
Xəyalımı xəyalına, sevdiyim!

Səndə vardır belə şanü şövkətlər,
Həsrətini çəkər mahi-tələtlər,
Sən bir xoş behiştsən, qəmzən zinətlər,
Nə fərq elər əhvalına, sevdiyim!

Eşqin məni gündən-günə qeyr elər,
Səni sevən əlbəttə ki, xeyr elər.
Baş çıxarmış şükufələr seyr elər
O yaşıla, o alına, sevdiyim!

Səni mənə bəxş elədi zamana,
Yaxşı olan nəsib olmaz yamana.
Vidadiyəm sinəm gəldi nişana,
Bir ox atdın iqbalına, sevdiyim!

* * *

Ey həmdəmim, səni qanə qərq eylər,
Gəl tərpətmə yaralanmış könlümü.
Ayrı düşmüş vətənindən, elindən,
Həmdərdindən aralanmış könlümü.

Könül verdik hər bivəfa yadlara,
Hayıf oldu ömür getdi badlara,
Fələk saldı dürlü-dürlü odlara,
Şan-şan olmuş, paralanmış könlümü.

Qanlı yaşım gündən-günə bollandı,
Axdı-axdı sinəm üstə gölləndi,
Yenə qəm səməndin mindi yollandı,
Heç bilmədim bərələnmiş könlümü.

Gözüm yaşı gündən-günə fərq etsə,
Eyb etməyin məni qanə qərq etsə,
Rövşən etməz yüz min günəş qərq etsə,
Bu möhnətdə qaralanmış könlümü.

Vidadi xəstəyəm çeşmim mərdümü,
Tərk elədim vətənimi, yurdumu,
Çox təbibə şərh elədim dərdimi,
Heç görmədim çaralanmış könlümü.

* * *

Könül həsrət, can müntəzir, göz yolda,
Ömr azaldı, vədə keçdi san ilə.
Bir də könlüm istədiyin, gözlərim,
Görərəmmi ol şövkətlə, şan ilə.

İstəmənəm bu dünyanın malını,
Qovğasını, fitnəsini, alını,
Qəriblikdə bikəslərin halını
Fikr elərəm, gözüm dolar qan ilə.

Mərdlər ilən göz ki, vəfadar olur,
Nakəslərə yoldaş olan xar olur.
Namərd odur yaxşı gündə yar olur,
Yaman gündə baxmaz, ötər yan ilə.

Mərd olanlar keçər külli varından,
Əl götürməz namusundan, arından,
Ölənətən dönə bilməz yarından,
Meydan günü başın qoyar can ilə.

Daim haqdır Vidadinin deməyi,
Doğruların hərgiz itməz əməyi,
Hər kimin ki, mövla olur köməyi
Nə işi var sultan ilə, xan ilə.

* * *

Ey məni qınayan, ağlama, deyib,
Ağlar yarı gedən bəs ağlamazmı?
İllər ilən həmdəmindən ayrılıb,
Xoş nigarı gedən bəs ağlamazmı?

Olmaya yanında yarı, cananı,
Puça çıxıb gedə ömri-cavanı,
Günbəgün əksilib şövkəti, şanı
İxtiyarı gedən bəs ağlamazmı?

Bəxt çönüb, çünki zəmanə dönüb,
Şadü xürrəm işi fəğanə dönüb,
Ömrünün gülzarı xəzanə dönüb,
Novbaharı gedən bəs ağlamazmı?

Ərz elərəm sən xasların xasınə,
Səbr eləyim mən bu dərdin hasınə,
Göz yollarda, can gedincə ta sinə
İntizarı gedən bəs ağlamazmı?

Vidadi xəstəni gəl indi tanı,
Hanı o sən görən şəklü nişanı,
Rəngü rüyi, cismi, taqəti, canı,
Külli-varı gedən bəs ağlamazmı?

* * *

Seyri-gülşən etsən, ey gülüzarım,
Bülbül oxur, bağlar sədayə düşər.
Xəttinə baş əyər sünbül, bənövşə
Gül xaki-payinə fədayə düşər.

Xurşidim, xavərim, hilalım sənsən,
Şəkərim, şərbətim, zülalım sənsən.
Fikrim, zikrim, sözüm, xəyalım sənsən,
Haçan könlüm səndən cüdayə düşər.

Arizunu çəkir sahib-diləklər,
Dolanıb başına dönər fələklər.
Mədhin oxur ərş üzündə mələklər,
Hər biri bir türfə vidayə düşər.

Xəyalındır xəyalımın həyatı,
Dəhanın şəkəri, dilin nəbatı,
Cəmalın sədqəsi, hüsnün zəkatı
Mənim tək binəva gədayə düşər.

İntizarın mən çəkərəm peyvəstə,
Könül pərişandır, xatir şikəstə,
İstər vüsalını Vidadi xəstə,
Üz xakə fərş eylər, duayə düşər.

* * *

Ay ağalar, bir nigarın oduna
Dəli könül yanə-yanə düşübdür.
Mən ki, düşüb bu hal ilə yanaram,
Nə səməndər, nə pərvanə düşübdür.

Açılıb cənnət tək camalın gülü,
Ötər çevrəsində şeyda bülbülü.
Bu gülşənin yasəməni, sünbülü
Nə bir bağa, nə bostanə düşübdür.

Ləli-ləbi bənzər gövhər kanına,
Düzülüb gövhər tək dür dəhanına,
Siyəh tellər ağ buxağın yanına,
Xırda xallar zanəxdanə düşübdür.

Könül dostu kuyinə etdikcə güzər,
Qanlı qəmzəsindən etməzmi həzər?
Çıxdı gözüm birdən eylədi nəzər,
Gör necə kəsilməz qanə düşübdür.

Qaşı, gözü durub qanın almağa,
Zülf tökülmüş din, imanın almağa,
Vidadi xəstənin canın almağa
Xət bir yana, xal bir yanə düşübdür.

* * *

Çərxi-fələk zülmü ziyad eyləmiş,
Hicran məni gündə döyər, ağlaram.
Ey yaranlar, sındırıbdır belimi
Möhnət yükü qəddim əyər, ağlaram.

Məni belə hər kim görə, bil, ağlar,
Dağ-daş yanar, ulus, oymaq, el ağlar.
Cismim sızlar, göz yaş tökər, dil ağlar,
Öz başıma yalqız məgər ağlaram?

Ey mənim tək göz yaşını saçanlar,
Qürbətlikdə cigər qanın içənlər,
Fikr etdikcə cümlə bir-bir keçənlər
Yadə düşər, yanar cigər, ağlaram.

Hayıf oldu o dövranlar, o dəmlər,
Gəldi, keçdi yar, müsahib, həmdəmlər,
Bərhəm olur dərdlər, qəmlər ələmlər,
Bir-birinə gündə dəgər, ağlaram.

Çərxi-fələk, mən ha köçdüm yurdumdan,
Ayrı düşdüm qoşunumdan, ordumdan,
Vidadiyəm, aləm tanır dərdimdən,
Əgər ağlamanam, əgər ağlaram.

* * *

Yenə yad eylədim keçən günləri,
Axdı gözlərimdən qan gedər oldu.
Bihuş oldum, nitqim, səbrim, qərarım
Çıxdı bu cismimdən san gedər oldu.

Dil necə ağlayıb çəkməsin zarı,
Hər gün artar bir dərmansız azarı.
Elə kasad oldu könül bazarı
Sanasan şəhrindən xan gedər oldu.

Ey könül, pozuldu rəngi-alların,
Tər sima, xoş bədən, xəttü xalların,
Şirin göftarların, dür xəyalların,
Atəşi-hicranə yan gedər oldu.

Hanı ol əzəlki nazü rifətlər,
O qəddü qamətlər, hüsni-surətlər,
Gedərmiş mərdümdən qədrü hörmətlər
Elə ki, şövkətü şan gedər oldu.

Ey Vidadi xəstə, noldu bazular,
Düşdü qələm, itdi gözdən yazılar.
Hümmət edin, yar, müsahib, qazılar
Yüz min həsrət ilə can gedər oldu.

* * *

Ey fələk, əlindən dad etməyimmi,
Sən məni dərdə bac eyləmədinmi?
İtirdin gözümdən yari-həmdəmi,
Taydan-tuşdan ixrac eyləmədinmi?

Qəvvas olub eşq bəhrin üzərkən,
Sevda səməndini minib gəzərkən,
Özgələrin əyrisini düzərkən,
Öz işimdə qiyqac eyləmədinmi?

Mən necə səbr edim ha belə dərdə,
Canü cismim oldu sağ ikən mürdə,
İşim saldın hər nakəsə, namərdə
Onlara məni möhtac eyləmədinmi?

Gündən-günə dərdim oldu ziyada,
Axırda ömrüm getdi bərbada,
Keçən günlər bir-bir düşdükcə yada
Əşkimi pürəmvac eyləmədinmi?

Gör necə düşübdür Vidadi xəstə,
Nitqi lal olubdur, zəbanı bəstə,
Qəm ləşkəri durub dəstəbədəstə
Könül şəhrin tarac eyləmədinmi?

* * *

Gecə-gündüz oda düşüb yanaram,
Siyah telli bir sonanın ucundan.
Nə dil deyə bilir, nə qələm yazır
Hər nə ki çəkmişəm onun ucundan.

Qəm ki, gəlir mənə firqəbəfirqə,
Nə Məcnun çəkibdir, nə görüb Vərqə;
Neçə mərdümləri vermişəm qərqə
Çeşmimdən tökülən qanın ucundan.

Nə xoş olur eşq əhlinin bu halı,
Şəmə yana pərvanənin misalı,
Gəldikcə xəyala yarın xəyalı
Yanar odlar düşər canın ucundan.

Könül düşüb hər həvadan enərmiş,
Şişə təki hər nə dəgsə sınarmış,
Səməndər tək özbaşına yanarmış,
Hicran günü can cananın ucundan.

Bivəfa dünyada, dəhri-fənada,
Fələk məni yetirmədi murada.
Vidadi xəstəyəm, ömrümü bada
Verdim axır bu sevdanın ucundan.

* * *

Yenə bir leyliveş yara dil verdik,
Könül Məcnun təki divanələnmiş,
Atəşi-eşqindən dil kəbab olmuş,
Dolanır, çövrünün pərvanələnmiş.

Apardı ağlımı bir ahu gözlü,
Bir bənövşə buylu, bir lalə üzlü,
Bir şirin göftarlı, bir şəkər sözlü,
Ağzı sədəf, dişi dürdanələnmiş.

Düşübdür xəyalım yarın ruyinə,
Can quşu bənd olub zülfü muyinə,
Salıbdır meylini yarın kuyinə,
Əqlü huşum məndən biganələnmiş.

Ta ki, xəbər gəldi xublar şuxundan
Əl çəkdim cahanın varü yoxundan.
Qəmzə xəncərindən, müjgan oxundan
Cigər parə-parə, dil şanələnmiş.

Vidadi xəstəyəm, ey gözüm sağı,
Artıbdır sinəmin düyünü, dağı,
Bir qəmzəsi qanlı, hərami, yağı,
Çapdı könlüm şəhrin, viranələnmiş.

* * *

Vaqif, nə tez sənəmlərdən usandın,
Birin bir inəyə qiymət eylərsən?
Hələ sonra keçiyə də enərsən,
Alsa müştəriyə minnət eylərsən.

Puç olsun qocalıq, gördün ki, necə,
Bir pulca xublara gəlməzmiş vecə,
Gündüz fikr etdiyin baş tutmaz gecə,
Tamam puçdur hər nə söhbət eylərsən.

Xublar işində ki, qiyqac olursan,
Onların təninə amac olursan,
Sən ki, alığa da möhtac olursan,
Əbəs yerə neçin zəhmət eylərsən.

İşin ki, düşübdür Arayatıya,
Oğul da olsa, dəxi baxmaz atıya,
Birin də mən allam örkən-çatıya,
Əgər qayırmağa möhlət eylərsən.

Sifariş etmişdin qələbəyiyə,
Ki, sən göz-qulaq ol bizim dəyiyə,
Müştərini doldurubdur pəyiyə,
Necə ki, keyfindir ləzzət eylərsən.

Demədimmi alma ağ dəyənəyi,
Danadan, buzovdan etmə hənəyi,
İndi nə çox istəyibsən inəyi,
Hələ sonra daha şiddət eylərsən.

Dövtələb oluban gedibsən xandan,
Ölüncə çıxmanam ta Gülüstandan.
İnşallah çalışsan habelə candan
Hər nə desən, bil, aqibət eylərsən.

Bir igidsən, işlərində daim ol,
Demənəm ki, qəflət eylə, naim ol,
Xan buyuran qulluqlarda qaim ol,
Gör düşmənə nə həqarət eylərsən.

Əgər Allah xana verə nüsrətlər,
Zaye olmaz heç çəkdiyin zəhmətlər,
Başa gəlir eylədiyin niyyətlər,
Gər sidq ilə nəngü qeyrət eylərsən.

Quşçu Namazəli yeyib-yatmasın,
Daim sözün məsləhətə qatmasın,
Çox da özün hər meydana atmasın,
Qəfil o igidi xiffət eylərsən.

Bizim Abdullahın vardır qədəmi,
Onu da ha indi gəlibdir dəmi,
Genə qoymaz o Gəncədə adəmi,
Əgər ki, sən bir işarət eylərsən.

Baqqal ilən Əli müştağındadır,
Molla Səfərəli fərağındadır.
Xeyri olsun hər kəs yığnağındadır,
Onlar ilən zövqü işrət eylərsən.

Hərgiz olmaz haq gölünün fənası,
Əskik olmaz yaşılbaşlı sonası,
Məhşərətən qaim olsun binası,
O məscid ki, doğru imrət eylərsən.

Biz də təşrif buyurmuşduq bağatan,
Eşitdik gəldiyin Nəsib ağadan,
Mən ha bilməz idim ta bu çağatan,
İndi bildim hünər, cürət eylərsən.

## GƏRAYLILAR

Səba, əhvalımı bir-bir
Varıb ol yarə ərz eylə.
Qəmü dərdi-dilim şərhin
Deyib, dildarə ərz eylə!

Gedərsən kuyinə yarın,
O qəddi-sərvrəftarın,
Fəğanın bülbüli-zarın
Güli-gülzarə ərz eylə!

Desən mən zarü giryandan,
Vücudi, bağrı büryandan,
Dəmadəm tiği-hicrandan
Ciyər sədparə, ərz eylə!

Səba, gəl seyri-gülzar et,
Gülü reyhanı bidar et,
Təbibə dərdim izhar et,
Qəmi qəmxarə ərz eylə!

Vidadi xəstə bimarın,
Bəlayi-eşqdən zarın,
Sözün müştaqi-didarın
Yetir canana, ərz eylə!

* * *

Könül səbrü qərar etməz
Gedər yar olmayan yerdə,
Məhəbbət payidar olmaz
Vəfadar olmayan yerdə.

Vəfa qıl bir vəfadarə,
Ulaşma hər biiqrarə,
Mətain atma bazarə
Xiridar olmayan yerdə.

Mənim həmrazü həmdərdim
Deyim hər bədnüma gördüm.
Hünər kəsb eyləməz mərdüm
Namus, ar olmayan yerdə.

Xuda, sən saxla gəl fərdi,
Çətindir yalqızın dərdi,
Pərişanlıq tapar mərdi
Havadar olmayan yerdə.

Dila, laf etmə mütləqdən,
Düşərsən zülmə nahəqdan.
Neçin mərdüm dönər həqdən
Bir azar olmayan yerdə?

Gəl ey könlü olan rövşən,
Qəbul et bu sözü məndən.
Necə müğrur olur məskən.
Gülə xar olmayan yerdə.

Könül dünyadə yar istər,
Olubdur biqərar istər,
Vidadi xəstə var istər,
Haçan yar olmayan yerdə?

* * *

Şam yanar a yağ ilə,
Gəl, gözüm əyağilə,
Gəldi Vəli başına,
Gəlməyən ay ağıla.

Vəliyəm qanad ilə,
Üz tutdum qan adilə,
Xəyalım gedən yerə,
Quş getməz qanadilə.

Vəliyəm, ay qazağlar,
Dər sızlar, ay göz ağlar,
Tülək tərlan yurduna
Qonmasın ay qaz, ağlar.

Vəliyəm, sənə dilə,
Üz tutdum sən adilə,
Dövran mənə zülm etdi,
Gəlmişəm sana dilə.

## TƏCNİS

Ey dəhanı şəkər, ləbləri badə,
Gün camalın eşq əhlinə ayinə,
Üzün gördü şeyda könül məst oldu,
Nə hacət ki, həşr olunca ayinə.

Səni məndən, məni səndən sanaram,
Tanrı üçün uzaq tutma sən aram.
Vüsalından ayrılalı sanaram,
Yetə bilməm həftəsinə, ayına.

Sən siz mənə dolandıqca sal, sənə,
Əşkim dərya, cismim oldu lal sənə.
Nolur niqabını üzdən salsanə
Günəş göydə səcdə qıla, ay enə.

Neçin kəsdin sinən üstən ayaqlar,
Üzün göstər, sərməst olsun ayıqlar.
Həsrət çeşmim, qan-yaş tökər, ay ağlar,
Gördüm ola bir də üzün, ayə, nə?

Vidadiyi-xəstə oxu miyandır.
Qur sən tər sadağın oxumu yandır.
Kim hüsnün kitabın oxumayandır.
Nə bilir ki, hədis nədir, ayə nə?

## QƏZƏLLƏR

Hər səhər bad əsər, arizi-cananə dəyər,
Toxunur sərvə gəhi, gah gülüstanə dəyər.

Olmasa qabil əgər dəhr cəfa verməz ona,
Təm biləzzət olanda necə dəndanə dəyər.

Şəm gər yansa savadi-şəb üçün heyf olmaz,
Şöləsi çünki onun arizi-cananə dəyər.

Söhbəti-nakəsü namərd həmin söhbət imiş,
Tut ki, bir mərd ətəyin dövləti-xaqanə dəyər.

Sən ki, bir mərdin ucundan nə bəla çəkdin isə,
Vəsli-didari onun rəhməti-qüfranə dəyər.

Mən ki, meydani-bəla içrə sərim top edərəm,
Ta düşər əldən-ələ axırı çövkanə dəyər.

O nə qəmdir oda bir mərdin ucundan yanasan,
Verəsən canını bir canə ki, min canə dəyər.

Canımı atəşi-qürbətdə belə yandırıram,
Necə şəmə dolanıb hər gecə pərvanə dəyər.

Nə qədər olsa qoca gərçi Vidadi xəstə
Yenə Vaqif kimi, əlbəttə, yüz oğlanə dəyər.

* * *

Bilirsiz, Vaqifa, kim şövqimiz didarə çoxdandır,
Nə çarə, eyləməz dövran vüsalə çarə çoxdandır.

Pərişandır könül, zülfü pərişanlar həvasında,
Bu sevdadə olubdur mürği-dil avarə çoxdandır.

Təbiba, ta ki, düşdük çün həzər rəcuri-eşq olduq,
Mühəssəl yetmədi bimarimiz timarə çoxdandır.

Qərəz canana mətləb can isə inkarımız yoxdur,
Verib can-baş yolunda, durmuşuq iqrarə çoxdandır.

Vidadi xəstə kim, düşmüş səadətlər sücudindən,
Bəli Sənani-dil ta bağlanıb zünnarə çoxdandır.

* * *

Sən tək, ey gül, demə gül gülzarə gəlmiş, gəlməmiş,
Şəhrara hüsnüncə namə barə gəlmiş, gəlməmiş.

Dəmbədəm, ey gülbədən, şirin dəhən, şəhdü şəkər,
Ləli-ləbin ləhcəyi-göftarə gəlmiş, gəlməmiş.

Eylədim təhqiq kim qövsi-qaşın tək növnəhal
Hüsn bağində qədin rəftarə gəlmiş, gəlməmiş.

Demə kim üşşaq qanın tökməyə qəmzən kimi
Qatilü cəllad tək xunxarə gəlmiş, gəlməmiş.

Çün dəva yox eşq dərdinə nə fərq eylər təbib,
Bu Vidadi xəstəyi-biçarə gəlmiş, gəlməmiş.

* * *

Neçə göz sən tək gözəl dünyadə görmüş, görməmiş,
Böylə məqbulu müzəlləf sadə görmüş, görməmiş.

Bavər etmən, ey mələklər sərvəri kim, bir bəşər
Səncə bu xubluqdəvü simadə görmüş, görməmiş.

Sanma qılmış teyi-gülzari-çəmən bülbül-həzər
Qamətin tək sərvi-xoş azadə görmüş, görməmiş.

Ey gözüm saqi, xəyal etmə bu bəzmin rindəsi
Şərbəti – ləli ləbin tək badə görmüş, görməmiş.

Kimsə yox aləmdə mütləq bu Vidadi xəstə tək
Bir əsiri-dərdi-eşq iftadə görmüş, görməmiş.

* * *

Sanma ey dust, sən tək afət canə olmuş, olmamış,
Gözlərin tək nərgisi-məstanə olmuş, olmamış.

Demə kim görmüş cahan şəmi-cəmalın tək çıraq,
Ya ona canım kimi pərvanə olmuş, olmamış.

Sürmə mən Məcnunu qapından, ey Leyliyi-dəhr,
Dərgahında nola bir divanə olmuş, olmamış?

Olmadı bir gün, Vidadi xəstə, giryan olmadın,
Kimsə onu görmədi xəndanə olmuş, olmamış.

* * *

Nigara, zövqi-hüsnündən ki, hər dəm ittifaq artar,
Fəraqindən gəlir min qəm, qəmindən min fəraq artar.

Nə qafilsən ki, mütləq ahi-dilsuzim əsər qılmaz,
Sədayi-naləmə aləmdə munca göz-qulaq artar.

Məni gər məst edibsən, saqiya, xoş halim ondandır,
Dolandırdıqca cami-eşq dövründə əyaq artar.

Qərəz cövrin ziyadi-tərki-eşq isə füzun eylə,
Cərahət qalib olduqca təbibə iştiyaq artar.

Vidadi xəstəyəm məşhur halim dövri-hüsnündə,
Vəli yüz şükür ki, can əksilir eşqi-məzaq artar.

* * *

Ey səba, gəl bir xəbər ver canə, canan xandadır?
Şəhri-könlüm oldu viran, ona sultan xandadır?

Bir pəripeykər, mələkru, cismi nazik, simvəş,
Qaməti sərvü sənubər, hüsni-taban xandadır?

Ağzı püstə, dişləri dür, dili şəkər, ləbi bal,
Xali hindu, çeşmi cadu, tiri müjgan xandadır?

Qaşları hilalə bənzər, türrəsi ənbərfəşan,
Zülfü sünbül, buyi gül, gül xətti reyhan xandadır?

Ey fələk, aləmdə düşmüş böylə canandan cüda,
Gör Vidadi xəstə tək sən bir didərgin xandadır?

* * *

Mənə bir şuxü şirin dilrüba bir pirəhən tikmiş,
Sanasan nəqşi-qüdrətdir əcəb türfə Həsən tikmiş.

Tamaşa eylədim üstündə heç əl gəzməmiş guya
Çəkib bir surə öz cismi kimi nazik tikən tikmiş.

Bilir hər kəs, çıxar xoş nazik işlər nazəninlərdən,
Bəli, bir lalə üzlü, sərviqəd, nəsrinbədən tikmiş.

Uzaqdır, ey Həbibim, böylə iş naəhl olanlardan,
Yenə bir dərdmənd, eşq əhlinin qədrin bilən tikmiş.

Nə xoş olmuş Vidadi xəstənin əhvalına vaqif
Ki, səy etmiş bilib onu, bir əhvalə yetən tikmiş.

* * *

Gərçi yüz min aləm içrə var yarından cüda,
Heç kəs mən tək deyil pərvərdigarından cüda.

Dərdü möhnətlər xərab etmiş xəyalım xanəsin,
Olmadı ayineyi-dil qəm-qübarından cüda.

Eyləmiş rövşən qəmər hicrə fəraq iftadəsin
Cümlə yarından cüda, həm külli-varından cüda.

Sorsa yar əhvali-dil gör bir necə söylər səba,
Canü tən bitab, dil səbrü qərarından cüda.

Bir bəlakeş görmədim düşmüş Vidadi xəstə tək
Aşinavü həmdəmü həm dostü yarından cüda.

* * *

Deyibsiz yəni gəlləm gəldi bir belə xəbər, Vaqif,
Xilaf idi bu sözlər bəs, peşimanmı məgər Vaqif?

Bilirdim mən fələk verməz visalə çox da üz, amma
Bizi saldı əzabi-intizarə müxtəsər Vaqif.

Bu gün danla demə, dövran deyildir bir qərar üzrə,
Sən ondan ta olunca vaqif, ol səndən keçər, Vaqif!

Məcalın var ikən ol yarü həmdərdi güzar eylə,
Könül qəmdən açar, yaxşı olur seyrü səfər Vaqif.

Bilirsiz qövli-sünnət, bədi niyyət məhz vacibdir,
Hələ rəhm olduğu məlumunuzdur, mötəbər Vaqif.

Vətən yad eyləməzsiz gər tutalım könlünüz quşdur,
Məgər qəti rəhmdən eyləməzsiz bir xəbər, Vaqif.

Fələk bərəksi-dövran olduğundan bir nişandır bu,
Vidadi xəstə tək düşmüş vətəndən dərbədər Vaqif.

* * *

Tutma, ey sahib-nəzər, məndən nəzər, divaniyəm,
Bu təhəyyürdən tutulmuş könlümün heyraniyəm.

Gər görürsən əqlü tədbirü fərasətdən cüda,
Bihünər sanma əbəs kim, eşqlə mərdaniyəm.

Canı canandan diriğ etmən, dili dildardan,
Navəki-qəmzə sevən, əbru kəman qurbaniyəm.

Məsti-cami-Cəm olub şürbi degilsəm gərçi mən,
Tacü təxti-fərq ilən qəm mülkünün xaqaniyəm.

İzzü cah ilə mənim qeyr ilə yox davam vəli,
Mən Vidadi xəstəyəm, öz şəhrimin sultaniyəm.

* * *

Ölüm həqdəndir, əmma növcəvan ölmək nə müşküldür,
Gözündə hər muradı, tazə-can ölmək nə müşküldür.

Həvayi-eşq sərdə, xatirində vəsl sevdası,
Dilində əzbəri-yarü cinan ölmək nə müşküldür.

Tamaşayi-camalından nəzərlər olmaya xali,
Nizami-xəttü xalı xoşnişan ölmək nə müşküldür.

Kəlamı, nitqi, ləfzi xoş, dili şirin, üzü xəndan,
Qiyami-qaməti sərvi-rəvan ölmək nə müşküldür.

Çəkə həsrət görənlər, görməyənlər arizusunda,
Ola dillərdə vəfi hər zaman, ölmək nə müşküldür.

Keçib peykan bağrından, düşüb məcruh sərgəştə,
Ola al qanına qəltan ölmək nə müşküldür.

Verə qürbətdə can, yanında yarü həmdəmində yox,
Qala könlündə hər sirri nihan, ölmək nə müşküldür.

Təkəllümdən düşüb dil, tabü taqət qalmayıb canda,
Gözü yollarda qalıb bizəban ölmək nə müşküldür.

Tamam olmaz yüz il şərh eyləsəm bu dərdi-bidərman,
Qəribü biksü bixaniman ölmək nə müşküldür.

Neçə növrəs cəvani-sərəfrazından cüda, həsrət,
Vidadi, xəstə düşmək, natəvan ölmək nə müşküldür.

* * *

Ər libasın geyə hər rənglə zən, mərd olmaz,
Mərd hərçənd ki, zən öldürə, namərd olmaz.

Gər rəfiqin ola bidərd, dəvasız dərddir,
Əhli-dildən gələ min zəxm, o bir dərd olmaz.

Gəzsə gər əhli-təmə, dəhri-yüz il sail olub,
Vaqifi-hikmət olub, mərdi-cahangərd olmaz.

Demə hər surətə bitəcrübə mərdüm göz ilə,
Bərg hər növ ki, gülşəndə bitər vərd olmaz.

Qəm yemə, xəstə Vidadi, görüb ədanı kəsir,
Haqqa ixlas ilə meydanə girən fərd olmaz.

* * *

Ah-ah, ey çərxi qəddar, ay, ey bədruzigar,
Künci-zülmətdə əcəb qoydun məni heyranü zar.

Yarı yox, dildarı yox, bir munisi, qəmxarı yox,
Gözdə nəm, xatirdə qəm, heyrətdə hərdəm dilfikar.

Dəstü pa bəstə, bədən xəstə, şikəstə sərnigün,
Çeşmi giryan, cismi büryan, müztərib can biqərar.

Getdi taqət, nazü rifət, qədrü hörmət payimal,
Dərdi əfzun, əşk gülgün, bəxt gün-gün tirətar.

Neçə yüz daği-fəraq ilən Vidadi xəstəni
Tarmar etdin sən, ey gərduni-dun, ol tarimar!

* * *

Şəhdabi-ləbin sağəri-peymanə tək, ey dust!
Dürci-dəhənin höqteyi-dürdanə tək, ey dust!

Gülzari-behişt tək açılıb rövzeyi-hüsnün,
Bimar gözün nərgisi-məstanə tək, ey dust!

Ol dəm ki, göründü gözümə şəmi-cəmalın,
Yandırdı məni şövq odu pərvanə tək, ey dust!

Fikr eylədi ahu gözünü xəstə Vidadi,
Düşdi yenə səhralara divanə tək, ey dust!

* * *

Yanar cismim bu gün atəşlərə canü cigərdən çox,
Olubdur dil müşəvvəş, bilməzəm hansı xəbərdən çox.

Açılmaz taleim sübhü, olubdur tirə əyyamım,
Salıbdır bəxtimi bu dideyi-dövran nəzərdən çox.

Görüb əhvalımı tən etmə, ey tənpərvəri-dövran,
Həvayi-eşq ilə çox qissələr keçdi bu sərdən çox.

Demə, ey dil, cahanda yox mənim tək dəhr pamalı,
Nə vardır aləmi-möhnətdə sən tək dərbədərdən çox.

Nəsibin, ey Vidadi xəstə, təqdiri-qəzadəndir,
Təhəmmül eylə, fikr et, görmə nöqsanın bəşərdən çox.

* * *

Həbibim, ta səni mən sevmişəm əşraf arasında,
Vücudum, atəşi-eşqin yanıbdır saf arasında.

Üzün görcək təhəyyürdən tutulmuş nitqimə baxma,
Tərəhhüm qıl, özün bir halə yet insaf arasında.

Qiyamın bir əlifdir aşiqin eynü xəyalından,
Sevirlər can içində, aləmü ətraf arasında.

Qaşın bir nundur çəkmiş qəza nəqqaşı qüdrətdən,
Nəzərdə cümlədən baş yazılar əsnaf arasında.

Vəfa yoxdur, Vidadi xəstə, əsla nəsli-insanda,
Vəli bihudə bir sözdür deyirlər laf arasında.

* * *

Yanan eşq atəşinə qəm yeməz ol nardən artıq,
Ki, yaxmaz nari-duzəx atəşi-rüxsardən artıq.

Mənə munca təvəhhüm çox verirsən ruzi-məhşərdən,
Qiyamət varmı, ey vaiz, fəraqi-yardən artıq?

Ayağım kəsməzəm laf ursa min səg yar kuyində,
Nə surət göstərir ol, surəti-əğyardən artıq.

Dirilmən dərdi-eşqü möhnəti-didarsız bir dəm,
Olardı həmdəmim firqətdə yüz qəmxardən artıq.

Vüsali-yardən gər müddəi yüz müddəa eylər,
Vidadi xəstənin könlündə yox didardən artıq.

* * *

Ey badi-səba, məndən ol yarə salam eylə,
Dərdü ələmim bildir dildarə, salam eylə.

Görsən üzün ol mahın, bas bağrına gərdun tək,
Dön başına yalvarə-yalvarə salam eylə.

Key baği-behiştim, mən bir Adəmdim guya,
Düşdüm səri-kuyindən avarə, salam eylə.

Dərdü qəmi-hicranın hər ləhzə hücumundan
Axır ki, cigər oldu sədparə, salam eylə.

Gör xəstə Vidadinin daği-cigərin söylə,
Ol lalə rüxə, çeşmi-bimarə salam eylə.

* * *

Şəha, müddət cahanı mən də gəzdim, dərbədər gördüm,
Tamaşa eylədim yaxşı yamanı, xeyrü şər gördüm.

Görüb mərdümləri bitəcrübə, ey mərdüm, aldanma,
Məhəksiz bilmək olmaz qəlbini, çox simü zər gördüm.

Səxavət olmayan kəsdə şücaət feli-nadirdir,
Kərəmsiz kimsəni hər yerdə gördüm, bihünər gördüm.

Əkabirlərdə himmət, aşinalarda sədaqət yox,
Vəfa kuyin dolandım, mütləqa yox bir bəşər gördüm.

* * *

Söylə canana, səba, halım pərişan oldu, gəl!
Çıxdı can, sud etmədi hər necə dərman oldu, gəl!

Qasidi-bisidqə aldanma, yetir, hal özgədir,
Türfə şivənlər qopub üstümdə əfğan oldu, gəl!

Enmədən sinə vücudum, doldu qəbrim qan ilə,
Gördüyün nazik bədən xak ilə yeksan oldu, gəl!

Rəkti-tərdən incinən tən həmdəm olmuş marilə,
Üz tutub qarıncalar yollara karvan oldu, gəl!

Gördüyün zahir ələm tək şənü şövkət sahibi
İndi pəjmürdə düşüb torpağa, pünhan oldu, gəl!

Neçələr giryan olubdur bu Vidadi xəstə tək,
Didələr giryan olub çaki-giriban oldu, gəl!

Gəl, ey vəhdət qəzalı, sən bu səhradan nə istərsən?!
Xəyalın həmnişin oldu bu tənhadan nə istərsən?!

Tutubsan surəti-Yusif, könül Misrində sultansan.
Vüsalın qiyməti keçdi Züleyxadan nə istərsən?!

Sənin eşqin durur ruhum, bu zülfün əql gəncidir,
Apardın əqlimi, bəs ruhi-şeydadən nə istərsən?!

Sən eşq əhlinə, ey zahid, məlamət etməyi tərk et,
Deyilsən sirrə vaqif, zöhdü təqvadən nə istərsən?!

Vidadi xəstə, gəl ədnasüfət dünyayə meyl etmə,
Qıl əqlin var isə tərkin, bu dünyadən nə istərsən?!

Yenə naşad könlüm buldu yüz yerdən məlal, ağlar.
Rəvan eylər iki gözdən dəmadəməşki-al, ağlar.

Könül şəhbazını əldən uçurdum, taqətim getdi,
Düşüb pərvazə meyl etməz, sənəbdər pərrü bal, ağlar.

Mənəm o bağibani-bağı-möhnət kafəti-dövran,
Yıxıb gülzari-ömrümdən necə tazə nihal, ağlar.

Sirişkimdə xəyalım yadigari-ruzi-firqətdir,
Budur, vəchi ki, onu saxlaram hər mahü sal, ağlar.

Əziza, qaldı həsrət həşrə tək didar didarə,
Kəsildi hər tərəfdən, yox bir ümmidi-vüsal ağlar.

Demən fəryadi-zarimdə əsəb dağlara ün düşmüş,
İtirmiş gözlərim səyyadi bir türfə qəzal, ağlar.

Çətindir can bədəndən cismi-tər yanından ayrılmaq,
Odur bu gündə düşdükcə, Vidadi xəstəhal ağlar.

* * *

Nə müddətdir, gözüm rahindədir, yarım, sən səfa gəldin!
Həbibim, sevgilim, yarım, nigarım, sən səfa gəldin!

Dili bülbül, ləbi mey, xali fülfül, zülfləri sünbül,
Mələkxu, yasəmənbu, gülüzarım, sən səfa gəldin!

Yüzüm xaki-rəhində fərşdarəm, xoş qədəm basdın!
Şəhim, həm şəhriyarım, şahsüvarım, sən səfa gəldin!

Xəyalım gülşəninə sayə saldın sərv qəddindən
Açıldı səbzələndi laləzarım, sən səfa gəldin!

Vidadi xəstə tək düşmüşdü biaram can sənsiz,
Vücudim, taqətim, səbrim, qərarım, sən səfa gəldin!

* * *

Yarəb, bu gedən sərvi-sərəfraz kimindir?
İnsan bu surətdə olur az, kimindir?

Xəlq içrə ki, yoxdur belə məqbulu müzəlləf,
Meydani-gözəllikdə bu sərbaz kimindir?

Qaşı, özü, əndamı, təmamən əl-ayağı,
Hər bir sümüyü başına yüz naz kimindir?

Munca ki, sərapa bəzənib dürlü cəvahir,
Zərrin qəba, simü sərəndaz kimindir?

Tuş oldu sənə, xəstə Vidadi, bu əcəldir,
Yoxsa ki, nə sözdür belə şəhbaz kimindir?

**MÜSTƏZAD**

Novruzi-bahar oldu, cahan tazətər oldu,
Rəf oldu ələmlər.
Dağıldı bu şadlıq xəbəri dərbədər oldu
Yandı oda qəmlər.
Qırx yeddi rəqəm sındı zimistan qələmindən
Fürsət gülə düşdü.

Meydani-tərəbdə bu nə türfə hünər oldu,
Sərf oldu kərəmlər.
Göydən yerə yağdı nə gözəl şəbnəmi-rəhmət
Bitdi gülü lalə.
Xoş nəğmələnib bülbüli-şeyda ötər oldu
Açıldı irəmlər.
Yüz həmdü səna, maili-seyri-çəmən oldu
Şad oldu könüllər.

Bir mövsimi-güldür bu ki, həqdən nəzər oldu
Xoş gəldi bu dəmlər.
Ey xəstə Vidadi, bu gün etməzmi sənə rəhm
Sultani-zəmanə?
Bu eydi mübarəkdə ki dünya xəbər oldu
Saçıldı dirəmlər.

**MÜXƏMMƏS**

Ah kim, gör neylədi bu gərdişi-dövran bu gün,
Eylədi bir növcavanı xak ilə yeksan bu gün.
Oldular matəm tutub xəlqi-cahan giryan bu gün,
Getdi bu dari-fənadan döndü çün dövran bu gün.
Rəkli xanın sevgili fərzəndi ol Livan bu gün.

Qopdu bir şivən sanasan çərxi-dövran ağladı,
Dözməyib bu möhnətə canı olan qan ağladı,
Xaçpərəstlər hər nə var, cümlə müsəlman ağladı,
Necə dil tutsun deyim bir hal ilə xan ağladı,
Atəşi-əfğanə yandı, külli Gürcüstan bu gün.

Cəm edib dörd yanına Gurgin xan mirzaləri,
Bir-birilə danışır hər bir keçən sövdaləri,
Sındırıb düşmənləri, kor etdiyin ədaləri,
Yada düşdükcə çıxar fəryadü vaveylaləri,
Eylə sanır xəlqi-aləm qopdu bir tufan bu gün.

Bu müsibət məhşərində ol Dedunalı görün,
Zəxmi-naxun sinədə, üzdə sirişk alı görün,
Fərş olub torpağa üz, bihuşü pamalı görün,
Naleyi-zarü fəğanı, böylə əhvalı görün,
Daş ola ağlar, necə tab eyləsin insan bu gün.

Qaldı onun necə həsrət tifli-nadan qızları,
Eyləyib xanı, Dedunalı ciyərqan qızları.
Kim görür əlbət olur giryanü suzan qızları,

Ağlasınlar cəm olub, şivən qurub xan qızları,
Tazələndi matəmi-Livan ilə Vaxtan bu gün.

Hər nə var təvadü əyan cümleyi-qullar tamam,
Ağlayıb göz yaşı tökə, əfğan edə dillər tamam,
Yas tutub qarə geyinsin başətən ellər tamam,
Didələrdən dəmbədəm tökmək gərək sellər tamam,
Getdi onların sərindən sayeyi-Livan bu gün.

Neylədin, ey çərxi-dun, ol izzü rifət sahibin,
Fərdi-meydani-şücaət, şanü şövkət sahibin,
Novcəvani-pürhünər, mərdi-fütüvvət sahibin,
Sərnigün etdin yenə bir tacü dövlət sahibin,
Oldu onunçün pərişan, hər tərəf, hər yan bu gün.

Sərbəsər yanmaq gərək dünya, bəli, Livan üçün,
Şükr edib səbr eyləmək lazım yenə ol xan üçün,
Kəm deyil, mərdümləri kim dideyi-dövran üçün,
Həm özü lütfi-xudadır hər tərəf, hər yan üçün,
Etməsin həq başımızdan sayəsin nöqsan bu gün.

Bu atəşdir, buna dözməz çox ərlər, yandırır,
Endirir mürğü həvadən, balü pərlər yandırır,
Dağlar da tab eyləməz, səngü şəcərlər yandırır,
Bu müsibət doğrudur canü ciərlər yandırır,
Həq bilir başdan-ayağa yandı gör Sevan bu gün.

## MÜSƏDDƏSLƏR

Gəl çəkmə cahan qeydini sən, can belə qalmaz,
Qan ağlama çox, dideyi-giryan belə qalmaz,
Gül vaxtı keçər, seyri-gülüstan belə qalmaz,
Hər ləhzə, könül, xürrəmü xəndan belə qalmaz,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Əzbəs bu camal ilə ki, canan ola fani,
Bu şivə ilə qəddi-xuraman ola fani,
Bu gərdəni-xoş, zülfi-pərişan ola fani,
Bu əhsəni-surətdəki, insan ola fani,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Sultani-cahan olsa, gedər, canə inanma,
Bir gün pozulur, şövkətü divanə inanma,
Çün baqi-deyil, mülki-Süleymanə inanma,
Gər aqil isən, gərdişi-dövranə inanma,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Yüz mövsumi-xoş xürrəm olub illər açılsa,
Yüz lalə bitib susənü sünbüllər açılsa,
Yüz bağı-cahan tazələnib güllər açılsa,
Könlüm ki, açılmaz neçə müşküllər açılsa,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Ah, aldı məni dərdi-fəraqü qəmi-həsrət,
Sərməstü xərab etdi yenə badeyi-heyrət,
Bir möhrü vəfa etməli yox kim ola rəğbət,
Fövt eyləmə, gəl var ikən əldə dəmi-fürsət,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

Fikr etsən əgər dəhrin işi bəhri-bəladır,
Bir dürri-girənmayəsi min canə bahadır,
Hər nəqşi bir ayineyi-isbati-xudadır,
Məqsudi-dü aləm yenə təhsili-rizadır,
Bir cam yetir, saqi, bu dövran belə qalmaz,
Tən bir gün olur xak ilə yeksan, belə qalmaz.

* * *

Xəstə düşdüm, gələn yoxdur üstümə,
Qərib öldüm, bikəs öldüm, yad öldüm,
Xəbər olsun yaranıma, dostuma,
Qərib öldüm, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

Xırdacalar yığıldılar yanıma,
Fikr elədim odlar düşdü canıma,
Başdan belə yazılıbdır şanıma,
Qərib öldüm, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

Dərdim çoxdur, birin doğru sanan yox,
Məgər burda qəm hərfini qanan yox?
Bir ah çəkib cigərindən yanan yox,
Qərib öldum, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

Ağla, didəm, qanlı yaşın sel olsun,
Söyləməyə gizli dərdin dil olsun.
Kimim vardır qohum-qardaş, el olsun,
Qərib öldüm, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

Vidadiyəm, təbib dərdim bağlamaz,
Sinəm başın düyünləməz, dağlamaz,
Yad yığılar, sərin baxar, ağlamaz.
Qərib öldüm, bikəs öldüm, yad öldüm.
Ey sevdiyim, səndən qeyri kimim var,
Gəl üstümə, aman öldüm, dad öldüm.

## MÜSİBƏTNAMƏ

Gəl, könül, bir ibrət al bu gərdişi-dövranə bax,
Cami heyrətdən dəmi məxmur olub məstanə bax,
Tut təfəkkür damənin bir dəm dili-heyranə bax,
Kimsəyə qılmaz vəfa bu dəhri-bipayanə bax,
Olma məmurinə rəqib, axiri viranə bax.

Bivəfadır, mülki-dünya malına aldanma çox,
İzzü cahü dövlətü iqbalına aldanma çox,
Tutma ümmid əqlü fəhm əhvalına aldanma çox,
Qövmü qardaşü rəfiq əqvalına aldanma çox,
Hər biri bir rəmz ilə səndən olur biganə bax.

Şərhi bimümkün gəlib-getmiş cahana çox hümam,
Hər biri əsrində bir sahibhünər, aliməqam,
Şah ola, istər gəda, divanə, ya əhli-nizam,
Yetməmiş məqsudinə aləmdə heç ərbabi-nam,
Cümləsin məqtul edib bu bisərü samanə bax.

Dinlə, ey tuğyani-möhnət, bir rəvayət söyləyim,
Didələr giryan edən şərhi-məlamət söyləyim,
Dərdi-bidərmanü daği-binəhayət söyləyim,
Bu sözə nisbət sənə gəl bir hekayət söyləyim.
Lütf edib qıl bir nəzər bu müxtəsər dəstanə bax.

Noldu gör ol sərvəri-dövran, əmiri-möhtərəm,
Mənbəi-cudü səxavət, mədəni-lütfü kərəm,
Mərdi-meydan, əhli-ürfan, sahibi-tiğü qələm,
Ərseyi-rəfətdə guya kim, tikilmiş bir ələm,
Hakimi-Şirvan-Şəki, yəni Hüseyn xanə bax.

Şirdil bir mərd idi çox, şövkətü şəni əzim,
Səfşikən, ədafikən, şəmşirzən, bixovfü bim.
Sərvəri-sahib həşəm, ətbai çox, mülki qədəm,
Xoşnüma, xəndan liqa, şirin süxən, təbi həlim,
Neylədi, gəl gör, müqəddər hikməti-yəzdanə bax.

Haqpərəst, əhli-təvəkkül, pakdil, safi-cigər,
Baki yox heç kimsədən, cahü cəlalı biqədər,
Bilməmiş rəşkü həsəd insanı eylər dərbədər,
Bağlamış onunla kin əlavü ədna sərbəsər,
Saldılar hər rəng ilə dəva tutub, böhtanə bax.

Hacı Əbdülqadirü Hacı Məhəmməd kinədar,
Saldılar yüz dürlü dəva, oldular ondan fərar,
Etdilər ol dəmdə Dar doqqazı səngər istivar,
Tapdı düşmən hər tərəf üz, oldu qovğa aşikar,
Buldular fürsət, tamami girdilər meydanə bax.

Kəndxudalar göndərib oğlilə çox and eylədi,
Etmədi bir sud hərçənd əhd-peyvənd eylədi,
Hacı Əbdülqadir ol dəm gör necə fənd eylədi,
Tutdu onların təmamın, yerbəyer bənd eylədi,
Verdi İbrahim xana, tez saldılar zindanə bax.

Gör nələr gəldi o dəm, Hacı Məhəmməd başına,
Tutdurub həm onu dəxi qoydu qələ daşına,
Qaldı bir il verdi can axir əcəl pürxaşına,
Böylədir hər kim olursa xain öz yoldaşına,
Getdi hər nə var isə mərdümliyi məccanə, bax.

Ol Qarabağ hakimi dövlətli İbrahim xan,
Əvvəlü axir onunla ta yaman idi, yaman,
Gördü fürsət gəldi, fövt etmək deyil əqlə nişan,
Oldu Əbdülqadir ilə müttəfiq həm ol zaman,
Yığdılar bihədd ləşkər, car edib hər yanə bax.

Qıldı bu sərriştədə hər hal ol səyü əmək,
Etmədi təqsir hər dəm verdi simüzər, yemək,
Gəldilər Carü Tala bəylər təmami binəmək,
Keçdi çox cənglər aradan, tul olur şərh eyləmək,
Öldü əvvəl Hacı xan tək növcəvan fərzanə bax.

Çəkdi Ümmə xanü Əhməd xan, Cöngətay çəri,
Hər biri Dağıstan içrə külli-ləşkər sərvəri,

Biləsincə necə başçı, cümləsi meydan əri,
Bir tərəfdən göndərib topxanə verdi ləşkəri,
Arxa durdu onlara valiyi-Gürcüstanə bax.

Eylədi hər bir qoşun gəldikcə bir dürlü savaş,
Hər tərəfdən qoydular can almağa meydanə baş,
Keçdi müddət, düşdü xalqa eylə bir qəhti-məaş,
Olmayıb bir böylə zillət mütləqa aləmda faş,
Gəlməyib böylə müsibət Rumə, ya İranə bax.

Artdı qovğa üz verib hər ləhzə bir cəngü cidal,
Elə kim gəlməz hesaba oldu məqtulü qital,
Gördü kim ol mərdi-meydani-bəla, ol pürməlal,
Günbəgün etməkdədir əyyam onu aşüftəhal,
Dəmbədəm salmaqdadır dövran onu nöqsanə bax.

Fətəli xan yanına əzm etdi ol hicrət qılıb,
Neylədi ol mərd gör, əda ikən hörmət qılıb,
Çəkdi ləşkər biləsincə neçə yol qeyrət qılıb,
Etdi məyus onu həm iqbal, binüsrət qılıb,
Neyləsin insan əgər yar olmasa sübhanə bax.

Gah Ağası xan Şirvan hakimilə bir zaman,
Baş qoyub ədayə qarşı atdılar meydanə can,
Eylə bir cəng etdilər kim, su yerinə axdı qan,
Hasili ol dərdiməndə vermədi nüsrət, inan,
Atəşi-meydanlara etdi özün pərvanə bax.

Döndü çün iqbalü dövlət gəlmədi pərva ona,
Olmadı hər yana üz tutdusa bir məva ona,
Hər nə var yarü müsahib oldular əda ona,
Hər tərəfdən verdilər qətl etməyə fitva ona,
Cümlə xunxarü nəməksiz ol Şəki, Şirvanə bax.

Gör necə döndü tamaşa qıl onun əqranına,
Aşkaravü nihan qəsd etdilər ta canına,
Duydu halı hər tərəfdən yığdı ləşkər yanına,

Olmadı, çün çarə yox haqdan işin imkanına,
Hər nə tədbir ilə səy etdisə ol mərdanə bax.

Cəm olub qətlinə onun bir neçə əşrarlər,
Bilməyən nanü nəmək, bihörmətü biarlər,
Ölməyə, öldürməyə bərk etdilər iqrarlər,
Cümlə öz əqvamü əqranı tamam xunxarlər,
Qövmü qardaşa inan, gəl, dosta bax, yaranə bax.

Bir günorta vaxtı xali buldular fürsət məgər,
Qalmamış getmiş dərində hiç dərbandan bəşər,
Doldular ol xabi-qəflətdə yatarkən bixəbər,
Belədir təqdir "iza caəl qəza əməl-bəsər"[1],
Özgə fikrə düşmə çox, haqdan gələn fərmanə bax.

Çıxdı ta olcaq xəbər ədayə qarşı bildirəng,
Bir zaman naçarü tənha eylədi şiranə cəng,
Neyləsin, yox dəsti-bəxt, iqbalü nüsrət payi-ləng,
Hər tərəfdən üstünə yağdırdılar tiğü tüfəng,
Aqibət məcruh olub, qərq oldu əlvan qanə bax.

Etdilər sülh üzrə ol dəm bir neçə qövlü qərar,
Oldu razı, bildi yalan olduğun biixtiyar,
Saxlayıb bir həftə axır qətl edib məcruhü zar,
Külli-varın etdilər taracü yəğma, tarümar,
Əhli-beyti cümlə düşdü növhəvü nalanə bax.

Əl qoyub cümlə fəsadə tikdilər şeytan evin,
Etdilər guya xərabə din evin, iman evin,
Açdılar babi-fəsad, bağladılar ehsan evin,
Qırdı öz övladını, yıxdı onun sübhan evin,
Hacı Qadir tək cahanın fitnəsi şeytanə bax.

Gəl yetər, ey zülmə rağib, səngdil, səxtciyər,
Munca xunriz olma, eylə zülmi-nahəqdən həzər,
Yadına gəlməz məgər ruzi-cəza, ey bixəbər,

[1] Qəza gələndə göz kor olar.

Noldu, haqdan bir zaman şərm eylə, çıx şamü səhər,
Guş edib məzlumlərdən ol gələn əfğanə bax.

Ah kim ta aləm olmuş, mehrü mahın mənzili,
Eyləmiş rövşən dili, ahi-siyahın mənzili,
Gah düşər nisbət gədayə padişahın mənzili,
Gəhi şiri-nər yerin eylər rubahın mənzili,
Dövri-bərəksə nəzər qıl, çərxi-kəcgərdanə bax!

Kimsə qalmaz nikü bəd, ancaq qalır aləmdə ad,
Namurad eylər cahan, hər kim ki, istər bir murad,
Bu "Müsibətnamə" tarixin bil, ey fərrux-nihad,
İki yeddi, iki qırx olmuşdu min yüzdən ziyad,*
Oldu mərhumü şəhid ol gövhəri-yekdanə bax.

Belədir dövran işi, hər gündə bir al eyləmiş,
Aqili nadan ilə pəjmürdə əhval eyləmiş,
Üz verib namərdə, hərdəm mərdi pamal eyləmiş,
Ey Vidadi, gəl ki, bu heyrət məni lal eyləmiş,
Gör nələr qıldı fələk Müştaq tək insanə, bax.

---

[1] Min yüz doxsan dörd – miladi 1780

# MOLLA PƏNAH VAQİF

*XVIII əsr Azərbaycan ədəbiyyatının böyük klassiki Molla Pənah Vaqif 1717-ci ildə Qazax mahalının Salahlı kəndində doğulmuşdur. Mükəmməl təhsil görüb dövrünün ən ziyalı şəxsiyyətlərindən biri olmuş, ana dilinin bütün incəliklərinə yiyələnməklə bərabər, ərəb və fars dillərini də bilmişdir.*

*Mütərəqqi ictimai fəaliyyətində görkəmli dövlət xadimi səviyyəsinə yüksəlmiş, yalnız Qarabağ xanlığının daxili siyasətinin deyil, bütün Azərbaycanın siyasi həyatının istiqamətlənməsində fəal iştirak etmişdir.*

*Azərbaycan ədəbiyyatı tarixində ən böyük xidməti klassik üslubla şifahi xalq şeri ənənələrini üzvi surətdə birləşdirə bilməsidir. Azərbaycan milli ədəbi dilinin inkişafında misilsiz rolu olmuş, ana dilinin bütün zənginliyini, zərifliyini açıb göstərmişdir.*

*İstedadı, biliyi, yüksək mənəvi sifətlərinə görə xalq onun haqqında "Hər oxuyan Molla Pənah olmaz" məsəlini yaratmışdır.*

*1797-ci ildə Şuşa şəhərində Məhəmməd bəy Cavanşir tərəfindən qətlə yetirilmişdir.*

## QOŞMALAR

O şux qəmzələrin, xəncər kirpiyin
Gündə olur yüz min qan qabağında
Xumar-xumar baxan ala gözlərin
Gərəkdir verəsən can qabağında.

Qaşın qabağında sığallı birçək,
Sayə salmış üzə şölə mübarək,
Amma iki dəstə tər bənövşə tək
Qoymuş al yanağın yan qabağında.

Zülfündən qoxuşar gülü reyhanlar,
Qurban hər muyinə yüz min cavanlar,
Pişvazına gəlir hurü qılmanlar,
Məlayik durmuşlar san qabağında.

Vaqif qurban zənəxdanın çahinə,
Şirin gülüşünə, xoş nigahinə,
Qul olasan belə xublar şahinə,
Durasan hər axşam, dan qabağında.

* * *

Xublar arığından yarımaq olmaz,
İgidin həmdəmi gərək çağ ola.
Bəstə boylu gərək, mina gərdənli,
Zülfü siyah, var əndamı ağ ola.

Səhər dura sürmə çəkə gözünə,
Birçəklərin həlqə qoya üzünə.
Cilvələnə, sığal verə özünə,
İşi, gücü gülüb-oynamaq ola.

Döşün açıb, əl dəyəndə yaxıya,
Ağ gülün bağrına peykan toxuya,
Bədənindən müşkü ənbər qoxuya,
Zülfü gərdənində bir qucaq ola.

Bir mayabud gərək, baldırı yoğun,
Sərasər ət basa dizin, topuğun,
Əl dəyəndə dura buğun-babuğun
Titrəyə, quyruqdan çox yumşaq ola.

Həyası üzündə, əqli başında,
Öldürə Vaqifi gözü qaşında.
Ya on üç, ya on dörd, on beş yaşında,
Nə ondan böyükrək, nə uşaq ola.

* * *

Xeyli vaxtdır ayrılmışıq yar ilən,
Gördük, amma tanışmadıq, ayrıldıq,
Qaldı canda gizli-gizli dərdimiz,
Bircə kəlmə danışmadıq, ayrıldıq.

Qərib-qərib durduq biganələr tək,
Soyuq-soyuq baxdıq divanələr tək.
Dönmədik başına pərvanələr tək,
Eşq oduna yanışmadıq, ayrıldıq.

Yarım saat bir arada qalmadıq,
Eşq atəşin canımıza salmadıq,
Yalvarıban yarın könlün almadıq,
Elə getdi, barışmadıq, ayrıldıq.

O zaman ki, aşnalığı tərk etdik,
Cüda düşdük, xeyli ciyər bərkitdik,
Aralıqdan könül quşun ürkütdük,
Bir-birilə konuşmadıq, ayrıldıq.

Vaqif sevdi bir iqrarsız bivəfa,
Badə getdi tamam çəkdiyi cəfa,
Görüşübən eyləmədik xoş səfa,
Qucaqlaşıb sarışmadıq, ayrıldıq.

* * *

Duruban eşqilə güzar eylədim,
Bir pərinin oldum mehman evində.
Zərrəcə görmədim hörmət, izzətin,
Qaldım elə, peşman-peşman evində.

Ta ki, məni gördü ol qəlbi qara,
Çəkdi yaşmağını o gül rüxsara,
Döndərdi üzünü, tutdu divara,
Sanasan ki, yoxdur insan evində.

Dodağı şəkərdir, göftarı şərbət,
Nə fayda, eyləməz şirin məhəbbət.
Məxləsi ki, yoxdur onda bir ləzzət,
Boldur elə acı qəlyan evində.

Keçmə o dilbərin sən otağından,
Tər bənövşə qoxar hər bucağından,
Sanki bir guşədir cənnət bağından,
Açılıbdır güli-əlvan evində.

Vaqif, bir kimsə ki, bizdən yaşına,
Yəqin bil ki, bizdən olmaz aşina,
Gəldiyimiz heç gəlmədi xoşuna,
Tapdım mən halını ürfan evində.

* * *

Siyahtel görmədim Kür qırağında,
Məgər heç yaşılbaş olmaz bu yerdə?
Tərlan könlüm yenə uca dağlara
Havalanıb, hərgiz qonmaz bu yerdə.

Bu diyarda kalağay yox, katan yox,
Sinəm buta, müjgan oxun atan yox.
Sərxoş durub bir nəzakət satan yox,
Heç sövdagar fayda bulmaz bu yerdə.

Bəzək bilməz bu diyarın göyçəyi,
Tanımaz al çarqat, zərrin ləçəyi,
Ağ buxaq altından həlqə birçəyi
Tər məmə üstündən salmaz bu yerdə.

Yarın xəyalilə bu gün mən şadəm,
Qəribliyə düşsəm, qan ağlar didəm.
Pərisi yanında olmayan adəm
Nə yaxşı sağ qalır, ölməz bu yerdə.

Desələr ki, Vaqif, nə oldu sənə,
Rəngi-ruyin dönüb heyvaya genə,
Əli tər məmədən üzən kimsənə
Saralıban necə solmaz bu yerdə.

* * *

Bu gün bir əcaib gözəl sevmişəm,
Beləsi olammaz heç vilayətdə,
Sanasan ki, cəmalından nur yağır,
Yaranıbdır, yarəb, nə xoş saətdə.

Al çarqatdan yaşmaq tutub çənəyə,
Simin yaraşdırıb zər nimtənəyə,
Deyildir bərabər heç kimsənəyə,
Xubların şahıdır şanü şövkətdə.

Gülabilən zülfün cığasın əyər,
Üzünə baxanda qan olur ciyər,
Göydən yerə enmiş mələkdir məgər,
Yoxsa insan olmaz belə surətdə.

Biləyi, bazusu, hər bəndi gözəl
Gərdəndə zülfünün kəməndi gözəl,
Ayna tutdu, durdu bəzəndi, gözəl,
Sallandı, görəsən, nə qiyamətdə.

Sona cığası tək sərində teli,
Ağ gül yarpağı tək ayağı, əli,
Cismi dolu, nazik bədəni, beli,
Görməmişəm dilbər bu nəzakətdə.

Ayıraydın obasından, elindən,
Bir xəlvətə tuta idin əlindən,
Əməydin ağzından, şirin ləbindən,
Görəydin necədir dadda, ləzzətdə.

Novcavanlar qoy həmişə var olsun,
Amma ki, bizlərdən xəbərdar olsun.
Vaqifin duası sənə yar olsun!
Səni, haqq saxlasın ömrü dövlətdə.

* * *

Bir üzü gül, rəngi lalə, zülfü tər,
Gəştə çıxıb, dərər taza bənəfşə.
Dəstə-dəstə sancıb buxaq yanına,
Yaraşıbdır o şahbaza bənəfşə.

Cismi mərmər, həlqə zülfləri qara,
Onu görən məcnun olur – avara,
Hörüb saçlarını, salıb qatara,
Düzüb telə, həm qotaza bənəfşə.

Yaşı on səkkiz yenicə yetmiş,
Gözəllikdə tamam xəlqi mat etmiş,
Gəştə çıxmış – yar gəldiyin eşitmiş
Dağa salıb bir avaza bənəfşə.

Göysün açıb, ağ qolların çırmasın,
Elə gəzsin, onu rəqib görməsin,
Əğyar ilə çıxıb seyrə, dərməsin,
Layiq olmaz anlamaza bənəfşə.

Sən sallanıb qabağımdan gedəndə,
Hərgiz qalmaz səbrü ixtiyar məndə.
Vaqif zülflərini tərif edəndə,
Gərəkdir ki, əvvəl yaza: bənəfşə.

* * *

Bir gözəl ki, şirin ola binadan,
Yüz il getsə onun dadı əksilməz.
Təzəliyi, köhnəliyi bir olur,
Gövhər tək qiymətdə adı əksilməz.

Gözəllikdən düşməz heç əsilzada,
Günbəgün qaməti dönər şümşada,
Mehrü məhəbbəti olur ziyada,
Etibarı, etiqadı əksilməz.

Nə qədər ki, yüzə yetirsə yaşı,
Ta ki, həkdən düşə, titrəyə başı,
Genə can almağa gözilə qaşı,
Qəmzəsinin heç cəlladı əksilməz.

Cövhəri pak olur təzə cavandan,
Hərgiz əl götürməz şövkətü şandan,
Müjgan xədənglərin keçirir candan,
Peykanının heç poladı əksilməz.

Vaqif, istər isən görəsən ləzzət,
Gəl sev bir dərd bilən, əhli-məhəbbət,
Novcavanlar sevən heç olmaz rahət,
Gecə-gündüz heç fəryadı əksilməz.

* * *

Doldu dimağıma zülfün ənbəri,
Valeh oldu könül həvadən sənə.
Əlim yetməz – namə yazıb dərdimi
Göndərirəm badi-səbadən sənə.

Oturuşun gözəl, duruşun gözəl,
Sallanışın gözəl, yerişin gözəl,
Xoyun, xülqün gözəl, hər işin gözəl,
Bəxş olub bu xubluq xudadən sənə.

Dodaqların oxşar ləli-Yəmənə,
Yada düşdü, bağrım qan oldu yenə,
Siyah tel düzürsən bəyaz gərdanə,
Düşübdür bu qayda sonadən sənə.

Fikrü xəyalındır könlüm zinəti,
Şirin sözlərindir ağzım ləzzəti,
Sənsən mənim ömrüm, günüm vəhdəti,
Yetişməsin, ya rəb, bəladən sənə.

Qəm evində saldın küncə Vaqifi,
Eylədin muyindən incə Vaqifi,
Neçün incidirsən munca Vaqifi,
Nə hasil bu cövrü cəfadən sənə?

* * *

Bir xəlvət yer ola, əğyar olmaya,
Onda söhbət edək ikimiz belə.
Əl-ələ tutuşub deyək, gülüşək,
Tutaq bir xoş ülfət ikimiz belə.

Qol-boyun oturaq, sürtək üz-üzə,
Baxaq bir-birmizə göz süzə-süzə.
Gah-gah qucaqlaşıb köyüs-köyüsə
Görək ləbdən ləzzət ikimiz belə.

Sürmələnsin ala gözlər şux olsun,
Siyah kirpik ucu almaz ox olsun,
Səg rəqiblər aralıqdan yox olsun,
Gəzək bir fərağət ikimiz belə.

Doyunca zövq alaq nazü qəmzədən,
Əndişə çəkməyək heç bir kimsədən,
Hər gecələr şirin-şirin sübhətən
Eyləyək hekayət ikimiz belə.

Vaqif, yardan eşit gələn cavabı,
Açaq üzdən, gözdən tamam niqabı,
Gəh-gəh içib sərxoş olaq şərabı,
Gündə sürək vəhdət ikimiz belə.

* * *

Sərasər bir yerə yığılsa xublar,
Sənin bir muyinə tay ola bilməz.
Günəş təki şölə verər camalın,
Belə gözəllikdə ay ola bilməz.

Heç gözəli sən tək şux görməmişəm,
Nə fayda, hüsnünü çox görməmişəm.
Uzun kirpiyin tək ox görməmişəm,
Qaşların tərzində yay ola bilməz.

Həsrətindən bağrım qan ilən dolub,
Heyva təki rəngim saralıb-solub,
Bu xubluq ki, həqdən sənə bəxş olub
Heç kimsəyə belə pay ola bilməz.

Qəddin şahbaz, ağ bədənin səmən tək,
Yanağın lalədən ziyada göyçək.
Ustad səni çəkib manəndi-mələk,
Bundan artıq həqqü say ola bilməz.

Vaqifəm, mən sənə heyran olmuşam
Qaşların yayına qurban olmuşam.
Dərdindən didəsi giryan olmuşam,
Qanlı yaşım kimi çay ola bilməz.

* * *

Dəhanın sədəfdir, dişlərin inci,
Sanasan ağızın püstədir, ay qız!
Xumar gözlərini sevəndən bəri,
Dərdə düşüb canım xəstədir, ay qız!

Sərasər əndamın təzə qar kimi,
Zülfün gərdənində şahimar kimi,
Rəngi bəyaz, özü xırda nar kimi,
Qoynundakı əcəb nəstədir, ay qız!

Niqab çəkib məndən yaşınma, zalım,
Pərişan olubdur mənim əhvalım,
Əqlü huşum mənim, fikrü xəyalım
Şux gözdə, qəmzədə bəstədir, ay qız!

Cəmalın günəşdir, qəmərdir üzün,
Şəkərdir dəhanın, şirindir sözün,
Yağıdır müjganın, cadudur gözün,
Cəllad kimi qəmzən qəsdədir, ay qız!

Vaqifəm, mən Məcnun, sən mənim Leylim,
Baxdıqca, gözümdən tökürəm seylim,
Mən sənə mailəm, səndədir meylim,
Deme, səndən qeyri kəsdədir, ay qız!

* * *

Badi-səba, bir xəbər ver könlümə,
Ol güli-xəndanım neçün gəlmədi?
Xəyalım şəhrini qoydu viranə,
Sərvərim, sultanım neçün gəlmədi?

Sərxoş yerişinə qurban olduğum,
Görməyəndə dəli-devran olduğum,
Mina gərdəninə heyran olduğum,
Sərvi-xüramanım neçün gəlmədi?

Qaşı kaman, kirpikləri qəməlim,
Ağzı şəkkər, dodaqları yeməlim,
Əlvan kəlağaylı, bəyaz məməlim,
Sinəsi meydanım neçün gəlmədi?

Mehrabü mənbərim, Kəbeyi-ülyam,
Əqlim, huşum, canım, hər dinim, dünyam,
Elim, günüm, obam, Misrü Züleyxam,
Yusifi-Kənanım neçün gəlmədi?

Nəsrin binaguşlum, bənəfşə muylum,
Pərilər tələtlim, məlaik xoylum,
Büllur lətafətlim, sənubər boylum,
Huriyü qılmanım neçün gəlmədi?

Ağzı xeyir sözlüm, dili diləklim,
Bir türfə ağ əllim, gümüş biləklim,
Qarıçay cilvəlim, tavus bəzəklim,
Libası əlvanım neçün gəlmədi?

Vaqif, ilə döndü bir saətimiz,
Nə səbrimiz qaldı, nə taqətimiz.
Olur indən belə qiyamətimiz;
Gəlmədi cananım, neçün gəlmədi?

* * *

Boyun surahıdır, bədənin büllur,
Gərdənin çəkilmiş minadan, Pəri!
Sən ha bir sonasan, cüda düşübsən
Bir bölük yaşılbaş sonadan, Pəri!

İxtilatın şirin, sözün məzəli,
Şəkər gülüşündən canlar təzəli,
Ellər yaraşığı, ölkə gözəli,
Nə gözəl doğubsan anadan, Pəri!

Üz yanına tökülübdür tel nazik,
Sinə meydan, zülf pərişan, bel nazik,
Ağız nazik, dodaq nazik, dil nazik,
Ağ əllərin əlvan hənadan, Pəri!

Avçısı olmuşam sən tək maralın,
Xəyalımdan çıxmaz hərgiz xəyalın,
Ənliyi, kirşanı neylər camalın,
Sən elə gözəlsən binadan, Pəri!

Günəş təki hər çıxanda səhərdən
Alırsan Vaqifin əqlini sərdən.
Duaçınam, salma məni nəzərdən,
Əksik olmayasan sənadan, Pəri!

* * *

Bu necə zülmdür mənə eylərsən,
Adam məgər bir insafa gəlməzmi?
Bir gün görərsən ki, vallah, ölmüşəm
Bu qədər dərd çəkən axır ölməzmi?

Xubların bəzisi necə zad olur,
Yarın qəmgin qoyar, özü şad olur,
Bir sevgi ki, sevgisindən yad olur,
Məgər onun yaxşılığın bilməzmi?

Xublarda adətdir, nəzakət satar,
Genə xəyalını xəyala qatar,
Gözəl olan məgər başın dik tutar
Aşiqinə doğru heç əyilməzmi?

Eşq oduna yandı canım sərbəsər,
Allaha bax, ey zalimü sitəmkər,
Aşiqinə qanlar ağladan dilbər
Rəhmə gəlib göz yaşını silməzmi?

Bir pəri olaydı bu dəmdən ötrü,
Özün öldürəydi adəmdən ötrü,
Qədr bilən yaxşı həmdəmdən ötrü
Vaqif, can üzülür, bəs üzülməzmi?

* * *

Açıqbaşda əgər olsa bir dilbər,
Onda bu nişanlar müəyyən gərək,
Əndamı ayinə, qəddi mötədil,
Siyah zülfü qamətinə tən gərək.

Yanağı laleyi-bahari kimi,
Ləbləri yaqutun kənari kimi,
Bir danə nasüftə mirvari kimi,
Başdan ayağadək ağbədən gərək.

Təmizlikdə ola meylü həvəsi,
Olmaya aşiqə nazü qəmzəsi,

Gül təki qoxuya nitqü nəfəsi,
Zülfü ya bənəfşə, ya səmən gərək.

Əl-ayağı qaidədə, disturda,
Saqi fərbeh, topuqları çuxurda,
Bir qat ət içində, sümüyü xırda,
Ağzı-burnu nazik, üzü gen gərək.

Növrəsidə, on dörd, on beş yaşında
Eyb olmaya kirpiyində, qaşında,
Həyası üzündə, əqli başında,
Qulluqda, söhbətdə müstəhsən gərək.

Tavus kimi cilvələnə hər səhər,
Bəzək verə camalına sərbəsər,
Dindirməmiş verə könüldən xəbər,
İşarə anlayıb hal bilən gərək.

Yaşadıqca cavanlana, enlənə,
Bir hicabda, bir pərdədə əylənə,
Nitqü nəfəsindən canlar dinlənə,
Şirin danışıban xoş gülən gərək.

Qövli sadiq ola, hər feli həlal,
Bilməyə kim, fitnə nədir, məkrü al.
Şam kimi qabaqda dura nitqi lal,
Kəsilsə də başı, dinməyən gərək.

Vaqif, yaxşı canan gərək can üçün,
Nədir çox çalışmaq bu cahan üçün,
Bir gözəl lazımdır bizim xan üçün,
Vali qulluğunda ərz edən gərək.

* * *

Bulud zülflü, ay qabaqlı gözəlin,
Duruban başına dolanmaq gərək,
Bir evdə ki, belə gözəl olmaya,
O ev bərbad olub talanmaq gərək.

Əndamı ağ gərək, sinəsi mərmər,
Siyah zülfü qamətinə bərabər,
Qoynu içi guya müşklə ənbər,
Basdığı torpağı yalanmaq gərək.

Sərxoş durub sarayından baxanda,
Ağ gərdənə həmayillər taxanda,
Gözə sürmə, qaşa vəsmə yaxanda,
Canım eşq oduna qalanmaq gərək.

Çıxa sarayından canlar alan tək,
Xişmə gələ gəh-gəh qəhri olan tək,
Şahmar zülfü dal gərdəndə ilan tək,
Hərdəm tərpənəndə bulanmaq gərək.

Vaqif, sənin işin müdam ah olsun,
Səg rəqibin ömrü qoy kütah olsun.
Həmdəmsiz kimsənə əgər şah olsun,
Gədadır o kimsə dilənmək gərək.

* * *

Bivəfasan, səndən üz döndərmişəm,
Yalançıya, biiqrara baxmaram,
Səni ox kirpiyə həsrət qoyaram,
Bağrın olsa para-para, baxmaram.

Harda görsən bir sevgili kimsənə,
İstər ki, xəyalın tez ona dönə,
Mənim yarım gərək baxa bir mənə;
Qeyri üzə baxan yara baxmaram.

Niqab çəkib üzə, xalı gizlərəm
Siyah zülfü, rəngi-alı gizlərəm.
Qönçə təki gülcamalı gizlərəm,
Sallam səni ahü zara, baxmaram.

Yanımda etibar sata bilməzsən,
Boynundan günahın ata bilməzsən,
Bizimlə ixtilat qata bilməzsən,
Danışma ki, o göftara baxmaram.

Vaqifi derlərdi çox gözəlsevən,
Elə bildim sən də onun kimisən.
Bildim indi, vallah, səndəkini mən:
Bivəfasan, biiqrara baxmaram.

* * *

Bir əndamı nəsrin, dodağı qönçə,
Bir qaməti gülbün yara aşiqəm,
Olsa yüz üzü gül, girməz eynimə,
Mən ancaq bir gülüzara aşiqəm.

Gecələr sübhədək eylərəm nalə,
Hərgiz düşməz könlüm özgə xəyalə,
Bir gərdəni mina, ağzı piyalə,
Bir ləhcəsi şirinkara aşiqəm.

Bir buxağı turunc, sinəsi meydan,
Bi sözü cəvahir, mirvari dəndan,
Bir maral baxışlı, kirpiyi peykan,
Bir qaşları zülfüqara aşiqəm.

Bir güləndə ləblərindən bal axan,
Bir bəzənib sərxoş tavus tək çıxan,
Bir niqab altından pünhani baxan,
Bir əcaib xoşgöftara aşiqəm.

Vaqifəm, bədəndən canım dağılır,
Məcnun kimi xanimanım dağılır,
Görməyəndə din-imanım dağılır;
Gecə-gündüz mən didara aşiqəm.

* * *

Ey cavan qız, məndən belə gəzmə gen,
Mən sənin üzündə xalı sevmişəm.
Bənd olmuşam şirin-şirin sözünə,
Şəkər dodağında balı sevmişəm.

Üzün ağ, dəyirmi, gözün məstanə,
Baxışın bağrımı döndərdi qana,
Ağzın sədəf, dişlərimdir dürdana,
Əcaib cəvahir, ləli sevmişəm.

Qaşların çəkildi yaylara dönür,
Ağlaram, göz yaşım çaylara dönür,
Bəzənir, illərə, aylara dönür,
Canlar alan bir maralı sevmişəm.

Həlqələnir zülfün buxaq yanında,
Yay qaşların ucu qulaq yanında.
Zənəxdan içində, yanaq yanında,
Qara telli bir xətalı sevmişəm.

Çox gözəlsən, amma xoyundur yaman,
Baxmazsan üzümə mənim çox zaman,
Vaqif deyir, sənin əlindən aman!
Mən biçarə nə həvalı sevmişəm!

* * *

Çox zamandır, yarın həsrətindəyəm,
Gələydi, bir onu barı görəydim,
Bülbül tək fəryadım çıxdı fələkə,
Cənnət iyli gülüzarı görəydim.

Basaydı üzümə gül ayağını,
Öpəydim üzünü, həm dodağını,
Gah açaydım ağ sinəsin bağını,
Qoynundakı qoşa narı görəydim.

Gah alaydım gərdənini qucağa,
Gah üzüm sürtəydim zülfə, buxağa,
Gah da oturaydım qabaq-qabağa,
Danışaydı, xoş göftarı görəydim.

Bilirmola bağrımdakı yaranı,
Necə yaxmış mən tək günü qaranı,
Yar məndən kəsməzdi belə aranı,
Bu qoymayan kimdir, barı, görəydim.

Vaqifəm, hicrandır mənim məhşərim,
Gecə-gündüz canan olmuş əzbərim,
Kərəm eyləyibən gəlsə dilbərim,
Kəsilirmi ahü zarı görəydim?

* * *

Ey mələk xoylu, ey tuba boylu yar,
Kuyindir cənnəti-rizvanım mənim.
Huri qılman olsa, girməz gözümə,
Sənsən candan əziz cananım mənim.

Pərim, sənubərim, gülbərgi-tərim,
Gövhərim, yaqutum, ləli-əhmərim,
Hekayətim, fikrim, zikrim, əzbərim,
Xəyalımda şirin nihanım mənim.

Xurşid rüxsarım, qəmər cəbinim,
Baharım, gülzarım, xüldi-bərinim,
Yarım, qəmküsarım, xoş nazəninim.
Gözəlim, göyçəyim, cavanım mənim.

Vəhdətim, xoşgünüm, söhbətim, dəmim,
Fəğfurum, Qeysərim, Cəmşidim, Cəmim,
Xosrovum, xaqanım, şahi-əzəmim,
Padşahım, həm əla sultanım mənim.

Zövqüm, səfam, seyrim, bağım, çəmənim,
Süsənim, sünbülüm, laləm, səmənim,
Xətavü Xotənim, Çinim, Yəmənim,
Hindustanım, Rumum, İranım mənim.

Sözüm, ixtilatım, hər qalü qilim,
Mətləbim, muradım, xatirim, meylim,
Şəkkərim, Şirinim, Gülşahım, Leylim
Züleyxam, Yusifi-Kənanım mənim.

* * *

Bədənin sərasər gül xərmənidir,
Qamətin gözəldir, gözəl sevdigim!
Heç nə istəmənəm iki dünyada,
Sənsən mənim axır-əzəl, sevdigim!

Qul vermişəm bu canımı canına,
Harda olsam, könlüm gələr yanına,
Nə qədər söyləsəm sənin şanına,
Yaraşar müxəmməs, qəzəl, sevdigim!

İraq durma, məndən cüdayı gəzmə!
Sevirsən, ey nazlım, xudayı gəzmə!
Əyri oturub, belə kinayı gəzmə,
Gəl indi mənimlə düzəl, sevdigim!

Ahımı göylərə hər səhər çəkdim,
Kəm çəkmədim, amma mötəbər çəkdim,
Qoynunda nar dərdi ol qədər çəkdim,
Oldu rəngim axır xəzəl, sevdigim!

Xumar gözlərini oyaq qoymasan,
Yıxılan könlümə dayaq qoymasan,
Dərman eyləməyə ayaq qoymasan,
Şikəstə Vaqifdən üz əl, sevdigim!

* * *

Onun üçün uymaz qeyriyə könlüm,
Bir əcəb zibadır mənim sevdigim.
Huri nədir, qılman nədir, mələk nə,
Hamıdan əladır mənim sevdigim.

Zülfləri sünbüldür, yanağı lalə,
Baxışı tən edər vəhşi qəzalə,
Gözləri məstanə, ağzı piyalə,
Gərdəni minadır mənim sevdigim.

Ayna tutar, zənəxdana gül düzər,
Hər muyinə yüz min fitnə-fel düzər,
Bəyaz gərdəninə siyah tel düzər,
Sanasan sonadır mənim sevdigim.

Boyu yaraşıqlı sərvi-xuraman,
Əndamıdır ağ gül, sinəsi meydan,
Kəlağayı gülgəz, libası əlvan,
Bir güli-rənadır mənim sevdigim.

Vaqifəm, zülflərin bəndivaniyəm,
O kaman qaşların mən qurbaniyəm,
Mənə qədr elə kim, gövhər kaniyəm,
Demə ki, molladır mənim sevdigim.

* * *

Səfalar gətirib, təşrif buyurdun,
Qədəm basdın bizə, qurban olduğum.
Az qala ki, sənin həsrətin bizi –
İncəltmişdi – üzə, qurban olduğum.

Sən gəldin, nur doldu evə-otağa,
Gəldiyin yollara canım sadağa,
Durub qurban olmaq sən tək qonağa
Nuşdur canımıza, qurban olduğum.

Mən mayiləm, səndən düşmənəm çaşa
Bulud zülfə, ağ qabağa, ay qaşa,
Qoy doyunca baxsın, etsin tamaşa,
Heyrandı göz-gözə, qurban olduğum.

Sən qəddinə yaşıl-allar geyici,
Vaqif dəxi sənə qəzəl deyici,
Şükr Allaha, deyil adamyeyici,
Nolur gəlsən bizə, qurban olduğum.

* * *

Namə, gedər olsan yarın kuyinə,
Dərdi-dilim o canana degilən!
Bülbülüyəm qönçə gülündən ayrı,
Bağrım dönüb qızıl qana, degilən!

Qurban olum kirpiyinə qaşına,
Sel oluban qarış axan yaşına,
Pərvanələr kimi dolan başına,
Atəş tutub yana-yana degilən!

Din-imanım düz ilqara bağlıdır,
Həsrət canım bir cüt nara bağlıdır,
Mürği-ruhim zülfi-yara bağlıdır,
Çox çəkməsin zülfə şana, degilən!

Qılmış hüsnün şövqü dərdimi əfzun,
Ayrılıq qəmində göz yaşım Ceyhun,
Ağlım başdan getmiş, olmuşam Məcnun,
Bu Vaqifə sən divana degilən!

* * *

Bir fitnə fellinin, üzü xallının,
Bir şirin dillinin qurbanıyam mən.
Bir qənd məqallının, ləb zülallının,
Bir ağzı ballının qurbanıyam mən.

Bir süsən muylunun, səmən boylunun,
Fərištə xoylunun, mələk soylunun,
Bir cənnət kuylunun, tuba boylunun,
Bir şümşad qollunun qurbanıyam mən.

Bir gözü şərlinin, cəng nəzərlinin,
Zülfü ənbərlinin, müşk tərlinin,
Bir səmənbərlinin, zər kəmərlinin,
Bir incə bellinin qurbanıyam mən.

Bir çox ülfətlinin, məhəbbətlinin,
Bir mərhəmətlinin, şəfəqqətlinin,
Bir pəri tellinin, gün tələtlinin
Bir məhcəmallının qurbanıyam mən.

* * *

Ey kirpiyi xəncər, qaşı zülfüqar,
Nöşün məndən xəyalını kəsibsən?
Qoymazsan baxmağa xəttü xalına,
Tamaşayi-cəmalını kəsibsən?

Sək rəqibin fitnəsinə uyubsan,
Neyləmişəm, məndən nə tez doyubsan,
Gecə-gündüz məni təşnə qoyubsan,
Şirin ləbdən zülalını kəsibsən.

Yaşınıbsan, tamam durubsan gendə,
Zülfün yaşmaq altda, saçın gərdəndə,
Görünməz, hər yerin salıbsan bəndə,
Bu qalını, o qalını kəsibsən.

Bu boyda, qamətdə, şövkətdə, şanda
Sən tək gözəl yoxdur cümlə cahanda,
Sərasər bağrımı, keçən zamanda
Göstəribsən, hilalını, kəsibsən.

Məgər ki, aşiqin qəmin yeməzsən,
Bu cövrü cəfadan sən inciməzsən,
Xəstə Vaqif, halın nədir? – deməzsən
Cavabını, sualını kəsibsən.

* * *

Öyünməsin kimsə, gözələm deyib,
Ayrı təhər olur halı gözəlin.
Güləş üzlü, şirin sözlü xoşqılıq,
Ləblərindən axar balı gözəlin.

Qaşı tağ-tağ gərək, qabağı nazik,
Ağzı, burnu, dili, dodağı nazik,
Baldırları yoğun, ayağı nazik,
Var əndamı olur dolu gözəlin.

Yanağı gül, zülfü yasəmən gərək,
Məməsi dik, ağ sinəsi gen gərək,
Haldan xəbər verən, dərdbilən gərək,
Heç olmaya məkrü alı gözəlin.

Yumru ola buxağı, gen ola üzü,
Çox dərdmənd ola, dərd bilə üzü,
Gündə sürmələnə məstanə gözü,
Əli ola al hənalı gözəlin.

Özgə ilən hərgiz olmaya işi,
Qafiyə, qəzəldən çox çıxa başı,
Bulaq tək qaynaya həm gözü qaşı,
Artıq ola həm kamalı gözəlin!

Gözəl gərək əl götürə cəfadən,
Ləzzət görə hər dəm zövqü səfadən.
Vaqifəm, qaçaram mən bivəfadən,
Qurbanıyam bir vəfalı gözəlin.

* * *

Siyah zülfün qəddin ilən bərabər,
Nazik ağ əndamın bəyaz qar, gəlin!
Sallanışın tamam cahana dəyər,
Sənin tək bir gözəl harda var, gəlin!

Məlayiklər gəlir səni salama,
Qəmzən məni çapdı, gəl bax yarama,
Şəkkər qübbəsidir, yoxsa şamama,
Qoynun içindəki qoşa nar, gəlin!

Səni sevən əqli, kamalı neylər,
Dəxi görmüş özgə cəmalı neylər,
Bu dünyada mülkü o, malı neylər,
Hər kim olsa sənin ilən yar, gəlin!

Geyibsən əyninə gül pirəhəni,
Cəmalın şöləsi tutmuş dövrəni,
Nagəhdən gözlərim görəndə səni,
Qalmadı canımda ixtiyar, gəlin!

Həsrətindən Vaqif düşdü dərdə, gəl,
Heç əylənmə irəlidə, gerdə, gəl,
Bir gəlibsən, kərəm eylə, bir də gəl,
Könlüm çəkir sənə intizar, gəlin!

* * *

Məni qərq eylədin qəm dəryasına,
Ey çeşmi-xumarım, nöşün ağladın?
Ey gözüm, nə dəyib köyrək könlünə?
Ey şirin göftarım, nöşün ağladın?

Gərdənində zülfün tər sünbül kimi,
Sonadan üzülmüş qaratel kimi,
Sən gərək güləsən qızıl gül kimi,
Ey lalə rüxsarım, nöşün ağladın?

Olmaya sən məni biiqrar sandın.
Zarafat eylədim, ona inandın,
Nə dəydi könlünə, nədən bulandın,
Dişləri mirvarım, nöşün ağladın?

Bağrım başın şan-şan eylədin, dəldin,
Dönüm gözlərinə, az ağla – öldün;
Deyərdin, gülərdin, belə deyildin,
Mənim cadugərim, nöşün ağladın?

Hər kəs görən dəmdə öz sirdaşını,
Məgər tökər qabağını-qaşını?!
Oda yaxdın ciyərimin başını,
Vaqif der: dildarım, nöşün ağladın?

* * *

Oğrun baxa-baxa, ey çeşmi nərgis,
Dərdə saldın məni, xəstəhal etdin,
Həsrətindən öldüm, öldüm, dirildim,
Nə bir yada saldın, nə sual etdin.

Hər məni görəndə, ey çeşmi yağı,
O qədər eylədin canlar almağı,
Gah göstərdin, gah gizlətdin yanağı,
Axır məni dərdə saldın, al etdin.

Uzun illər sənə qaldım mən həsrət,
Zərrəcə görmədim mehrü məhəbbət.
Hər zaman ki, səndən umdum şəfəqqət,
Bir dava başladım, qalmaqal etdin.

Əzəldən var idi lütfü kərəmin,
Gahbəgah bəriyə seyrü qədəmin,
Vara-vara artdı zülmü sitəmin,
Bilmədim, sonradan nə xəyal etdin!

Həmişə bu idi fikrü xəyalım,
İkimiz bir yerdə həmdəm olalım.
Neyləmişdi sənə Vaqif, a zalım,
Onu qəm əlində payimal etdin.

* * *

Bir bəyaz gərdənli, mərmər sinəli,
Gərdəninə qurban minalar olsun.
Ucu tər cığalı siyah tellərin
Sədqəsi yaşılbaş sonalar olsun.

Nə dedim mən sənə, ey üzü mahım,
Sən məndən küsübsən, ey qibləgahım,
Öldür məni, gər var isə günahım,
Al qanım əllərdə hənalar olsun.

Necə ki, görürsən özün filməsəl,
Camalındır cahan içrə bibədəl,
Özün kimi gərək xoyun da gözəl,
Səndə neçün belə ədalar olsun?

Dost dost ilə əbəs savaşmaz,
Sevənin sevəndən könlü bulaşmaz,
Bikeyf olmaq gözəllərə yaraşmaz;
Gözəldə gərək xoş səfalar olsun.

Eşitdim küsübsən, tərpəndi dərdim,
Yalvarıb könlünü almaq isətrdim,
Qulluğuna namə yazıb göndərdim,
Bizdən sənə çox-çox dualar olsun.

Vaqif, canan ilə tərd oldu ara,
İmdad sənə qaldı, eylə bir çara,
Bir qafiyə qayır, göndər ol yara,
Bəlkə dərdimizə dəvalar olsun.

Ay kənarı qabağında qıy kimi,
Görünür, çulğanır yanağa zülfün.
Sanasan buluddur, ənvər üzünü
Bədr ayı tək almış qucağa zülfün.

Şahmar təki gərdənində bulanır,
Gülab ilə sığallanır, sulanır,
Həlqə düşüb, buxaq altda dolanır,
Baş qoyur, sarılır qulağa zülfün.

Ətrin götürübdür müşkü reyhandan,
Ucu cığalanır çıxır dörd yandan,
Açılanda çarqat tər zənəxdandan,
Nə əcaib durur qırağa zülfün.

Göz doymaz vəsməli kəman əbrudan,
Can üzülməz səmən iyli gəysudan,
Məst edər aləmi ənbərin budan,
Hər gələndə səndəl darağa zülfün.

Xəstə Vaqif onun sərgəştəsidir,
Bağrı qızıl qanın ağuştəsidir,
Hər tari müəttər, can riştəsidir,
Qoyma ki, tökülsün ayağa zülfün.

* * *

Ey şahı xubların, şuxu dilbərin,
Səndən sənubərin xəcaləti var.
Xoş yaraşır sənə diba nimtənə,
Bu bəzəyin genə əlaməti var.

Bu zibü zinətin, şanü şövkətin,
Meraci-rifətin, babi-dövlətin,
Hüsnü-məlahətin, çeşmi-afətin,
Bu qəddü qamətin qiyaməti var.

Məhbubi-müntəxəb, bir ali nəsəb,
Qəmzəsində qəzəb, sən saxla, yarəb,
Gül rüxlü, qönçələb, turuncu ğəbğəb,
Lisanından əcəb hekayəti var.

Olmaz belə adəm, yığılsa aləm,
Mələkdən mükərrəm, əlavü əzəm,
Özü bir şux sənəm, istiğnası kəm,
Bizə əmma hərdəm nəzakəti var.

Qaşı yay, çeşmi şux, müjganları ox,
Cümlə kəsdən artıx, bərabəri yox.
Camalı yanında ay və gün mənsux,
Vaqifin ondan çox şikayəti var.

* * *

Bir zaman havada qanad saxlayın,
Sözüm vardır mənim sizə, durnalar!
Qatarlaşıb nə diyardan gəlirsiz?
Bir xəbər versəniz bizə, durnalar!

Sizə müştaq durur Bağdad elləri,
Gözləyə-gözləyə qalıb yolları,
Asta qanad çalın, qafil telləri,
Heyifdir, salarsız düzə, durnalar!

Xeyli vaxtdır, yarın fərağındayam,
Pərvanə tək hüsnün çırağındayam,
Bir ala gözlünün sorağındayam,
Görünürmü, görün, gözə, durnalar!

Mən sevmişəm ala gözün sürməsin,
Bədnəzər kəsibən, ziyan verməsin,
Saqın gəzin, laçın gözü görməsin,
Qorxuram səfnizi poza, durnalar!

Nazənin-nazənin edərsiz avaz,
Ruhlar tazələnir, olur sərəfraz,
Vaqifin də könlü çox edər pərvaz,
Hərdəm sizin ilə gəzə, durnalar!

* * *

Göz qaldı yollarda, can intizarda,
Gəlmədi canandan təzə bir xəbər.
Mənim taqətim yox qələm tutmağa,
Kim ola ki, yara yaza bir xəbər.

Nə qədər ki, mən ağlaram dəmadəm,
Əhvalım bilirmi ola o həmdəm.
El tamam yağıdır, yoxdur bir adəm,
Verə məndən pərinazə bir xəbər.

Gör hesabın mən çəkdiyim azarın,
Bu dadü fəryadın, bu ahü zarın,
Badi-səba, əgər düşsə güzarın
Söylə xəlvət bu həmraza bir xəbər.

Əzəldən qaməti belə deyildi,
Bir yay qaş oxundan sonra əyildi.
Bağrım dəlindiyin hər yetən bildi,
Yetişmədi tirəndaza bir xəbər.

Bülbülü qönçeyi-xəndan öldürdü,
Pərvanəni şəmi-suzan öldürdü,
Vaqifi atəşi-hicran öldürdü,
Aman, verin o şahbaza bir xəbər.

* * *

Yay qaş bucağında, al yanaq üstə
Nə xoş xumarlanır məstanə gözlər.
Sürməli kirpikdən oxlar çəkilib
Eyləyib bağrımı nişanə gözlər.

Qəmzə peykanilə tökdü qanımı,
Xətalara saldı din-imanımı,
Əgri durdu, süzgün baxdı, canımı
Aldı o şux gözlər, amma nə gözlər.

Siması şəhlayi, tərhi badami,
Baxışı mehriban, özü hərami,
Quldur ona siyah zülfün təmami,
Ola bilməz belə şahanə gözlər.

Səmən iyli, səhabi zülf, ay qabaq,
Qönçə dəhan, dür diş, ərğəvan dodaq,
Münəvvər üz, lalə zənəx, tər buxaq,
Tamam bir yanədir, bir yanə gözlər.

Vaqif ki, düşübdür əğlü kamaldan,
Əksik olmaz başı qovğadan, qaldan,
Nə zülflərdən bilin, nə xəttü xaldan,
Eyləyibdir onu divanə gözlər.

* * *

Ey maral baxışlı, sona sığallı,
Nə gözəldir səndə o qara tellər.
Kəmənd kimi tökülübdür gərdənə.
Dönübdür sərasər şahmara tellər.

Sənə sığal verib, əcəb tər düşüb,
Hörülüb qəddilən bərabər düşüb,
Sanasan mələkdən balü pər düşüb,
Düzülüb dalında qatara tellər.

Bənəfşədən tazə, sünbüldən gözəl,
Ötüb ucu düşüb o beldən gözəl,
Heç tel görməmişəm bu teldən gözəl,
Olmayıbdır belə aşkara tellər.

Sənə heyran olub xalqın çoxusu,
Görənlərin kəsilibdir yuxusu,
Müşkü ənbər kimi gəlir qoxusu,
Dönüb Çindən gələn əttara tellər.

Zülflərini çin-içn qoyub üzə sən,
Sallan sərxoş, seyrana çıx düzə sən!
Sən gərəkdir Vaqif ilən gəzəsən,
Görünməyə hərgiz əğyara tellər.

* * *

Mən sənə olmuşam didar aşiqi,
Sən üzünü bürüməyin nədəndir?
Şirin sözlərinin çox müştaqiyəm,
Danışmayıb kiriməyin nədəndir?

Əlin dalda tutub, başın yanında,
Hərgiz tel görünməz qaşın yanında,
Mənim kimi bir sirdaşın yanında
Qayım-qayım sarınmağın nədəndir?

Eşqi gərək gözəl olan kimsənin,
Ta qılmıya tərkin nazü qəmzənin,
Yarlıqda ki, yoxdur xəyalın sənin,
Bəs dünyada yarınmağın nədəndir?

Ənbər zülfün belə tökdünmü yana,
Bir bəri bax – sənə canın qıyana,
Oturub-oturub yönü o yana,
Durub-durub yeriməyin nədəndir?

Vaqifəm, çox əla bir gövhər idim,
Saflıqda polada bərabər idim.
Ta ki, səni gördüm, mum tək əridim,
Heç deməzsən əriməyin nədəndir?

* * *

Ey Kəbəm, Kərbəlam, Məkkəm, Mədinəm,
Bir zaman kuyində ziyarətimdir.
Qiblə deyib, qaşlarına baş əymək –
Gecə-gündüz mənim ibadətimdir.

Hər nə desəm, sən incimə sözümdən,
Sərxoşunam, yox xəbərim özümdən,
Şol qamətin yayınanda gözümdən,
Sanasan ki, həşrü qiyamətimdir.

Bağlamışam din-imanı zülfünə,
Mənim kimi heyran hanı zülfünə,
Tapşırıb gedirəm canı zülfünə,
Yaxşı saxla, səndə əmanətimdir.

Sənsən mənim ayım, günüm, hilalım,
Dövlətim, iqbalım, cahım, cəlalım,
Gözəl üzün daim fikrü xəyalım,
Sözün dildə şirin hekayətimdir.

Sonalar xəcildir siyah telindən,
Tutilər lal olur şirin dilindən,
Şikəstə Vaqifəm, sənin əlindən
Hər kimə ki, yetsəm, şikayətimdir.

* * *

Xublarda ki, zövqü səfa deyirlər,
Fərbeh gül əndamda, ağ bədəndədir.
Könül asayişi, canın rahəti
Gülgün zənəxdanda, tər zəqəndədir.

Bir yoğun baldırlı, yumşaq dizli,
Bir sərxoş yerişli, məstanə gözlü,
Bir ayna qabaqlı, bir günəş üzlü
Gözəlin həsrəti, dərdi məndədir.

Əvvəl gözəllərdə gərəkdir çağlıq,
Ondan sonra ola sadəlik, ağlıq,
Nə ağzında yaşmaq, nə üzdə yaylıq,
Çirkinlik üzünü bürüyəndədir.

Qaşilən, gözilən cigər qan olur,
Zülf sevəndə nə din, nə iman olur.
Can quşu xallarda bəndivan olur,
Dirlik zövqi-ləbdə, həm dəhəndədir.

Eybsiz gözəlin xoş olur xoyu,
Gizləməz cəmalı, qaməti, boyu.
Görəndə Vaqif tək xoş göftguyu,
Məhəbbət eylər ki, bu guyəndədir.

* * *

Sevdiyim, ləblərin yaquta bənzər,
Sərasər dişlərin dürdanədəndir.
Sədəf dəhanından çıxan sözlərin
Hər biri bir qeyri-xəzanədəndir.

Nədəndir sözümə cavab verməmək,
Həm cəmal gizləyib, üz göstərməmək.
Gecələr gözlərim xabı görməmək,
Ol siyah nərgisi-məstanədəndir.

Mən ha səni nuri-ilahi sannam,
Camalının şöləsinə dolannam,
Atəşinə mərdü mərdanə yannam,
Bu xasiyyət mənə pərvanədəndir.

Bir namə yazmışam can üzə-üzə,
Badi-səba, apar sən o gül üzə,
Soruşsa yar ki, bu kimdəndir bizə?
Söyləgilən: – Sizin divanədəndir.

Xumar-xumar baxmaq göz qaydasıdır,
Lalə tək qızarmaq üz qaydasıdır,
Pərişanlıq zülfün öz qaydasıdır,
Nə badi-səbadən, nə şanədəndir.

Müştaqdır üzünə gözü Vaqifin,
Yolunda payəndaz üzü Vaqifin,
Sənsən fikri, zikri, sözü Vaqifin,
Qeyri söz yanında əfsanədəndir.

* * *

Yasəmən tellərin, nərgis gözlərin,
Mənimlə, gözəlim, çoxdan yağıdır.
İnsaf et, öldürmə günahsız qulu,
Əl-əldən üzülür, yaman çağıdır.

Kamallı gözəldə xəta kəm gərək,
Sevgi gərək, söhbət gərək, dəm gərək,
Aşiqə vəfalı bir həmdəm gərək,
Həmdəmsiz bal yesə, ona ağıdır.

Bahari-ömrünü versə də başa,
Aşiq məşuqədən usanmaz, haşa!
Fərhad Şirin üçün sığındı daşa,
Məcnunun ovlağı Leyli dağıdır.

Aşnasından üz çevirsə bir qafil,
Onda vəfa olmaz, onu yəqin bil.
Sona kəklik sara uysa neçə il,
Laçın qalxar yuvasını dağıdır.

Qışın şiddətindən çəkinmərsə yaz,
Çalxanmaz göllərdə nə ördək, nə qaz,
Vaqifin köksünə başdan çar-çarpaz
Çəkilib haçandan – canan dağıdır.

* * *

Bayram oldu, heç bilmirəm neyləyim,
Bizim evdə dolu çuval da yoxdur.
Dügiylə yağ hamı çoxdan tükənmiş,
Ət heç ələ düşməz, motal da yoxdur.

Allaha bizmişik naşükür bəndə,
Bir söz desəm dəxi qoymazlar kəndə.
Xalq batıbdır noğla, şəkərə, qəndə,
Bizim evdə axta zoğal da yoxdur.

Bizim bu dünyada nə malımız var,
Nə evdə sahibcamalımız var.
Vaqif, öyünmə ki, kamalımız var.
Allaha şükür ki, kamal da yoxdur.

* * *

Kür qırağının əcəb seyrangahı var,
Yaşılbaş sonası, hayıf ki, yoxdur.
Ucu tər cığalı siyah tellərin
Hərdən tamaşası, hayıf ki, yoxdur!

Qış günü qışlağı Qıraqbasanın,
Gözüdür Aranın, cümlə-cahanın,
Belə gözəl yerin, gözəl məkanın
Bir gözəl obası, hayıf ki, yoxdur!

Çoxdur ağ bədənli, büllur buxaqlı,
Lalə zənəxdanlı, qönçə dodaqlı,
Amma şirin dilli, açıq qabaqlı,
Könül aşinası, hayıf ki, yoxdur!

Havasından torpağının, yerinin,
Dadırmaz dəhanın, ləbi-şirinin,
Pəri çoxdur, nə fayda heç birinin
Adamlıq ədası, hayıf ki, yoxdur!

Ucu əşrəfili, bulud kimi saç,
Dal gərdəndə hər hörüyü bir qulac,
Kəlağayı əlvan, qəsabə qıyğac,
Altından cunası, hayıf ki, yoxdur!

Zər Haşiyə al nimtənə üstündə,
Xallar üz yanında, çənə üstündə,
Buxağın altında, sinə üstündə,
Zülfün burulması, hayıf ki, yoxdur!

Laçın təki başda ala tomağa,
Yaşmağı tutmaya dişə, dodağa,
Cəllad kimi durub qabaq-qabağa
Baxıb can almağı, hayıf ki, yoxdur!

Çünki yorğunuyam mən bu yolların,
Qaydasını billəm hər üsulların,
Gümüş biləklərin, bəyaz qolların,
Sarı kəhrəbası, hayıf ki, yoxdur!

Ayna tutub hərdəm camal görməsi,
Zülfə, zənəxdana sığal verməsi,
Səhər ala gözün siyah sürməsi,
Əlinin hənası, hayıf ki, yoxdur!

Vaqif həqdən dilər lütfü kərəmlər
Belə yerdə qalan, vallah, vərəmlər.
Yenə yada düşdü bizim sənəmlər.
Getməyin binası, hayıf ki, yoxdur!

* * *

Səhər-səhər həsrət ilən gəzirdim,
Cüt qoşa nar gördüm iki sinədə.
Birisi qız idi, birisi gəlin,
Can qurban eylərəm ikisinə də.

Gəlin bulaqda əl, üzünü yuyur,
Qız deyir: gəl gedək, həriflər duyur,
Belə gözəl sevən əldənmi qoyur,
Can qurban eylərəm ikisinə də.

Gəlinin dodağıdır Təbrizin məti,
Əlli-altmış tümən qızın qiyməti,
Belə gözəl sevən neylər cənnəti,
Can qurban eylərəm ikisinə də.

Gəlinin yaxası polad iynəli,
Qızın yaxasıdır çarpaz düyməli.
İkisin də gərək gözəl öyməli,
Can qurban eylərəm ikisinə də.

Kababım olaydı, gözüm olaydı,
Yar yanında ötkəm sözüm olaydı,
Vaqif deyir: iki gözüm olaydı,
Baxaydım bunların ikisinə də.

* * *

Hər yetən gözələ gözəl demənəm,
Gözəldə bir qeyri əlamət olur:
Zülf bir yana düşər, gərdən bir yana
Özün bilməz, bir özgə babət olur.

Oynayanda pərvaz edər nimtənə,
Zülf dağılar, üzdə dönər xərmənə,
Sərəndazın ucu düşər gərdənə,
Açılsa bel-buxun, qiyamət olur.

Müjgan oxun atar, yay qaşın çəkər,
Dələr bağrım başın, ürəyim sökər,
Sözü duzlu olur, dodağı şəkər,
Hekayəti şirin hekayət olur.

Gərdəninə müşkin tellər düzülür,
Hər qıya baxanda canlar üzülür,
Sürmələnmiş siyah gözlər süzülür,
Oturub durmağı qiyamət olur.

Gözəl olan belə alişan gəzər
Niqab çəkər, zülfü pərişan gəzər,
Səhər seyrə çıxar, gülüşan gəzər,
Sevməyində tamam hərarət olur.

Vaqif qurban olsun qoşa tağına,
Zülfü üz yanında, üzü ağına,
Belə gözəl düşə ay qabağına,
Tamaşa eyləyən bitaqət olur.

* * *

Bənəfşə qoxulu yardan ayrılan,
Gündə yasa batar, günü zar olur,
Canında ixtiyar qalmaz zərrəcə,
Gecə bidar, gündüz biqərar olur.

Ayrılıq bir yanar oddur, qazılar,
Yazılmasın hərgiz belə yazılar,
Ol gümüş biləklər, şümşad bazular
Yada düşər, işim ahü zar olur.

Bahadur deməzlər hərgiz sayana,
Görüm, lənət olsun yardan doyana,
Gözəl sevən kimsə gərək dayana,
Dost yolunda çovğun olur, qar olur.

Baxışı məst olur çeşmi-xumarın,
Cənnətdən artıqdır zövqü didarın,
Ağ sinəli, şəkər məməli yarın,
Cəfasını çəkmək şirin kar olur.

Vaqif, yar yanığı yaman afətdir,
Ayrılıq zülümdür, bir qiyamətdir,
Gözəllərdə belə babət babətdir,
Kimi doğru, kimi biiqrar olur.

Qaynar gözlərindən, şux baxışından
Əcaib fitnələr, fellər görünür.
Səf-səf duran siyah kirpiklərindir,
Yoxsa ki, gözümə millər görünür?

Ağzı piyaləsən, qəddi minasən,
Neçin oturursan məndən yana sən?
Sən məgər ki, yaşıl başlı sonasən,
Səndə tər cığalı tellər görünür?

Gedən, getmə, bir bəri bax, ay gedən,
Gözüm doymaz sən tək gözəl kimsədən,
Gah yaxadan şölə verir ağ bədən,
Gah olur ki, nazik əllər görünür.

Qəddin tənə vurar o sərvi-naza,
Can qurban eylərəm sən tək şahbaza,
Üzün kimi, zülfün kimi tər-taza
Nə lalələr, nə sünbüllər görünür.

Vaqif, yad et səni yad eyləyəni,
Mən sevirəm mənə yarım deyəni.
Qoymaz göz önündən sevən sevəni.
Könüldən könülə yollar görünür.

* * *

Həqdir, gözəl çoxdur cahan içində,
Gözəldə bir nazü qəmzə gərəkdir.
Didarını görmək iman tazələr,
Qaşı qiblə, üzü Kəbə gərəkdir.

Boyu mina gərək, sinəsi mərmər,
Bəyaz ola gül əndamı sərasər,
Əlində al həna, zülfündə ənbər,
Qaşında, güzündə sürmə gərəkdir.

Sallana sultani-dibapuş kimi,
Üzünü döndərə bir sərxoş kimi,
Sığallana hərdəm tərlan quş kimi,
Tamam sümüyündə cilvə gərəkdir.

Barmağında xatəm, guşində tənə,
Kireh-kireh zülfün tökə gərdənə,
Gülabətin köynək, abı nimtənə,
Yaxasında qızıl düymə gərəkdir.

Pərvanə tək özün oda salmağa,
Yaslanıban eşiyində qalmağa,
Bir belə gözələ qurban olmağa,
Vaqif kimi qəllaş kimsə gərəkdir.

* * *

Bir belə cavanın əqli kəm olsa,
Baxırsan ki, sevgisinə naz eylər,
Can qurban edəni qoyar burada,
Gedər özgələri sərəfraz eylər.

Əzəl özü deyər: di dur gəl bəri,
Sən durarsan, ayaq qoyar o geri,
Nə özün yarıdır, nə sevənləri,
Bir para adamı kərkəvaz eylər.

Durğuzarsan, üzün divara tutar,
Fikr edib, fikr edib mürgülər yatar,
Dindirərsən, dinməz, ağırlıq satar,
Sinəsində şıq-şıq pul avaz eylər.

Özünün ha bağrı olanda kabab,
Gecə eylər adam görəndə hicab,
Naqis-naqis çəkər üzünə niqab,
Yüngül-yüngül qaçar, etiraz eylər.

Sevənim sevirəm canü başınan,
Gözüm düşmənidir qaçıb yaşınan,
Bir yar ki, danışa gözü qaşınan,
Vaqif ona canın payəndaz eylər.

* * *

Bir ala gözlünün, sərvi-rəvanın,
Gərək qulluğunda durasan dürüst.
Hənalı əllərin, nazik barmağın
Yetirib dəstindən tutasan dürüst.

Qoymayasan çıxa yarın səsini,
Əynindən soyasan toy libasını,
Öpəsən, qucasan ağ sinəsini,
Müşk-ənbər iyinə batasan dürüst.

Yaxasının bağü bəndin üzəsən,
Çəngələyib ağ məməsin əzəsən,
Əl uzadıb baş bəzəyin pozasan,
Hər birin bir yana atasan dürüst.

Vaqif deyər, gözəl sevmək arəstə,
Öpəsən, qucasan, düşəsən xəstə,
Üzünü qoyasan üzünün üstə,
Məst olub yanında yatasan dürüst.

* * *

Bir ayna qabaqlı, tər sinəli yar,
Çox müştaqdır sizin cəmala Vaqif,
Həsrətin çəkməkdən yanıb odlara,
Görgünən, düşübdür nə hala Vaqif.

Həsrətindən əlif qəddi dal olub,
Mat qalıbdır, şirin dili lal olub,
Bir dərdə düşübdür xəstəhal olub,
Çox bəlayə olur həvalə Vaqif.

Cəmalın müştaqi ahü zar çəkər,
Dərdini bir çəkməz, səd həzar çəkər,
Üzünü görməyə intizar çəkər,
Nə gül dərmək istər, nə lala Vaqif.

Olsa yüz min tuba boylu gül bədən,
Həzz eyləməz səndən qeyri kimsədən,
Sənin canın üçün, ölən günəcən
Hərgiz düşməz özgə xəyala Vaqif.

Hər kəsin yox isə ağlı, kamalı,
Dünyada alıbdır sahib camalı,
Çünki belə imiş dünyanın halı,
Əbəs ki, yetişdi kəmala, Vaqif.

* * *

Ala gözlü, sərv boylu dilbərim,
Həsrətin çəkdiyim canan, bəri bax!
Gecə-gündüz fikrim-zikrim, əzbərim,
Üzüldü taqətim, aman, bəri bax!

Kim dözər mənim tək belə firqətə,
Rəncü məşəqqətə, bari-möhnətə,
Haçandır düşmüşəm tari-zülmətə,
Çəkilsin üstümdən duman, bəri bax!

Payibəndəm, qəmi-eşqə giriftar,
Hicran atəşindən can oldu bimar,
Razi-dilim edə bilməm aşikar,
Çəkərəm dərdini pünhan, bəri bax!

Günbəgün könlümün artır qubarı,
Pərişandır, tapmaz o qəmküsarı.
Ölsün, itkin olsun belə əğyarı,
Gəzməsin arada yaman, bəri bax!

Çox çəkir hicrini Vaqifi-xəstə,
Leylü nahar, şamü səhər peyvəstə,
Ey yanağı lalə, ləbləri püstə,
Ağzı nabat, şəkkər zəban, bəri bax!

* * *

Nə gözəldir bu cavanın camalı,
Qaşı, gözü qabağına yaraşmış.
Siyah kirpiyində cavahir sürmə
Ala gözün qırağına yaraşmış.

Mən aşiq olmuşam o xoş süfata,
Gərəkdir bizimlə ixtilat qata,
Danışanda ağzı dönə nabata,
Dili, dişi dodağına yaraşmış.

Saçın cığaları nimtənəsində,
Mərmər məmələri tər sinəsində,
Həlqə-həlqə birçək ağ sinəsində
Çin-çin olmuş buxağına yaraşmış.

Sərpasər batıbdır müşkü gülaba,
Həsrətindən bağrım döndü kababa,
Ağ üz çöhrəsində qızıl qullaba
Al çarqatın qırağına yaraşmış.

Vaqif ta ki, dura tamaşasına,
Bilməz baxa bəzəyinin hansına.
Büllur bilәkləri kəhrəbasına,
Gül əlində qolbağına yaraşmış.

* * *

Ey yanağı lalə kimi ol gözəl,
Siyah zülfün zənəxdanə yaraşmış.
Gül bədənin, gümüş cəmalın sənin,
Bəyaz məmən giribanə yaraşmış.

Söz yox danışanda şirin sözünə,
Nərgis qurban olsun xumar gözünə,
Buxağına, gərdəninə, üzünə –
Xırda xallar danə-danə yaraşmış.

Görməmişəm sən tək gözəl kimsənə,
Ta ki, gördüm heyran oldum mən sənə,
Saçı qucaq ilə düşüb gərdənə,
Ucu nə xoş ol miyanə yaraşmış.

Ağ sinəndir təxti-Süleyman kimi,
Sallanırsan sultan kimi, xan kimi,
Pərişan zülf sənə yaraşan kimi,
Nə mələyə, nə insanə yaraşmış.

Belə getməz, dövran axır-əzəldir,
Bizim ilən aralığı düzəldir.
Vaqif, bunun özü çünki gözəldir,
Hər nə geymiş novcəvanə yaraşmış.

* * *

Yenə səni gördüm, bağrım oxlandı,
Ey əfi baxışlı, havalı sərxoş!
Üzün göyçək, qaşın cəllad, gözün şux,
Görmədim sənin tək maralı sərxoş!

Didarına müştaq olub qalmalı,
Başına dönməli, dərdin almalı,
Bir ayna qabaqlı, əyri çalmalı,
Əlvan kəlağaylı, səfalı sərxoş!

Gözləri sürməli, yanağı xallı,
Bir laçın sövdalı, tərlan xəyallı,
Qolları bazbəndli, boynu heykəlli,
Ağ əlləri əlvan hənalı sərxoş!

Oturuşu Şirin, duruşu Leyli,
Qəmzəsi sitəmli, yarı gileyli,
Gecə-gündüz zövqü səfadə meyli,
Həm özü, həm fikrü xəyalı sərxoş!

Əqlin aldın, yaram, – deyin Vaqifin,
Yanıltdın əlifin, beyin Vaqifin,
Üz göstərdin, yıxdın evin Vaqifin
Ola bilməz sən tək bəlalı sərxoş!

* * *

Xubların yasəmən qoxulu zülfü
Dəxi məndə dinü iman qoymadı.
Məstanə gözləri, xumar baxışı
Apardı əqlimi, aman... qoymadı.

Valeh olmasaydı yanağa, xala,
Əlbəttə yetərdim əqlü-kamala,
Mən ha döndərmədim qəddimi dala,
Neyləyim, bir qaşı kaman qoymadı.

İxtilatım düşdü bir əğyar ilən,
Gecə-gündüz yandım ahü-zar ilən.
Yaxşı bir olmuşdu könül yar ilən,
Düşdü aralığa yaman qoymadı.

Duydular bağrımın şan olduğunu,
Yanar od içində can olduğunu,
Kim bilərdi ciyər qan olduğunu,
Belə gözlərimdən daman qoymadı.

Vaqifəm məgər başdan kəmürək idi,
Belə ha deyildi, o, bir bək idi,
Bu gün canan bizə gələcək idi,
Onu yenə rəqib, güman, qoymadı.

* * *

Ay ağalar, sizə bir ərz eyləyim:
Bu gün qar yağıbdır, dizə çıxıbdır.
Bir gözəlin həsrətini çəkərdim,
Təzə-təzə gəlib bizə çıxıbdır.

Baxdım ətvarinə – bir tülək tərlan,
Baxışın görəndə mən oldum heyran,
Duruşu maraldı, yerişi ceyran,
Ya bir məst ahudur, düzə çıxıbdır.

Bir məlahət kanı, Yusifi-sani,
Görməmişdi gözüm belə insani,
Şükr təqdirinə kərəmin kani,
Sanasan bir aydı, təzə çıxıbdır.

Qıya baxdı mənə, qərq oldum qəmə,
Gəlmədi kəməndə, söhbətə, dəmə,
Əl atdım gərdənə, açıldı məmə
Soruşdu Vaqifdən: məzə çıxıbdır?

* * *

Tamam gözəllərdən səni baş bildim,
Onun üçün könlüm sənə bağlandı.
Xəyalından üzmək olmaz xəyalı,
Neçə yollar dönə-dönə bağlandı.

Bizə meylin əzəlki tək nədən yox,
Səni ha sonradan bir öyrədən yox,
Xeyli vaxtdır sizdən gəlib-gedən yox;
Aralıq nə yaman yenə bağlandı?!

Əvvəl siğal verdin siyah telə sən,
Ağ üzündən ta qoyasan belə sən,
Bir əcaib görünür ki, elə sən,
Gül dəstəsi yasəmənə bağlandı.

Sən ha mənim öldüyümü eşitdin,
Gəlmədin üstümə, nə yana getdin?
Səbəb noldu, birdən məni tərk etdin;
Məgər meylin özgəsinə bağlandı?

Vaqifəm, mən ruxsarını görmənəm,
Bu yana bir güzarını görmənəm,
Neçə gündür didarını görmənəm,
Ruzigarım qara günə bağlandı.

* * *

Bir-birinə həmdəm iki novcavan,
Biri – güldür, biri gülgəz yanaqlı,
Biri tər sinəli, ayna əndamlı,
Biri nar məməli, nəsrin buxaqlı.

Biri laçın gözlü, tərlan qəmzəli,
Biri qırğı başlı, sona cilvəli,
Biri şəkkər sözlü, şirin kəlməli,
Biri qənd ağızlı, qaymaq dodaqlı.

Biri sərtasər ağ, həm siyah telli,
Biri buğdayıdır, amma şəkilli;
Biri xoş qılıqlı, mələk misilli,
Biri sərv boylu, şümşad budaqlı.

Biri bəstə boylu, narınc örtükli,
Biri şux baxışlı, xəncər kirpikli.
Biri dal gərdənli, süzgün sümükli,
Biri uzun qaşlı, həm gen qabaqlı.

Axır cana yetirərsiz Vaqifi,
Ağlayıban götürərsiz Vaqifi,
Bir gün olur, itirərsiz Vaqifi,
O qədər gəzərsiz əli çıraqlı.

* * *

Əyibdir qəddimi, dəlib bağrımı
Bir kirpiyi oxlu, qaşı kamanlı,
Gözləri can alan cəlladi-sərməst,
Baxışı hərami, qəmzəsi qanlı.

Bir nazik kamallı, bir nazik işli,
Şirin gələcəkli, şəkər gülüşli,
Bir mərcan baxışlı, dürdanə dişli,
Bir cəvahir sözlü, sədəf dəhanlı.

Bir sərxoş gəzişli, gizli imalı,
Bir Kəbə ziyarət, qiblə nümalı,
Bir mələk şəkilli, huri simalı,

Bir durna avazlı, bülbül nəvalı,
Bir İsa nəfəsli, Loğman dəvalı,
Bir bənəfşə iyli, əmbər həvalı,
Bir tazə çəmənli, tər gülüstanlı.

Vaqifəm, sevmişəm bir şux dilbəri,
Gözəllər, sərdarı, xublar sərvəri,
Ağızlar sərdarı, dillər əzbəri,
Vilayət içində həm adlı-sanlı.

* * *

Yenə qəhri keçib xublar şahının,
Bizdən lütfi şəfqətini kəsibdir.
Əvvəlki tək dəxi baxmaz yüzümə,
Yüz döndərib iltifatı kəsibdir.

Məndən küsüb, yalvarıram barışmaz,
Sinə açıb, qucaqlaşıb sarışmaz,
Gündəki tək gülməz, deyib danışmaz,
Şirin-şirin hekayəti kəsibdir.

Mənə ümid verib, çəkmə qəm deməz,
Dərdinə dərmanı edərəm deməz,
Təklif edib bir ləbimdən əm – deməz,
Həm şəkkəri, həm nabatı kəsibdir.

Əyibdir qəddimi yay-qaş qabaqda,
Gözüm qalıb zənəxdanda, buxaqda.
Səbr-qərarımı gülzar yanaqda,
Siyah zülfün o zülmatı kəsibdir.

Vaqifəm, çox müştaqəm bir nigarə,
Nə qılm, eyləməz dərdimə çarə,
Heç bilmənəm nə olubdur bu yarə,
Gülər yüzlü, xoş sifatı kəsibdir.

## TƏCNİSLƏR

Gözlərin cəlladdır, baxışın yağı,
Qanlı qəmzən kimi olmaz bəla, qız,
Nazlı-nazlı danışıban güləndə,
Dönürsən şəkərə, qəndə, bala, qız.

Ləblərin süsəndi, güldən əladır,
Seyr ilə gülşəndən, güldən əladır,
Tamam ağ bədənin güldən əladır,
Qamətindir sənubərdən bala, qız.

Ömrünə çox dua-səna demişəm.
Suçumu, dərdimi sana demişəm.
Mən canımı qurban sana demişəm,
Ol zaman ki, oldu qalü bəla, qız.

Qamətin, gərdənin, boyun gözəldir,
Müşkin, ireyhanın, buyun gözəldir,
Səni sevən deyir bu ən gözəldir,
Hərgiz olmaz bu dünyada belə qız.

Vaqifəm, düz danış, əyilmə məndən,
Aparma əqlimi, əkilmə məndən,
Ağlaram ki, əmim, əyil məməndən,
Məni sinən beşiyində bələ, qız.

* * *

Gözəl boylu, gözəl xoylu, gözəl yar,
Nə gözəlsən, geyinibsən alı sən,
Gözəl gözün hər bir qıya baxanda,
Gözəl canı gözəl təndən alısən.

Gözəl qamət, gözəl gərdən, gözəl üz,
Gözəl olmaz sən tək, olsa gözəl yüz,
Gözəl canı munca yetər, gözəl üz,
Gözəl deyil, etmə gözəl, alı sən.

Gözəl durub, gözəl geyib, gözəl bax,
Gözəl kəlbəm, sal boynuma gözəl bağ
Gözəl seyrü kəşt eyləyib gözəl bağ,
Gözəl, dər budaqdan gözəl alı sən.

Gözəl saqi, gözəl tutub, gözəl kəs,
Gözəl doğra kəbab bağrım, gözəl kəs,
Gözəl canan, gözəl adam, gözəl kəs,
Bir gözəl kimsənin gözəl alısən.

Gözəl qapındadır, gözəl hey dərin,
Gözəl sev demişəm gözəl hey dərin,
Gözəl, Vaqif qulun, gözəl Heydərin,
Gözəl, yetiş dadə, gözəl Alı sən.

* * *

Ey günəş cəmallım, sən nə gözəlsən,
İstərsən ki, tənə aya qılasan,
Ahu gözlüm, hər bir qiya baxanda,
Bir örkü salırsan, ay aqiləsən.

Şanə salır hərdən zülf əra zini,
Demək istər məgər zülfə razini,
Çəkdirə-çəkdirə zülf ərazini,
Döndəribsən məni aya qila sən.

Çəkilir sürmələr, qaralı gözlər,
Alır məndən səbri qaralı gözlər,
Yoluna baxmaqdan qaralı gözlər,
Gəl indi bir quru ayaqilə sən.

Qəmzən qılınc çəkib budar da məni
Başın üçün, qoyma bu darda məni,
Yetir mətlubuma bu dərdə məni,
Bir busə ləbindən aya qılasən.

Xoş keçir bizimlə sən həm dəmisən,
Eylə bu dərdimə sən həmdəmi sən,
Şikəstə Vaqifin sən həmdəmisən,
Danışma, sevdiyim, a yağilə sən.

## QƏZƏLLƏR

Hər kimin cananı kim, bir əhli-ürfan olmaya,
Şahi-aləm olsa, onda rahəti-can olmaya.

Rəsmi-ülfət bilməyən büt, aşiqin kafər edər,
Ey müsəlmanlar, xoş ola kim, yarı nadan olmaya.

Bir ləbi lələ lətif, əndamü gül-rüxsar üçün,
Qətreyi-əşkin nə lütfü var əgər qan olmaya.

Afəti-badi-fənadən dağla, bərbad ola,
Ol ibna ki, onda bir zülfi-pərişan olmaya.

Nə səfa ol gül yanaqdan kim, gözə görünməyə,
Nə ləzzət ol qönçə ləbdən kim ki, xəndan olmaya?

Vaqifa, bir məhliqayi-mehribanə meyl qıl
Ta kəmali-eşqə ondan zərrə nöqsan olmaya.

* * *

Vidadidən gələn kağız məni fərxəndəhal etdi,
Bu halı gördü qəm filhal məndən intiqal etdi.

Uçub könlüm quşu pərvaz qılsa evci-əlayə,
Əcəb yox kim, bu məktubu özünə pərrü bal etdi.

Ziyayi-şəms tək etdi, məni bədr eylədi, hala
Əgərçi qəddimi dövranı-filmazi hilal etdi.

Səvadi namənin, ey dil, məgər zülmati-heyvandır –
Ki, ruhum Xızr tək əndan bəsa kəsbi-kamal etdi.

Xəyal etmişdi Vaqif kim, rəvan bir xoş qəzəl yazsın,
Rəvan olmuşdu qasid kim, bunu ancaq xəyal etdi.

* * *

Salmaq nəzərindən məni cananə düşərmi?
Tərk eyləmək öz qulunu sultanə düşərmi?

Kakil nə rəvadır ki, könüldən edə qeybət,
Şanə gileyi-zülfi-pərişanə düşərmi?

Qəmzən ləbini dişləməmiş, qanımı tökdü,
Qan eyləməyən kimsənə heç qanə düşərmi?

Dil çahi-zənəxdanə düşüb zülfün ucundan,
Əlbəttə, xətasız kişi zindanə düşərmi?

Derlər ki, dəhanınla edir bəhsi-nəzakət,
Görün, bu söz ol qönçeyi-xəndanə düşərmi?

Ol sərvi-xuramanə ki, gəzmək olub adət,
Bir yol yolu, gör kim, bizim eyvanə düşərmi?

Olmazsa əgər Vaqifə bir sədri səmən yar,
Top eyləyibən başını meydanə düşərmi?

* * *

Kim ki, sevdayi-səri-zülfi-pərişanə düşər,
Gah zindanə, gahi çahi-zənəxdanə düşər.

Afəti-dəhr dəyər ol kəsə kim, kamildir,
Mah hər gün ki, kəmalə yetə, nöqsanə düşər.

Mərd igitlər özünə məhbəsi meydan bilir,
Sanma ki, nakəsü namərd bu meydanə düşər.

Eybdən saf çıxar, pakü mübərra görünür,
Hər tila kim, küreyi-atəşi-suzanə düşər.

Piçü tabə düşənin işi, bəli, üzdə olur,
Zülf bu vəchlə rüxsareyi-tabanə düşər.

Hər yaman yer ki, olur – yaxşıların mənzilidir,
Ləl daş içrə, xəzinə dəxi viranə düşər.

Şami-qəm şadlıq əyyamına xoş ziyvərdir,
Necə kim, xali-siyəh arizi-cananə düşər.

Ey Vidadi, qəmi-hicranə giriftar olmaq,
Bir sənə, bir mənə, bir Yusifi-Kənanə düşər.

Eşqə düşmək sənə düşməz, qocalıbsan belə dur,
Belə işlər yenə Vaqif kimi oğlanə düşər.

* * *

Ey güli-xəndan, fəraqından sənin qan ağlaram,
Eylərəm şamü səhər çaki-giriban ağlaram.

Gedəli zülfün əlimdən, piçü tabə düşmüşəm,
Dönmüşəm bir muyə, çox halı pərişan ağlaram.

Gəl kim, ey lalə zənəxdanın, kəbab etdi məni,
Od düşübdür cismimə, hərdəm yanar can, ağlaram.

Yadıma hər bir düşəndə ol siyah kirpiklərin,
Sanasan ki, sancılar bağrıma peykan, ağlaram.

Yaxşı həmdəm olmasa şad olmaq olmaz, Vaqifa,
Ağlaram ta ömrüm olduqca firavan, ağlaram.

* * *

Mehribanlıq görməyib bir məhliqadən küsmüşəm,
Gündə yüz al eyləyən qəlbi qəradən küsmüşəm.

Şəninə dedim şirin söz, bir şey ondan dadmadım,
Bu səbəbdən ağzı şəkkər dilrübadən küsmüşəm.

Bir qədəh mey istədim, sındırdı könlüm şişəsin,
Daş bağırlı saqiyi-sahib-cəfadən küsmüşəm.

Çün "uman yerdən küsərlər" bir məsəldir xalq ara,
Küsdüyüm bica deyildir, aşinadan küsmüşəm.

Gördüm əvvəl ki, binasın yarlıq etmək deyil,
Vaqifa! Əsli budur, mən bu binadan küsmüşəm.

* * *

Ey Vidadi, gərdişi-devrani-kəcrəftarə bax!
Ruzigarə qıl tamaşa, karə bax, kirdarə bax!

Əhli-zülmü necə bərbad eylədi bir ləhzədə,
Hökmü adil padşahi-qadirü qəhharə bax!

Sübh söndü şəb ki, xəlqə qiblə idi bir çırağ,
Gecəki iqbalı gör, gündüzdəki idbarə bax!

Taci-zərdən ta ki, ayrıldı dimaği-pürqürur,
Payimal oldu təpiklərdə səri-sərdarə bax!

Mən fəqirə əmr qılmışdı siyasət etməyə,
Saxlayan məzlumu zalimdən o dəm qəffarə bax!

Qurtaran əndişədən ahəngəri-biçarəni,
Şah üçün ol midbəri təbdil olan mismarə bax!

İbrət et ağa Məhəmməd xandan, ey kəmtər gəda,
Ta həyatın var ikən nə şahə, nə xunxarə bax!

Baş götür bu əhli-dünyadan ayaq tutduqca qaç,
Nə qıza, nə oğula, nə dusta, nə yarə bax!

Vaqifa göz yum, cahanın baxma xubü ziştinə,
Üz çevir ali-əbayə, Əhmədi-Muxtarə bax!

* * *

Hər gedən gəlmiş, mənim ol qəmküsarım gəlməmiş,
Ey gözüm, qan ağla kim, çeşmi-xumarım gəlməmiş.

Getmiş idi ixtiyarım biləsincə yaramın,
Çünki yarım gəlməmiş, həm ixtiyarım gəlməmiş.

Mən bu dərd ilə əgər ölsəm, məzarə qoymayın,
Üstümə ol tuti dilli şux nigarım gəlməmiş.

Həsrətindən zəfəranə dönsə ruyim, yox əcəb,
Qoymuş hicranda məni, bir gülüzarım gəlməmiş.

Deməsin, Vaqif, əcəl kim, gəlsə məndən can alır,
Kimdir ona can verən, fərmani-yarım gəlməmiş?

* * *

Aydın olsun gözlərim kim, gəldi yarın kağızı,
Könlümü şad eylədi gözəl nigarın kağızı.

Oxudum, öpdüm, gözə sürtdüm, dedim: səd mərhəba!
Gözüm üstə var yerin, ey gülüzarın kağızı!

Səndən ayrı ol qədər qan ağladım kim, dəmbədəm
Yaşə batıb, islanıb səbrü qərarın kağızı.

Çox çəkirdim intizarın, gözlərim yolda idi,
Şükr-lillah gəldi ol çeşmi-xumarın kağızı.

Qeyri yarı, ey gözəl, qılma bədəl sən Vaqifə,
Yadigar saxla, bu olsun etibarın kağızı.

* * *

Yazıb bir namə göz yaşilə ol dildarə göndərdim,
Səriri-hüsnə, yəni şah olan sərdarə göndərdim.

Könül tiflinə dərs verdim kitabi-hüsnünü, billah,
Səri-kuyində xəlvət etməyə təkrarə göndərdim.

Nə hacət halimi yazmaq ki, ğayət də pərişandır,
Onu şərh etməyə yarə dili-sədparə göndərdim.

Sirişgi-laləgunun danəsin damanimə yığdım,
Bunu bir töhfə bildim, gözləri xumarə göndərdim.

Behəmdülla ki, Vaqif həsrətindən öldü qurtuldu,
Uçurdum can quşun, ey gül, sizin gülzarə göndərdim.

* * *

Çıxıb başmaq seyrinə, edib seyri-çəmən gəldim,
Ayaq üstdən Qazağa bir gedib, gördüm vətən, gəldim.

Qızıl gül açılan günlərdə gülzari-Qarabağa,
Sənin olsun, əzizim, böylə məlumun ki, mən gəldim.

Mən idim abi-yari bu gülüstanın əzəl gündən,
Yetirdim tazəcə güllər gənə mən tazədən gəldim.

Xəyalın mühlik azari məni az qaldı öldürsün,
Qayıtdım rəhgüzari-qəbrdən, yırtdım kəfən, gəldim.

Ver ağca, al qarabaşı, gedəndə söylə, ey Vaqif,
Sənin üçün gətirdim bir büti-siminbədən, gəldim.

* * *

Əzəldən biz də bir şəkkər ləbi sevdik sevənlər tək,
Olub risva ağızdan-ağıza düşdük süxənlər tək.

Nolurdu kim, olaydım qasidin qoynundakı kağız –
Ki, mən də Qələyə bir yol gedəydim bu gedənlər tək.

Gül əndamlar səfayi-söhbətin yad eylərik hərdəm,
Batar əzamıza ta sübhədək tüklər tikənlər tək.

Kərəm qılmış, bizə ol lalərüx bir namə göndərmiş,
Açıb onu tamaşa eylərik bərgi-səmənlər tək.

Nə xoş nəqqaşımış bu naməni (yarəb), yazan katib,
Hünər izhar edib, surətdə möcüz göstərənlər tək.

Səfərdə yar yanından gələn kağızları bir-bir
Öpər Vaqif, basar bağrına hərdəm gülbədənlər tək.

## MÜXƏMMƏSLƏR

Nə xoşdur baş qoymaq bir güləndamın qucağında,
Tamaşa eyləmək ol həlqə zülfə ağ buxağında,
Durub ondan, tutub nazik əlin gəzmək otağında,
Qucub-qucub oturmaq gah solunda, gah sağında,
Sinəsində sinə, boynunda qol, dodaq dodağında.

Üzündən eyləyib küstahlıq, dəstari-zər açmaq,
Yenindən düymə, ondan sonra belindən kəmər açmaq,
Çəkib yaşmağın ağzından rəvan, ləlü gövhər açmaq,
Çıxarıb cümlə əsvabın, vücudun sərbəsər açmaq,
Həmin bir incisin qoymaq qara zülfün qırağında.

Uzun saçın qucaqlayıb, töküb qəddi-büləndindən,
Töküb misli-bənəfşə iyləmək hər bir kəməndindən
Yaxasın çak edib, köksün çıxarıb bağü bəndindən,
Əmib doyunca şirin ağ məmənin şəhdi-qəndindən,
Qoyub bir ləhzə baş, yatmaq giribanın bucağında.

Səmən cismə sarılmaq, eyləmək bir qədr rahətlər,
Aralıqda olub bir-birinə lütfü inayətlər,
Yuxudan tez durub sərf eyləyib dürlü zərafətlər,
Yuyub əl, oturuban dizbədiz etmək hekayətlər,
Demək bir-birinə başdan keçən halı fərağında.

Edib bir müxtəsər söhbət, xəbərdar olmamış əğyar,
Yenidən and içib, şərt eyləyib, əhdü, iman, iqrar,
Alıb bir bu üzündən, o üzündən buseyi-təkrar.
O zülfi-yasəməndən həsrətilə ayrılıb naçar,
Gənə Vaqif kimi bir dəxi olmaq iştiyaqında.

* * *

Bilmənəm məndən neçün ol sevgili canan küsüb,
Üzümə baxmaz dəxi, bir gözləri məstan küsüb,
Ağladır qanlar mənə, rüxsarəsi xəndan küsüb,
Qara günlərdə qoyub məni, mahi-taban küsüb,
Könlümün şəhrin sərasər eyləyib viran, küsüb.

Bağrımı vermiş kəsər kirpiklərin əlmasına,
Ağlamaqdan gözlərim dönmüş iki qan tasına,
Gecə-gündüz düşmüşəm dərdü ğəmin dəryasına,
Rəhm qılmaz, ah kim, öz aşiqi-şeydasına,
Dərdi öldürdü məni, bir eyləməz dərman, küsüb.

Eylə ki, görər məni, yaylıq çəkər rüxsarinə,
Bir zaman qoymaz tamaşa eyləyim didarinə,
Danışar qeyrilə, baxmaz mən qədimi yarinə,
Nə demiş məndən rəqib ol xubların sərdarinə?
Gəlmişəm ərzə, nəhayət, eyləməz divan, küsüb.

Bu qədər kim, söylərəm, tutmaz mənə qulağını,
Yoluna üz qoymuşam, basmaz gözəl ayağını,
Neylərəm canımın olmaq dəxi sağ qalmağını,
Döndərib üzün, yığıbdır qaşını, qabağını,
Ey könül, gəl olalım bu dilbərə qurban, küsüb.

Danışıb gülməz üzünə ol pərivəş Vaqifin,
Sındırıb könlün, yaxıb canın müşəvvəş Vaqifin,
Ol səbəbdən canına düşmüş bir atəş Vaqifin,
Cürmü təqsiri nədir, yarəb, bəlakəş Vaqifin,
Söylərəm munca, eşitməz dada, əl-aman küsüb.

* * *

Bərq vurub gün tək çıxar bir huripeykər hər sabah,
Şərm edər onun üzündən mahi-ənvər hər sabah.
Zülfi-şəbrəngi tökər qəddə bərabər hər sabah,
Müşkbudən aləmi eylər müəttər hər sabah,
Sübhi-sadiq tək açar sədrin müqərrər hər sabah.

Xabdan açar gözün ta nəgisi-fəttan kimi,
Ələ çəkər, müjganın eylər tiri-xunəfşan kimi,
Tərh edər üz yanına geysuləri reyhan kimi,
Qəddinə yaşıl geyər ol qönçeyi-xəndan kimi,
Başa üstündən çalar dəstari-əhmər hər sabah.

Bir mina gərdən, səfid əndam, fərbeh sim-saq,
Lalə rüx, mərmər sinə, nərmin bədən, şirin buxaq,
Tubi qamət, mahi-tələt, xoş əlamət, ay qabaq,
Oldu məsciddən haman dəm əhli-qiblə ittifaq,
Qaşıdır onun məgər mehrabü mənbər hər sabah.

Əylənər narın, danışar naz ilə, narin gülər,
Tərzi-göftarinə eylər tutilər təhsin, gülər,
Qaş gülər, həm göz gülər, ariz dəxi rəngin gülər,
Dünyada çoxdur gülən, amma bu çox şirin gülər.
Böylə də insan olur, ağzında şəkkər hər sabah.

Bilmişəm kuyin gözəl firdovsü gülşəndən onun,
Ta ölüncə oxların qoymam çıxa təndən onun,
Gəzdiyi yeri sevər gözüm elə gendən onun,
Vaqifəm, heç kimsə kəsməz zikrini məndən onun,
Eylərəm sidq ilə adın dildə əzbər hər sabah.

* * *

Ey gül, sənə yoxdur bu nəzakətdə qərinə,
Kuyin çəməni tənə vurar xuldi-bərinə,
Sünbül onu görcək özünü saldı qəminə,
Pəh-pəh, nə əcəb, şükr xudanın kərəminə,
Olmaz belə qamət, belə gərdən, belə sinə.

Xoşdur gül üzərində tamaşası bu zülfün,
Hifzində, görüm, saxlaya mövlası bu zülfün,
Düşdü xütən əmlakına qövğası bu zülfün,
Tu düşdü mənim başimə sevdası bu zülfün,
Zəncirilə divanələrin çəkdi səfinə.

Zülfün qoxusu, çox dilərəm, canimə gəlməz,
Rəhmi məgər əhvali-pərişanimə gəlməz,
Bir gecə qulaq asmağa əfğanimə gəlməz,
Bilməm nə olub, sevgili yar yanimə gəlməz,
Can çıxdı, xudaya, nə deyim mən bu gəlinə?

Bilməm, nə demiş dilbərə əda genə məndən,
Kəsmiş nəzəri, ahü vaveyla, genə məndən,
Ün yetməz onun səminə əsla genə məndən,
Döndərdi üzün ol güli-rəna genə məndən,
Eyb olmaya söysəm belə iqbalın içinə.

İyman gətirib çün hərəm olmağına Vaqif,
Sürtər üzünü bu qapı torpağına Vaqif,
Gəh zülfün öpər, gəh düşər ayağına Vaqif,
Hərdəm baş əyər qaşlarının tacinə Vaqif,
Sənsən mənə həm qibləvü həm Məkkə, Mədinə.

* * *

Dilbər, nə deyim, sən kimi canan ələ düşməz,
Zülfün kimi heç zülfi-pərişan ələ düşməz.
Ləlin kimi bir ləli-Bədəxşan ələ düşməz,
Bir yerdə belə hakimi-Loğman ələ düşməz.
Biçarələrin dərdinə dərman ələ düşməz.

Bir eylə nəzər ləşgəri-müjgan ələminə,
Gör necə keçib hökmü onun ruyi-zəminə.
Təbriz, Şəki, Gəncəvü, Kabil şəhərinə,
İran ilə Turan, Hələbü, Məkkə, Mədinə,
Bunlarda belə sən ciləyin can ələ düşməz.

Mən aşiq idim, şövqi onun var idi məndə,
Öz aşinin gərdənini saldı kəməndə,
Kişmir, Xəta, Misr, Buxaravü Xütəndə,
Movsul şəhəri, Çin ilə Maçinü Yəməndə,
Gərçi gəzələr Rum, Ərəbistan, ələ düşməz.

Əlqissə ki, yüz kafər ola, yüz də müsəlman
Tövrat ilə İncil, Zəbur, ayəti-Quran,
Tiflis, İrəvan, Şamü Cəbəl, cümlə Trabzan,
Dərbənd, Quba, Bakı, Şamaxilə Sifahan,
Yüz seyr oluna gülli-Dağıstan, ələ düşməz.

Nə mazi, müzaredə nəvaxanü xoşəlhan,
Nə Məğribü Məşriqdə əcaib belə insan,
Fihinnə vəmin heysü hüvə leysə kamakan,
Bilsə qədirin Vaqifin, eylər ona ehsan,
Əz ruzi-əzəl mən kimi ətşan ələ düşməz.

* * *

Ah... bir sərxoş nigarın dağı öldürdü məni,
Günbəgündən hüsnünün rövnağı öldürdü məni,
Ağ biləklərdə qızıl qolbağı öldürdü məni,
Eylədi şəhla gözün müştaği, öldürdü məni,
Hamıdan əla ki, qaşın tağı öldürdü məni.

Nə əcəb təsvir olur ağ əllərə əlvan həna,
Məxmuri gözlər piyalə, gərdəni misli mina,
Al sərəndazla qəsabə, üstə türfə ağ cuna,
Qol gümüş bazbəndli, beldə kəmər – üstü mina,
Məclis içrə bu nişanda saqi öldürdü məni.

Al yanaqların, sanasan ki, qızıl gül xərməni,
Tər zənəxdaninə baxdıqca cünun eylər məni.
Məst çeşminə əcaib rəng tutmuş sürməni,
Qurşayıb ol ağü nazik əllər ilə tirməni,
İki yandan ucların salmağı öldürdü məni.

Sallanıb yüz naz ilən hərdən çıxanda xanədən,
Hər tərəf baxsa, qırar həm dost, həm biganədən,
Əqlühuş ikrah olub getdi məni-divanədən,
Qara gözlər süzülüb sərməst olub peymanədən,
Ahu tək hərdəm dönüb baxmağı öldürdü məni.

Vaqifəm qıldım bu şuxun hüsnünü fikrü xəyal,
Günbəgün incəlibən oldu tənim muyə misal,
Axırı verdi məni bərbadə bu qaşı hilal,
Qəbrimin daşına yazsın bu sözü əhli-kamal,
Dilbərin məndən uzaq olmağı öldürdü məni.

* * *

Aldı canım naz ilə ol gözləri şəhla pəri,
Ləbləri püstə, yanağı laleyi-həmra pəri,
Cismi gül, başdan ayağa qaməti rəna pəri,
Sərvdən yeyrək, sənubərdən dəxi bala pəri,
Yavru laçın gözlü, topğun sinəli sona pəri.

Gözləri məstan, sürahi tək çəkilmiş gərdəni,
Qara zülfü müşkü ənbər, ağ bədən gül xərməni,
Saçları reyhan qoxulu, qoynu cənnət gülşəni,
Ləbləri kovsər məkanı, ağzı şəkkər mədəni,
Sözü şirin, özü amma xosrovü əla pəri.

Al geyib əlvan ləçək örtər, gülabəfşan çıxar,
Sanasan, bürci-fələkdən bir məhi-taban çıxar,
Seyrinə aləm sərasər hər tərəf, hər yan çıxar,
Əql uçar başdan, ürək oynar, cəsəddən can çıxar,
Göz ucuyla hər kimə eylər nihan ima pəri!

Ey mənim mahım, sənə bu şəhr, bu ellər fəda!
Basdığım torpağa hər dəm lalələr, güllər fəda!
Saçının hər muyinə yüz saçı sünbüllər fəda!
Ləhceyi-göftarına gülşəndə bülbüllər fəda!
Qaşının bir tağinə qurban iki dünya, pəri.

Vaqifəm, canım sənə hər dəm fədalar eylərəm,
Ah çəkib hicrində qarğu tək sədalar eylərəm,
Dərgahində kəbinə çox ilticalar eylərəm,
Gecə-gündüz ömrünə xeyrü dualar eylərəm,
Saxlasın dəhrin bəlasından səni mövla, pəri!

* * *

Ey səba, yarə de kim, avarə gördüm Vaqifi,
Qəm əlindən bikəsü biçarə gördüm Vaqifi,
Bağrı olmuş sərbəsər sədparə gördüm Vaqifi,
Aqibət salmış özün odlarə gördüm Vaqifi,
Gecə-gündüz müntəzir didarə gördüm Vaqifi.

Bir yanar atəş salıb pərvanə tək əzasinə,
Oxşayıbdır dəhrdə aişqlərin risvasinə,
Nalə eylər gecə-gündüz, yalvarır mövlasinə,
Baş qoşub eylə sənin ol zülfünün sevdasinə,
Bir zaman basmaz ayaq bazarə, gördüm Vaqifi.

Qaməti-mövzun ilə bir sərvi_gülşənsən, gözəl,
İki dünyanın səfavü zövqünə tənsən, gözəl!
İtməyə gözdən, könüldən ayrısan, gensən, gözəl!
Fikri, zikri, dediyi danışdığı sənsən, gözəl,
Mayil olmaz hər yetən göftarə, gördüm Vaqifi.

Qaşlarından ayrı ol mehrabı görməz gözləri,
Eyləməz şəmsə nəzər, məhtabı görməz gözləri.
Arizin istər, güli-sirabı görməz gözləri,
Ağlar eylə gecə-gündüz, xabı görməz gözləri,
Yandırıbdır canını odlarə, gördüm Vaqifi.

Söylə ki, başın üçün, bir lütf qıl, ey gülüzar!
Sallanıb sərvi-rəvan tək bu yana eylə güzar,
Gecə-gündüz dərdü qəm etmiş məni candan bezar,
Görməyə didarını hərdəm çəkər çox intizar,
Gözlərin tikmiş baxar yollarə, gördüm Vaqifi.

* * *

Çün bizim şalvarımız əlavü həm əfzəl gərək,
Rəngi yaşıl, bir qədər qəddi dəxi ətvəl gərək,
Əbrişimi zülfi-müşkəfşanə müstəmsal gərək,
Toxuyan amma onu bir ağü nazik əl gərək,
Lənbəran məhvəşlərindən bu işə feysəl gərək.

Ağ gərək, simin bədən şalvarbafin sinəsi,
Olmaya eşq əhlinə bir zərrə büğzü kinəsi,
Mehribanlıq etmək ola adəti-dirinəsi,
Müttəsil ovqat əlində şanəvü ayinəsi,
Sənəti-zülfə, buxağa cilvəvü seybəl gərək.

Bir pəri sima gərəkdir dilbəri-şalvarduz,
Yaşı ya on dörd, ya iyirmi ola, ya otuz,
Eyləyə hüsnü belə aşiq gecəsin misli-ruz,
Filməsəl, xurşidi-pürənvarə nisbət dilfruz,
Pərtövü rüxsarəsi manəndeyi-məşəl gərək.

Hər kimin ki, işi yaxşı, özü bir nakəs ola,
İstər onun daima toxuduğu bərkəs ola,
Haşalillah ki, ona rəğbət edən bir kəs ola,
Yəni şalvar toxuyan bir dilbəri-novrəs ola,
Yoxsa ki, mütləq deyil, ustadi-müstəməl gərək.

Vaqifəm, ruzi-əzəldən aşiqi-sövdaməzac,
İstərəm onu ki, onun saçı ola bir qulac.
Eylərəm bir elə yarın başmağın başıma tac,
Ey Məhəmməd Hüseyn ağa, edə gör sən bir əlac,
Düşdü bu şalvar işi, bir müşkül işdir, hal gərək.

* * *

Qış günü çünki dönər şol cənnətül-məvayə kürk,
Ol səbəbdən layiq olmuş firqeyi-mollayə kürk,
Görünür ədna əgərçi himməti-valayə kürk,
Eylə ki, püşak olur fəsli-şita əzayə kürk,
Tən edər yüz faxiri-məlbuseyi-dibayə kürk!

Kürk olan yerdə cahanın rəxti-əlvanı nədir?
Eşməkü zərdabə, bəkrəs çuxa, baranı nədir?
Pəri-qunun döşəyi, yastığı, yorğanı nədir?
Gərmü-nərm adamların qucağı, ya yanı nədir?
Rövzeyi-rizvanda bənzər hülleyi hurayə kürk!

Gün bü gündən belə istər hiç təfvir etməsin,
Badü bərfin istəsə təbdilü təğyir etməsin,
Yazadək kimsə mənə otaq təmir etməsin,
Savuğun hər nə əlindən gəlsə, təqsir etməsin,
Oldu bir cövşən xədəngi-şiddəti-sərmayə kürk.

Pusitini-bərrə ki, büzğalə vəxti filməsəl,
Eydi novruzi əyan etməkdədir, bürci-həməl,
Daxi sən lazım deyilsən, ey bahari-xoş əməl,
İstəməm şimdən geri xahi gəlmə, xahi gəl,
Artırıbdır yəni asayiş qədi-balayə kürk.

Vaqifa, çox lütf qılmış həzrəti-sübhan sənə,
Kürk irsal eyləmiş ol sahibi-Şirvan sənə,
Xaneyi-ehsanı abadan ki, verdi can sənə,
Tutma kəm, kim çox kərəmdir həm əzimü şan sənə,
Fəxr qıl kim, padişahlardan gəlir paşayə kürk.

* * *

Dəhrdə oldu mənə dildarü dilbər bir tüfəng,
Xəş qədi ayineyi-simü səmənbər bir tüfəng.
Çəkdi dudi-ahimi ta çərxi-çənbər bir tüfəng,
Canıma atəş salıb yaxdı sərasər bir tüfəng,
Yanə-yanə qaldım, olmadı müyəssər bir tüfəng.

Qıvrılır könlüm tüfəngdən dəm vuranda, mar tək,
Od saçır ağzımdan ol çaxmaği-atəşbar tək,
Gülleyi-eşki atar çeşmim şərarı nar tək,
Müşki barut ətrilə həm türreyi-tərrar tək,
Etmədi dimağimi mütləq müəttər bir tüfəng.

Bu Qarabağ içrə çox çıxdım tələb meydanına,
Müşkül oldu çünki yol bulmaq onun imkanına,
Eylədim bu müşkülü izhar Şirvan xanına,
Göstərib lütfü kərəm mən bəndeyi-fərmanına,
Etdi vədə ol şəhinşahi-dilavər bir tüfəng.

Bavər etdim vədəyə, gəldim ki, mən ol həm gələ,
Gəlmədi, amma gözüm yollarda qalıbdır hələ.
Nalişimdən hər zaman düşdü zəmanə zəlzələ,
Derlər ol bəylərbəyi həm axtarır düşməz ələ,
Qəhdə çıxmışdır məgər, Allahü əkbər, tüfəng?

Hər kim istər kim, vücudi mərəkə ara gərək,
Kəndi zatından silahü əslihə əla gərək,
Gülləsilə xuni-əda tökməyə sevda gərək,
Gər tüfəng olsa bizə, mümtazü bihəmta gərək,
Vaqifa, yoxsa deyil, məqbulumuz hər bir tüfəng.

* * *

Ey pərisima, sənin didarının müştaqiyəm,
Zülfü ənbər buylu, gül rüxsarının müştaqiyəm,
Gərdənində asılan şahmarının müştaqiyəm,
Şux qəmzə, nərgisi-xumarının müştaqiyəm,
Şol sənubər qəddü xoşrəftarının müştaqiyəm.

Qaşların tağın qoyub, qeyri hilalə baxmaram,
Arizindən göz kəsib, ol vərdi-alə baxmaram,
Xeyli heyranam sənə, özgə cəmalə baxmaram,
Tutinin ağzındakı şəkkər məqalə baxmaram,
Mən sənin şirin-şirin göftarının müştaqiyəm.

Hər yetən naməhrəmi özünə məhrəm eyləmə,
Yar, mənə qan ağladıb, əğyarı xürrəm eyləmə,
Özünü söz bilməyən nafəhmə həmdəm eyləmə,
Zülm qıl, canımdan ol azarını kəm eyləmə,
Şadıman eylər məni, azarının müştaqiyəm.

Olmasa bir ləhzə gər qəddin nəzərgahım mənim,
Asimani-niligunu titrədər ahım mənim,
Mən sənin bir çakərin, sənsən gözəl şahım mənim,
Könlümü zülmatə salmış hicrin, ey mahım mənim,
Gəl ki, şimdi ruyi-pürənvarının müştaqiyəm.

Vaqifi öldürdü ol məhrulərin pərvizəsi,
Bağrıma müjganın sancıldı tirü nizəsi,
Zəxmi-sinəmdən töküldü üstüxanım rizəsi,
Ey Qarabağın yeni açmış güli-pakizəsi,
Xəstəyəm, qoynundakı ol narının müştaqiyəm!

* * *

Bir gözəl qamətli yari-lalərəngi sevmişəm,
Yarə istiğnası şirin şuxü şəngi sevmişəm,
Qaşı yay, kirpikləri türfə xədəngi sevmişəm,
Ox atıb qanlar tökən türkanə cəngi sevmişəm,
Halə rəhmi gəlməyən bir bağrısəngi sevmişəm.

Naz ilə sərxoş gedəndə ol gözəllər sərvəri,
İki yandan mövc edir zərrin kəlağey ucləri,
Bir mələkdir, sanasan, uçmağa açmış şəhpəri,
Rövzeyi-kuyi Mədinə, qaşı Kəbə minbəri,
Arizi üzrə həcər tərhində bəngi sevmişəm,

Bad əsib üzdən niqabı açılanda gah-gah,
Şöləsindənün olur göydə xəcil, şərməndə mah,
Gərdəni, qəddi tamam göyçək, rüxü süni-ilah,
Sərbəsər əndamı ağ, qaşı, gözü, saçı siyah.
Al hənadan lalərəng gülgunə çəngi sevmişəm.

Hər zaman kim, ol sənəm gedir qabağımdan mənim,
Başadək bir od düşər, yanar ayağımdan mənim,
Göy dəyir bir-birinə ahi-fəğanımdan mənim,
Kəsmə mina qülqülün, saqi, qulağımdan mənim,
Xəndeyi-cananə bənzər mən bu həngi sevmişəm.

Vaqifəm, hərdəm dilimdə əzbərim dost adıdır,
Qəddi xoş, rəftarı könlüm bağının şümşadıdır.
Gözlərindən ələma kim, canımın cəlladıdır,
Mən sevən dilbər Məhəmmədin gözəl övladıdır,
Deməyin, Sənan kimi azıb firəngi sevmişəm.

* * *

Mən cahan mülkündə, mütləq, doğru halət görmədim,
Hər nə gördüm, əyri gördüm, özgə babət görmədim.
Aşinalar ixtilatında sədaqət görmədim,
Biətü iqrarü imanü dəyanət görmədim.
Bivəfadan lacərəm təhsili-hacət görmədim.

Xah sultan, xah dərvişü gəda bilittifaq.
Özlərin qılımş giriftari-qəmü dərdü fəraq,
Cifeyi-dünyayədir hər ehtiyacü iştiyaq
Munca kim, etdim tamaşa, sözlərə asdım qulaq,
Gizbü böhtandan səvayı bir hekayət görmədim.

Hər sədavü səs ki, dünyaya dolub əksər əqəl,
Cümlə məkrü alü fənnü fitnədir, cəngü cədəl,
Dihəmü dinar üçündür hər şeyə yapışsa əl,
Müqtədilərdə itaət, müqtədalərdə əməl,
Bəndələrdə simü, bəylərdə ədalət görmədim.

Xəlqi-aləm bir əcəb düstur tutmuş hər zaman,
Hansı qəmli könlü kim, sən edər olsan şadiman,
O sənə, əlbəttə ki, bədguluq eylər, biguman,
Hər kəsə hər kəs ki, etsə yaxşılıq, olur yaman,
Bulmadım bir dost ki, ondan bir ədavət görmədim.

Alimü cahil, müridü mürşidü şagirdü pir,
Nəfsi-əmmarə əlində sərbəsər olmuş əsir,
Həqqi batil eyləmişlər, işlənir cürmi-kəbir,
Şeyxlər şəyyad, abidlər abusən qəmtərir,
Hiç kəsdə həqqə layiq bir ibadət görmədim.

Hər kişi hər şey ki sevdi, onu behtər istədi,
Kimi təxti, kimi taci, kimi əfsər isətdi.
Padişahlar dəmbədəm təsxiri-kişvər istədi,
Eşqə həm çox kimsə düşdü vəsli-dilbər istədi,
Heç birində aqibət, bir zövqü rahət görmədim.

* * *

Mən özüm çox kuzəkarı kimyagər eylədim,
Sikkələndirdim qübari-tirəni zər eylədim,
Qara daşı döndərib yaquti-əhmər eylədim,
Daneyi-xərmöhrəni dürrə bərabər eylədim,
Qədrü qiymət istəyib, qeyr əz xəsarət görmədim.

Eyləyən viranə Cəmşidi-Cəmin eyvanını,
Yola salmış, bil ki, bəzmi-işrətin çəndanını.
Kim qalıbdır ki, onun qəm tökməyibdir qanını.
Dönə-dönə imtahan etdim fələk dövranını,
Onda mən bərəkslikd özgə adət görmədim.

Gün kimi bir şəxsə gündə xeyr versən səd həzar,
Zərrəcə etməz ədayi-şükri-nemət aşikar,
Qalmayıbdır qeyrətü şərmü həya, namusü ar,
Dedilər ki, etibarü etiqad aləmdə var,
Ondan ötrü mən də çox gəzdim, nəhayət, görmədim.

Müxtəsər kim, beylə dünyadən gərək etmək həzər,
Ondan ötrü kim, deyildir öz yerində xeyrü şər,
Alilər xaki-məzəllətdə, dənilər mötəbər,
Sahibi-zərdə kərəm yoxdur, kərəm əhlində zər,
İşlənən işlərdə əhkamü ləyaqət görmədim.

Dövlətü iqbalü malın axirin gördüm tamam,
Həşmətü cahü cəlalın axirin gördüm tamam,
Zülfü ruyü xəttü xalın axirin gördüm tamam,
Həmdəmi-sahibcəmalın axirin gördüm tamam,
Başədək bir hüsnü-surət, qəddü qamət görmədim.

Ya imam-əl-insü vəlcinnü şahənşahi-ümur,
Getdi din əldən, bu gündən böylə sən eylə zühur,
Qoyma kim, şeytani-məlun eyləyə imanə zur,
Şöleyi-hüsnünlə bəxş et tazədən dünyayə nur –
Kim, şəriət məşəlində istiqamət görmədim.

Baş ağardı, ruzigarım oldu gün-gündən siyah,
Etmədim, səd heyf kim, bir mahi rüxsarə nigah,
Qədr bilməz həmdəm ilə eylədim təbah,
Vaqifə, ya rəbbəna, öz lütfünü eylə pənah,
Səndən özgə kimsədə lütfü inayət görmədim.

* * *

Mərhəba, sən bizə, ey türfə cavan, xoş gəldin!
Payinə peşkəş ola baş ilə can, xoş gəldin!
Bas gözüm üstə qədəm, sərvi-rəvan, xoş gəldin!
Sənə müştaqdı dil, qönçə dəhan, xoş gəldin!
Gəl-gəl, ey qumri səda, tuti zəban, xoş gəldin!

Həqdən istərdim əya yarü vəfadar səni,
Xoş yetirdi mənə ol qadirü qəffar səni,
Qoymanam getməyə kim, ta nəfəsim var, səni,
Görmədi yolda, nə yaxşı, rəqib, əğyar səni,
Belə bivaxtəvü pünhanü nihan, xoş gəldin!

Surətin kilki-qəzanın xəti-mənquşəsidir,
Ömrü cavid qılan ləli-ləbin tuşəsidir,
Zülfünün badi-səba aşiqi, mədhuşəsidir,
Bəndə xanə sənin öz mətbəxinin guşəsidir,
Əfvi-təqsir buyur şahi-cahan, xoş gəldin!

Nə zaman ki, deyəsən ey güli-xəndan, gedərəm,
Bil ki, mən həm düşübən dalına giryan gedərəm,
Yəni zülfün kimi çox halı pərişan gedərəm,
Öz ayağınla gəlibsən, sənə qurban, gedərəm,
Ey qara kirpiyi ox, qaşı kaman, xoş gəldin!

Çün gəlibsən, kərəm et, sən dəxi bizdən getmə!
Görməsəm gər səni bir dəm, ölərəm mən, getmə!
Dolanım başına, Allahı sevərsən, getmə!
Gedər olsan yenə gəl, bizdən elə gen getmə!
Qoyma gəl Vaqifi çox da nigaran, xoş gəldin!

* * *

Dərdin öldürdü məni, ey növcəvanım, gələ gör,
Həsrətindən oda yandı din, imanım, gələ gör,
Yoluna baxa-baxa üzüldü canım, gələ gör,
Ey gülüm, ey nərgisim, sərvi-rəvanım, gələ gör,
Ey dodağı şəkkərim, şirin dəhanım, gələ gör!

Səndən ayrı kəsilib səbrü qərarım gecələr,
Yuxu gəlməz gözümə, artır azarım gecələr,
Asimanə dayanır naləvü zarım gecələr,
Sübhəcən qan ağlaram, ey gülüzarım, gecələr,
Dərdin öldürdü məni, ey novcəvanım, gələ gör!

Müştaqam qamətinə, gərdəninə, qollarına,
Qaşına, qabağına, ağ üzünə, xallarına,
Zülfünə, buxağına, yanağına, əllərinə,
Ey gözəllər sərvəri, qurban olum yollarına,
Həsrətinlə oda yandı din-imanım, gələ gör!

Mən səni görməkdən ötrü bari bir gəz, ey sənəm,
Canımın hövlündən aya neyləyim heç bilmənəm,
Dərdim artıb az qalıbdır ki, o İsaya dönəm,
İstərəm gündə kəlisa qapısında əylənəm,
Ey gülüm, ey nərgisim, sərvi-rəvanım, gələ gör!

Könlümü tutmuş sərasər dərdü möhnətlər mənim,
Hər işim Məcnun kimi olmuş hekayətlər mənim,
Ara yerdə başıma qopmuş qiyamətlər mənim,
Könlümün gülzarına dəymiş çox afətlər mənim,
Yoluna baxa-baxa üzüldü canım, gələ gör!

Vaqifə hicrin sənin çox zülmü bidad eylədi,
Olmadı dərmanı bunca dadü fəryad eylədi,
Bu qəziyyə cümleyi-düşmənləri şad eylədi,
Aqibət eşqin məni, ey şux, Fərhad eylədi,
Ey dodağı şəkkərim, şirin dəhanım, gələ gör!

* * *

Valinin çeşmi-çırağı, vəh nə türfə can imiş,
Külli-Gürcüstan üstə sayeyi-sübhan imiş,
Düşməni pamal edən sərdari-valaşan imiş,
Aləmin sərdəftəri, adı Edlon xan imiş,
Saxlasın Allah pənahında, əcəb oğlan imiş.

Heç yoxdur nisbəti, özgə diyarın xanına,
Bir cavandır kim, yaraşır padşahlıq şanına,
Dəyməsin afət yeli, yarəb, güli-xəndanına,
Sərbəsər aləm gərəkdir baş əyə fərmanına,
Taqi-əbruyi-lətifi qibleyi-iman imiş.

Xoş tamaşa eylədim, gördüm tamam ətvarını,
Çox bəyəndim özünü, həm ləhceyi-göftarını,
Maşallah, zahir etmiş ululuq asarını,
Belə sandım kim, Məlekdir əvvəla didarını,
Xeyli çağdan sonra bildim kim, gözəl insan imiş.

Sayır oğlundan xanın gər olmadıq biz ruşinas,
Manei yox, onları həm eylədik bundan qiyas,
Bu ocaq böylə ocaqdır, eyləmiş nur iqtibas,
Vaqifa, sən qıl xudayə hər zaman şükrü sipas,
Valinin ocağı beylə gün kimi taban imiş.

* * *

Vəh, bu bağın nə əcəb sərvi-dildarları var,
Hər tərəf tazə açılmış güli-rənaları var,
Açılıb tazəvü tər laleyi-həmraları var,
Yəni Tiflisin əcəb dilbəri-zibaları var,
Ey könül, seyr elə kim, türfə tamaşaları var.

Mərhəba, Tiflis imiş cənnəti dünya yerinin,
Yığılıbdır ona cəmiyyəti hurü pərinin,
Mən bu şəhrin nə deyim vəsfini dilbərlərinin,
Filməsəl, şəklü şəmayildə, bəli, hər birinin
Məhi-tabanə bərabər sərü simaları var.

Ol qədərdir büti-nazikbədənü incəmiyan,
Eyləmək olmaz onun vəsfini məlumü əyan,
Hər biri nazü nəzakət bilə min afəti-can,
Cümlə bir cilvədə, bir şivədə, xoş sərvi-rəvan,
Məst tavus kimi gərdəni-minaları var.

Üzləri pərtövi-mehri-cahanara kimidir,
Səfheyi-sinələri simi-müsəffa kimidir,
Ləzzəti-ləhcələri nitqi-məsiha kimidir,
Əlləri möcüzeyi-həzrəti-Musa kimidir,
Dilrübalıqda əcaib yədi-beyzaları var.

Ala gözlər süzülüb-nərgisi-sirabə dönüb,
Ağ qabaqda xəmi-əbruləri mehrabə dönüb,
Ləl tək ləblərinin rəngi meyi-nabə dönüb,
Tökülüb gərdənə saçlar ucu qüllabə dönüb,
Sona cıqqası kimi zülfi-mütərraları var.

Nə qədər varisə buxaqü zənəxdanü yanağ,
Tazə gül yarpağı tək qırmızıdır nazikü ağ,
Bir-birindən götürüb şöləsini misli-çirağ,
Görməyib kimsə belə qaşü gözü dişü dodağ,
Özgə babət sifətü surətü əzaları var.

Bağı-rizvanda əgər huriyü qılman çoxdur,
Bu gözəllər kimi məqbulu müzəyyən yoxdur,
Nəsl-bər-nəsl gözəllik bulara buyruqdur,
Mən görənlər ki, mələkdən, pəridən artıqdur.
Hələ derlər ki, bulardan dəxi əlaları var.

Kəsrəti-hüsn ki, xoş mərtəbədir insanə,
Bəxş edibdir onu həqq dilbəri-Gürcüstanə,
Yox, sual etmək əgər məsləhəti-yezdanə,
Nola, yarəb, səbəbi, baisi bu xubanə?
Belə surətlərin, əlbəttə ki, mənaları var.

Qalmışam valehü matü mütəhəyyir, dili lal,
Ey xudavəndi-cahan, gizli deyildir sənə hal,
Bu necə sibi-zənəxdan, bu necə zibü cəmal –
Ki, veribsən sulara sən bu qədər izzü kamal,
Necə kim, var cahan, surətü əzaları var.

Bədəni-pakı çəkib abi-rəvan tək sulara,
Ağarib tazəvü tər cümlə dönübdür qulara,

Abi-Kür nisbət edib boylarını qarğulara,
Neçə şeydən belə zahir ki, xudanın bulara
Nəzəri-mərhəməti, lütfi-hüveydarları var.

Biri həmmam ki, qüdrətdən olub bəzlü bərat,
Biri Kür suyi ki, hər cürəsi bir abi-həyat,
Biri bu xubluğu göyçəkligü pakizə sifat,
Biri oldur ki, nəcib, əsldə alidərcat,
Aləmin sərvəri vali kimi ağaları var!

Yedi həmmam, nə həmmam ki, sərmənzili-hur,
Həşt cənnət kimi hər guşəsi bir mətləi-nur,
Bir əcəb abi-rəvan gərm qılıb onda zühur,
Şükür təqdirinə, ey qadirü qəyyumü qəfur,
Lütfünün bəndələrə nemətü-üzmaları var.

Mənbəi-cudü kərəmdən açılır dürri-xoşab,
Basəfa hövzə dəmadəm tökülür misli-gülab,
Girsə bir kərrə ona mən kimi bir xanəxərab,
Getməz ondan dəxi bir canibə manəndi-hübab,
Getsə də badə nə ki, mənzilü məvaları var.

Gərçi, ey Xizr, bulubsan şərəfi-feyzi-əzəl,
Verməyibdir könül asayişi amma sənə əl,
İstəsən ömri-dübarə, görəsən türfə gözəl,
Bircə təşrif gətir, Tiflisin həmmamına gəl,
Gör necə rahəti-canbəxşi-tənasaları var.

Bu ocaq böyülə ocaqdır ki, işıq ayə salır,
Gün kimi şöləsini cümleyi-dünyayə salır,
Tez tutar xainü bədxahları vayə salır,
Hər kimin başına kim, mərhəmətü sayə salır,
Elə bilsin onların dinilə dünyaları var.

Vaqifa, səndə ki, yoxdur, bilirəm, zöhdü riya,
Şərti-ixlas gərək eyləyəsən indi əda,
Elə bu valiyə, oğlanlarına xeyrü dua!
Saxlasın onları öz hifzi-pənahında xuda,
Hasil etsin nə qədər dildə təmənnaları var.

* * *

Naz ilə ta ol büti-ziba kəlisadan çıxar,
Sərkəşü xəndanü bipərva kəlisadan çıxar,
Şahdır guya, geyib diba, kəlisadan çıxar,
Açıban tələt günəş asa, kəlisadan çıxar,
Şölə salmış aləmə kim, ta kəlisadan çıxar.

Şanəvəş seyqəl verib zülfi-bənəfşə nisbətə,
Pərdə mütləq tutmayıb simavü sədrü surətə,
Qıl tamaşa gərdənə, seyr eylə qəddü qamətə,
Qaşü göz, qəmzə, məazəllah, dönübdür afətə,
Etməyə din mülkünü yəğma, kəlisadan çıxar.

Ləhzə-ləhzə eylədikcə mahrüxsarı zühur,
Ləmə-ləmə ziri-bürqədən düşər dünyayə nur,
Onu bir kərrə görən dindən olur, əlbəttə, dur,
Necə kim, cənnət sarayından çıxar, qilmanü hur,
O şəkil bu düxtəri-tərsa kəlisadan çıxar.

Gül kimi nərmilə nazik pirəhəndə ağ bədən –
Bilmənəm kim, şölədir, ya xərməni-bərgi-səmən,
Dişləri qəltan sədəf, çün ağzıdır ləli-Yəmən,
Ağ qabaqda bir göz onun taqi-əbrusun görən
Meyli-məscid eyləməz, haşa, kəlisadan çıxar.

Vaqifəm, ta ki, gözüm sataşdı onun qaşına,
İstədi merabü mənbərdən xəyalım daşına,
İndi bildim kim, nə gəlmiş Şeyx Sənan başına,
Ya budur kim, Tiflisi qərq eylərəm göz yaşına,
Ol sənəm vəsli məimçün ya kəlisadan çıxar.

* * *

Verdi ağa mənə bir çuxa ki, min donə dəyər,
Qeysəri-Rum geyən rəxti-humayunə dəyər,
Filməsəl, xələti-xaqan-Fridunə dəyər,

Yaxası yaxa dolu lölöi məknunə dəyər,
Müxtəsər hər ətəyi bir ətək altunə dəyər.

Çuxa çox görmüşəm, amma ki, bu babət, nə deyim,
Kimsədə görməmişəm – qabili-qamət nə deyim,
Eləyibdir kişi bu işdə qiyamət nə deyim,
Göstərib dərzi bir əcazü kəramət, nə deyim –
Ki, tamam kari-Ərəstuyü Fəlatünə dəyər.

Cənnət əsbabına, zahid, bu qədər müştərisən,
Az danış, başım aparma, kişi, sən sərsərisən,
Kor deyilsən, hələ bir sil gözünü, bax bəri sən,
Sündüsi-xüzrilə tut bu çuxeyi-əhməri sən,
Gör bunun hansı biri qiyməti-əfzunə dəyər.

Belə kim, bu çuxadır zivəri-Fərxəndəliqa,
Görməyib kimsə dəxi səlli-əla-ali-əba,
Versin Allah bunu bəxş eyləyənə ömri-bəqa,
Ləffü nəşrində mürəttəb fərəhü zibü səfa,
Pəri-tavusda olan adəti-qanunə dəyər.

Gər mənə başdan ayağa verələr hülleyi-hur,
İç üzü gün kimi zər katibi, içi səmmur,
Haqq bilir, bilməz idim zərrəcə mən nazü qürur,
Əl verib könlümə indi o qədər zövqü sürur,
Cami-Cəmdə içilən badeyi-gülgunə dəyər.

Var imiş məndə əcəb talei-xoş, bəxti-niku,
Bəxşi-ərzani olub eylə ki, gəldi mənə bu,
Bundan iraq ola, yarəb, nəzəri-çeşmi-ədu,
Hər geyib durmağı bir dilbərilə ruy-bəru
Bağı-cənnətdə olan tubiyi-mövzunə dəyər.

Nə əcaib çuxadır bu, nə gözəl sovbi-şərif
Tələti tazəvü tər, şivəsi xoş, buyi lətif.
Şairin təbi kimi nazikü-zibavü zərif,
Mətləi – “Məsnəviyə çaki-gribani rədif,
Caminin səci kəlamindəki movzunə dəyər.

Hər kimin caməsi mahut və ya bəkrəs olur,
Xalq arasında məkanı fələki-ətləs olur,
Gərçi xar olsa özü, yarı güli-novrəs olur,
Mahvəşlərdən onun müştərisi çox kəs olur,
Bu hesab üzrə liqa məxzəni-Qarunə dəyər.

Kimsə bilməz bu giranmayə mətai-Həsəni,
Çuxadır qırmızı, ya daneyi-ləli-Yəməni,
Dilbərin sərv qədi, lalərüxün gül bədəni,
Yusifin, yoxsa ki, Yəqubə gələn pirəhəni?
Çeşmi-tarə çəkilən pərdeyi-pürxunə dəyər.

Nökəri yaxşı bəyin misli-ağazadə gəvər,
Qəmi-dünyanı yeməz, necə ki, dünyadə gəzər,
Rütbəsi mərəkədə – mənzili-əladə gəzər,
Vaqifi bilmənəm aya neçün üftadə gəzər.
Belə çuxa geyənin kəlləsi gərdunə dəyər.

* * *

Üzündən ol günəş rüxsar ta məcər çəkib durmuş,
Özün bir guşəyə ondan məhi-ənvər çəkib durmuş,
Mələkdir evci-əladə, sənarsan, pər çəkib durmuş,
Sənubər tək əcəb tərzilə qəddü sər çəkib durmuş,
Cəbinində kəman əbrulərin xoştər çəkib durmuş.

Zənəxdan çövrəsində zülfi-müşgəfşanmıdır, yarəb?
Gülün yanında yoxsa dəsteyi-reyhanmıdır, yarəb?
Bu nazik ləli-ləb ol qönçeyi-xəndanmıdır, yarəb?
Sədəf ağzındakı dürdaneyi-dəndanmıdır, yarəb?
Və ya sərraf nəzmə bir neçə gövhər çəkib durmuş.

Nihan bir göz ucuylə eylədi nagah nigah, çeşmi,
Məni öldürməyə onun edər sabit günəh çeşmi,
Belə pürnazü qəmzə ola bilməz padişəh çeşmi,
Zərəfşan tirü müjgan içrə ol şuxin siyəh çeşmi,
Sanasan, rəhmsiz cəlladdır xəncər çəkib durmuş.

Rüxi izhar qılmışdır hərarət, nəm gəlir ondan.
Məgər gül bərgidir kim, üqdeyi-şəbnəm gəlir ondan.
Məsiha nitqidir, dil dağına məhrəm gəlir ondan,
Nəsimi-canfəza hər ləhzəvü hərdəm gəlir ondan,
Müsəlsəl türreyi-tərrarinə ənbər çəkib durmuş.

Şirin sözlü cavanın getsə hüsnü, ləzzəti getməz,
Şəkər nisbət durur hərçənd qədrü qiyməti getməz,
Kəsilməz zövqi, xatirdən səfavü ülfəti getməz,
Bu huri tələtin Vaqif əlindən şövkəti getməz,
Mələklər səf dərində ta dəmi-məhşər, çəkib durmuş.

## MÜSTƏZADLAR

Yarım nə gözəl geyinib, əlvan bəzənibdir,
Balapuşi – yaşıl,
Gülşəndə, sanasan, güli-xəndan bəzənibdir,
Xurşidə müqabil.

Sübhi duruban cilvə verir iki yanağə,
Dünyaya salır nur,
Bir hüsni-bədi-tələti-taban bəzənibdir,
Xoş rövnəqi kamil.

Fitnə gözünə sürmə çəkib, qaşinə vəsmə,
Can almağa durmuş,
Hər qəmzəsi bir afəti-dövran bəzənibdir,
Bir qəmzəsi qatil.

Ənbərmi və ya müki-Xətən, reyhan iyidir,
Hərdəm gəlir ondan,
Səndəl qoxulu zülfü pərişan bəzənibdir,
Qarətgəri-kamil.

Vaqif, nə tamaşə, nə əcaib, nə qiyamət,
Ərər xəcil oldu.
Ta gördü ki, ol sərvi-xuraman bəzənibdir,
Aləm ona mayil.

* * *

Ya rəbbi, bu şəhrə, o üzü mah gələydi,
Gedəydi bu zülmət,
Məcmueyi-xubana şahənşah gələydi,
Edəydi ədalət.

Hicran, mənə sən çox elədin zülmü sitəmlər,
Səndən edərəm mən,
Fəryadıma ol xosrovi-dərgah gələydi,
Gör kim, nə şikayət.

Bileydi ki, Fərhad kimi təlxməzacəm,
Bir dadə yetəydi.
Ol ağzı şəkər, sözü şirin xah gələydi,
Edəydi inayət.

Vaqif, gecələr eyləmək olmaz qəmə dərman
Gər olmasa həmdəm,
Allahdan olub lütf o həmrah gələydi,
Qıl gündə mübahət.

* * *

Ey zülfü siyəh, sinəsi əbyəz, gözü alə,
Nə türfə cavansan!

Ağzın kimi yox qönçə, yanağın kimi lalə,
Gülzari-cinansan!

Görsə üzünü məh yetər, əlbəttə, zəvalə,
Xurşidi-cahansan!
Heç bəndə sənə olmaya, yarəb ki, həvalə,
Sən afəti-cansan!

Söz yox bu zənəxdanəvü ruxə, xətü xalə,
Xubluqda əyansan!
Dibaçeyi-lövhi-qələmə katibi-qüdrət
Yazmışam səni əvvəl.

Heç adəmə üz verməmiş əsla belə surət,
Pürzinətü seyğəl,
Zülfün sözü hər nüsxədədir, ey pəri tələt,
Bir şərhi-mütəvvəl.

Göydə yetirir müttəsil ayə, günə xiclət,
Hüsnündəki məşəl.
Müjganın urar tənə oxun göydə hilalə,
Xub qaşı kamansan!

Rəftari-qədin eylədi sayə kimi pamal
Şümşadı çəməndə.
Qan ağladır ol qönçeyi-xəndani məhü sal,
Ləlindəki xəndə.

Sultani-cahan sərvərisən-sahibi-iqbal,
Aləm sənə bəndə,
Göftarın edər tutiyi-şəkkərşikəni lal,
Hər nitqə gələndə.

Sən Xosrov olubsan, vəli hər şəhd məqalə
Şirini-zəmansan!
Sənsən, sənəma, cümleyi-xubanə şəhənşah,
Yox sən kimi dilbər.

Bərqi-üfüqündən ki, üzün bir çıxa nagah,
Xurşidə bərabər,
Salır özünü ziri-niqabə şəfəqü məh,
Manəndeyi-əxtər.

İnsan ola bilməz bu sifət pak, münəzzəh,
Cəm olsa sərasər,
Sən cinsi-mələksən yetişibsən bu kəmalə,
Ya ruhi-rəvansan?

İsna əşərə çakəri-kəmtər ola Vaqif,
Sərdaridir əla,

Xaki-dəri-evladi-peyəmbər ola Vaqif,
Neylər dəxi dünya?

Ol gündə ki, həngameyi-məşər ola Vaqif,
Xof eyləmə əsla!
Sən qərqsən hərçənd ki, dəryayi-vəbalə,
Tofiq bularsan.

* * *

Sən qönçə kimi hər bir edən dəmdə yaşınmaq,
Artar bizə yüz mərtəbə odlarına yanmaq,
Mən aşiqəm, ey gül sənə, olmaz bunu danmaq,
Ölən günədək eyləməzəm səndən usanmaq,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Allaha şükr, lalə yanağında eyib yox,
Dişində, dəhanində, dodağında eyib yox...
Bir zərrəcə zülfündə, buxağında eyib yox,
Qaşında, gözündə, qabağında eyib yox,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Allaha şükür, lalə yanağında eyib yox,
Dişində,dəhanində, dodağında eyib yox...
Bir zərrəcə zülfündə, buxağında eyib yox,
Qaşında, gözündə, qabağında eyib yox,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Mən ha sənin ol məh üzün görmüşəm yüz yol,
Ox kirpiyini, şux gözünü görmüşəm yüz yol,
Həm yoldaşını, həm özünü görmüşəm yüz yol,
Şəkkər kimi şirin sözünü görmüşəm yüz yol,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Mən xud deyiləm bədnəzər, ey gözləri şəhla,
Məndən üzünü yaşırasan sən elə bica.
Qoysan, eləyim üzünə doyunca tamaşa,
Öldürdün axır, məndə ki, can qalmadı əsla,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Qeyridən əgər ki, edəsən sən bu hicabı,
Billəm ki, sözündür vəli məqbulu hesabı,
Yoxsa, məni görcək, üzünə çəkmə niqabı,
Gəl, Tanrı üçün, Vaqifə çox vermə əzabı,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

* * *

Bir nimtənə kim, ta ola zərbəftü nikutər,
Diba ona möhtac,
Mətnində tamam rabitə mövzunu sərasər,
Tək haşiyə qiyqac;
Üstündə onun aşiqü məşuq müsəvvər,
Dil şövqünə minhac,
Ulduza şəbih nəqşi, yeri göy kimi əxzər,
Nəzzarəsi bəhhac;
Tiri-nəzəri-əhli-təmaşayə müqərrər,
Hər butəsi amac;
İçində onun şölə verə tələti-dilbər,
Ta bəndeyi-vəhhac;
Görən deyə bu mahdır, ol çərhi-pürəxtər,
Ya bəhri-pürəmvac;
Kəbə evinin örtüyünə duta bərabər
Simasını hüccac;
Gər düşsə ətəyi ələ, əlbəttə, tez eylər,
Bizdən qəmi ixrac;
Əndişə nə itdir, çıxa bir də çəkə ləşkər,
Könlü edə tarac.

Şənü şərəfi xələti-şahanədən artıq,
Pirayeyi-şövkət;
Fərrü fərəhi zibi-ərisadən artıq,
Sər dəftəri-zinət;
Tənü tərəbi nəşəyi-peymanədən artıq,
Zövqi-meyi-cənnət;
Zər düymə giribanına dürdanədən artıq,
Mənzum ola, əlbət;
Əqli gedə, sərxoş gəzə divanədən artıq,
Onu geyən övrət,

Dönə ərinin başına pərvanədən artıq,
İşlər tapa surət;
Zülfə bu dönüm sarmaşa əl şanədən artıq,
Candan çıxa həsrət;
Oxuna bucaqlarda kütubxanədən artıq,
Əhkami-şəriət;
Tərifi düşə dillərə əfsanədən artıq,
Ta ruzi-qiyamət;
Cəm olsa əgər bir yerə yüz camei-əkbər,
Cümləsinə sərtac.

Ol vaxt ki, şod hazirü mövcudü mühəyya,
İn rəxti-dilaviz,
Bayəd ki, fürüstadə şəvəd zud bəinca
Əz peyk səbükxiz,
Əz bəhri-hüsuləş benişin, fikri bifərma
Gu çareyi-təcviz,
Nəleyn-bə papuş ze-ahən bəkəf əmma
Dərgir əsa niz,
Ziri-qədəm əfkən həmə məxluq sərapa
Ba nikü bəd amiz,
Mipors zi-hər millətü hər cins, xüsusa
Əz mərdümi-Təbriz,
Rov zəhməti, imruz bikəş əz peyi-fərda
Ey puri-dilaviz!
Nə ğüssə zi pəs xorü, nə az piş qəm əsla

Bi pərdəvü pəhriz,
Tən deh bəqəza baş peya-pey peyi-sevda
Məngəh bə digər niz,
Ta anki bizayi pesəri ey Əbu-Cəfər
Çün düxtəri-sərrac.

Zahir ki, mənə tənü təərrüz yetən eylər,
Yəni ki, flani,
İmdən geri arayişi-əsbabi-zən eylər
Tevri-Sefəhani,
Bu bitəti nə ləzgi və nə şəhsevən eylər
Nə kürdi-Kolani,
Derlərdi ki, külfətlərinə pirəhən eylər
Kirbasü kətani,
O böylə deyildi görəsən ki, nədən eylər,
Kim azdırıb anı,
Seyrani gülüstanə məgər ki, gələn eylər
Təğyir həvanı,
Özün ki, qocalmış kimi xoy dəyşirən eylər
Oğlani-zəmani,
Rişxənd edibən daxi neçin çöp dərən eylər
Hatəm xan ağanı,
Neylim, tuturam mən qələt anı deyən eylər
Fərmani-xudanı,
Böylə buyurubdur ər edə övrətə zivər
Ol xaliqi-əzvac.

Vaqif ər olan övrətə heyran necə olmaz,
Çağ etsə damağın?
Heyran ki, olur bəndeyi-fərman necə olmaz?
Sözün sölə sağın.
Sevməzmi, nə sözdür, dili suzan necə olmaz
Pərvanə çirağın?
Dönməzmi hübabə, evi viran necə olmaz,
Yıxmazmı otağın?
Həmdəmsiz igid çaki-giriban necə olmaz,
Açmaz yaxa bağın?

Al qana boyar, qərqeyi-tufan necə olmaz,
Göz qarasın, ağın?
Qönçə dəhənin görməsə, giryan necə olmaz,
Xəndan dodağın?
Ol xanəxərabın ciyəri qan necə olmaz,
Boş görsə qucağın?
Peşkəş belə yoldaşına baş, can necə olmaz?
Onun ki, ayağın
Götürmüş ola ciyninə peyğəmbəri-sərvər
Ol sahibi-merac.

## MÜƏŞŞƏRLƏR

Ey büti-tutizəban, gəl ki, məqalın istərəm,
Təşneyi-didarinəm, abi-zülalın istərəm,
Nazi-gərmü qəmzeyi-çeşmi-qazalın istərəm,
Üz bəyazında sənin öz xəttü xalın istərəm,
Mətləi-vəchində əbruyi-hilalın istərəm,
Sayeyi-sərvi-qədi-tuba misalın istərəm,
Dəmbədəm zövqi-təmaşayi-cəmalın istərəm,
Tari-zülfi-müşkrəngü ruyi-alın istərəm,
Qalmışam hicrində, gülzari-visalın istərəm,
Ey büti-tutizəban, gəl ki, məqalın istərəm!
Güllər açılmış, bu gün eyşü nişatın vəqtidir,

Guşeyi-gülzaridə fərşi-büsatın vəqtidir,
Tazədən təcdidi-üqdi-irtibatın vəqtidir,
Bəzmi-eydi-vəslə tərtibi-nişatın vəqtidir,
İnqizayi-fəsli-güldən ehtiyatın vəqtidir,
İlləti-eşqə ilaci-buqratın vəqtidir,
Rövzeyi-rizvan üçün seyri-seratın vəqtidir,
Aşiqü məşuq ara xoş inbisatın vəqtidir,
Hər zaman şirin-şirin ixtilatın vəqtidir,
Ey büti-tutizəban, gəl ki, məqalın istərəm!

Rahi eşqində sənin mən canü sərdən keçmişəm,
Parə-parə qılmışam könlü, ciyərdən keçmişəm,

Yanmışam pərvanələr tək, balü pərdən keçmişəm,
Hər səmənsa türrədən, hər simbərdən keçmişəm,
Dilbəri-qönçədəhan, nərgisnəzərdən keçmişəm,
Lalədən əl çəkmişəm, gülbərgi-tərdən keçmişəm,
Tərk edib dəhrin səfasın xeyrü şərdən keçmişəm,
Dişlər çün məxzəni-dürrü gühərdən keçmişəm,
Kovsəri unutmuşam, şəhdü şəkərdən keçmişəm,
Təşneyi-didarinəm, abi-zülalın istərəm!

Mən sənin bir aşiqi-biixtiyarın olmuşam,
Bidilü-bicanü bisəbrü qərarın olmuşam,
Şanəvəş müştaqi-zülfi-tabidarın olmuşam,
İncəlib saətbəsaət tarü marın olmuşam,
Uzun illər payibəndi-rəhgüzarın olmuşam,
Valehi-xali-zənəxdanü üzarın olmuşam,
Bir onalmaz dərdiməndi-intizarın olmuşam,
Şux nigahından düşüb şirin şikarın olmuşam,
Nazi-gərmü qəmzeyi-çeşmi-qəzalın istərəm!

Çünki müştaq olmuşam sən sərvi-siməndamə mən,
Eylərəm müjganımı xun ilə zərrin xamə mən,
Yazaram hər gün sənə mehri-vəfadən namə mən,
Çox dedim, həmrəng olum ol arizi-gülfamə mən,
Qoymaz amma çərxi-gərdün tez yetəm bu kamə mən,
Yox əcəb, desəm siyəh ru gərdişi-əyyamə mən,
Düşmüşəm sərhəlqeyi-zülfün ucundan damə mən,
Nə şərabi-ləligunə mayiləm, nə camə mən,
Tikmişəm göz ruzi-vəslindən gələn bayramə mən,
Mətləi-vəchində əbruyi-hilalın istərəm!

Ta gəlir gəh-gəh mənə badi-səbadən kağızın,
Canımı mədhuş edər ənbər həvadən kağızın,
Bərgi-gül tək düşməz ol ətri-fəzadən kağızın,
Sanki bir əttardir gəlmiş Xətadən kağızın,
Dəm vurar İsa kimi ömri-bəqadən kağızın,
Bir əcəb sərməşqdir mehri-vəfadən kağızın,
İşləsin qasid, kəsilməsin aradan kağızın,

Kəm deyildir lövhi-tumari-qəzadən kağızın,
Alsa min zinət əgər müşkin qəradən kağızın,
Üz bəyazında sənin öz xəttü xalın istərəm!

Göstəribdir, bilməzəm, ləlin nə ləzzət könlümə,
Dönə-dönə onu fikir etməkdir adət könlümə,
Ondan özgə gəlməyib şirin hekayət könlümə,
Firqətindən qalmayıbdır səbrü taqət könlümə,
Qamətindən ayrı zahirdir qiyamət könlümə,
Vədeyi-vəslin ha versin istiqamət könlümə,
Sən özün ta etməyincə bir inayət könlümə,
Çox yetər əğyaridən cövrü ihanət könlümə,
Sayeyi-sərvi-qədi-tuba misalın istərəm!

Çün müradi-xatirimdir ləli-ləbdən sudi-eşq,
Eylərəm hərdəm qara bağrımı xunaludi-eşq,
Ərşə başımdan çıxar tük başına min dudi-eşq,
Hər rəkimdir abi-sevdadən dolu bir rudi-eşq,
Zahidi-bibak tək mən olmazam mərdudi-eşq,
Haliya mülki-məlahətdə mənəm Məhmudi-eşq,
Var ümidim ki, olam mən müqtədai-cudi-eşq,
Həq mənə etmiş müsəlləm çünki hər mövcudi-eşq,
Vaqifəm, saldı məni atəşlərə Nəmrudi-eşq,
Qalmışam hicrində gülzari-vüsalın istərəm!

* * *

Ey rəngi-rüxi-alına heyran gülü lalə,
Can qurban ola sən kimi bir qaşi hilalə,
Vəh, cilvəyi-eşqin yetişibdir nə kəmalə,
Təhsin gətirər göydə məlayik bu cəmalə,
Seyr eləmişəm çox sənəmi-hurimisalə,
Amma nə deyim, olmamışam bəndə həvalə,
Bir sən kimi şəkkər dəhənü tuti məqalə,
Ta aşiq olubdur könül ol arizi-alə,
Həm silsileyi-kakilə, həm daneyi-xalə,
Daim çəkərəm sübhə təkin hər gecə nalə.

Səndən ki, cuda nuş edərəm sağəri-gülnar,
Tünd olma, dönüm gözlərinə, özgə səbəb var,
Ərz eyləyim, ol türreyi-ənbər güli-rüxsar
Qılmış məni bir müşkül olan dərdə giriftar.
Amma yanaram atəşə pərvanə kimi zar,
Yəni ki, olalı sənə mən aşiqi-didar,
Hərgiz deyil əhvalıma bir kimsə xəbərdar,
Naçar edərəm dərdi-dilim saqiyə izhar,
Ləlin ki, düşər yadıma, ey gözləri xummar,
Bu zövqlə gahi içərəm neçə piyalə.

Minavü sürahidə ki, vardır bu lətafət,
Gər çəkməyələr qamətü gərdən sənə nisbət,
Hərgiz mən edərdimmi dəxi onlara ülfət,
Hicrində yetər canıma çox möhnətü külfət,
İstərsə mənə gündə çəkib tiği-siyasət
Öldürmək üçün üz qoya qatil kimi firqət,
Şirin dəhənin ta ola bir dəm bizə qismət,
Sabir oluram var nə qədər canda səlamət,
Sənsiz, nə rəvadır, mən edim eyşlə işrət,
Bəsdir mənə şövqüm ki, olur cami-vüsalə.

Oxşar deyirəm, ləblərinə badeyi-gülgun,
Onunçün olur hər dəm ona rəğbətim əfzun,
Məzur tut, oldum belə şuridə cigərxun,
Çox olmuşam aşüftə, pərişan, dilü məhzun,
Zira ki, sənin daneyi-xalindəki əfsun
Dil mürğünü etmiş girehi-zülfünə məftun,
Cəm olsa əgər bir yerdə Loğmanü Fəlatun,
Yox çarə dəxi badədən özgə mənə əknun,
Hicran gülü dil xəstə olan dəmdə bu məcun
Bir vasitədir dəfi-qəmü dərdü məlalə.

Vaqif kimi kim, dəm vuraram zülfi-siyadən,
Əzamə düşər lərzə sərasər bu nəvadən,
Tənbur sifət cuş edərəm zərbi-həvadən,
İndi məni hər kəs görə olsa rüfəqadən,

Bir tarə bərabər tutar ol cəngi dütadən,
Qanun belədir firqeyi-üşşaqə binadən,
Sən cahilsən, yox hələ elmin bu ədadən,
Yoxdur xəbərin, heç deməzsən, füqəradən,
Bir kərrə düşəndə xəbər al badi-səbadən,
Saçın həvəsi gör ki, məni saldı nə halə?

* * *

Nagahan bir dərdə düşdün olmadı dərman, Cavad!
Yüz fəraqü həsrətü dərd ilə verdin can, Cavad!
Yetməyib məqsudə, getdin belə novcavan, Cavad!
Qaldı İbrahim xan, qan-yaş töküb giryan, Cavad!
Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

Ey əziza, bir cavan idin əcəb bəxşi-xuda,
İzzü rifət sahibi, bir xoşnüma, xəndan liqa,
Gəlməmişdir sən kimi pakizə tinət mütləqa,
Oldu heyfa dərdi-bidərman, bu dəhri-bivəfa,
Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

Neylədi, ey vay, sənə dövrani-kəc, bədruzigar,
Getdi gül rəngin solub, nazik vücudin xarü-zar,
Gəldi bəxtin qarə, oldu taci-təxtin tarümar
Neçə gözlər qaldı həsrət, neçə canlar intizar,
Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

Firqətindən xan baban qəddi bükülmüş dal olub,
Baş açıq, üz-sinə məcruh validən bədhal olub,
Fərş edib torpağa üz həmşirələr pamal olub,
Gündə bir məhşər qopar, gəl, gör necə əhval olub,

Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

Od düşüb, köşkü saraylar guyiya tağlar yanar,
Səs verir səngü şəcərlər, od tutub dağlar yanar,
Yasa girmiş səbzələr, geymiş qara bağlar, yanar,
Cümleyi-xəlqi-cahan qan yaş töküb ağlar, yanar,
Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

Dəmbədəm ağlar görənlər xəttü xalın yad edib,
Şövkətü şanın anıb, o qəddi-dalın yad edib,
Xoş deyib-danışmasın, əqlü kamalın yad edib,
Yandırır odlara cismin, gül camalın yad edib,
Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

Bu müsibətdə Qarabağa düşübdür va səsi,
Dərdi-bidərmanü dağü suzi-bipərva səsi,
Kim çıxar ərşi-bərinə ruzü şəb nala səsi,
Şəhrü səhradan kəsilməz ahü vaveyla səsi,
Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

Düşdü çün qurbət diyarə mənzilin, oldu uzaq,
Günbəgün artar ciyərdə atəşi-ahi-fəraq,
İstəyənlər eyləsin pəs halını kimdən soraq?
Atəşi-həsrət vücudin eylədikcə dağ-dağ,
Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

Ey düçeşmi-validə, ey qürrətül-eyni-pədər!
Ey sürüri-sinə, ey ruhi-rəvan, nuri-bəsər!

Qaldı həsrət, göz üzün görməz, könül bilməz xəbər,
Yan–yana ta əbəd büryan olub yanar ciyər,
Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

Yetmədin imdadına bu Vaqifin, dustağdır,
Fərşi–payindən cüda düşmüş, o, bir torpağdır,
Ahü fəryadı kəsilməz ta vücudi sağdır,
Od düşüb hərdəm yanar, cismi tamam pürdağdır;
Səndən ötrü, xan Cavad, sərdar Cavad, sultan Cavad!
Sərbəsər geysin qara bundan geri dövran, Cavad!
Oldu çün nazik vücudin xak ilə yeksan, Cavad!

# MƏHƏMMƏD HÜSEYN XAN MÜŞTAQ

*XVIII əsrdə Şəki xanı olan Müştaq Hacı Çələbi xanın nəvəsi, Həsən ağanın oğludur. Sarayında bir sıra şairi himayə etmiş, Vaqif və Vidadi ilə dostluq münasibətləri olmuşdur. İyirmi iki il hakimiyyət sürən Müştaq 1780-ci ildə əmisi Əbdülqadir xan tərəfindən öldürülmüşdür. Bu hadisə Vidadinin "Müsibətnamə" şerində əks olunmuşdur.*

## MÜXƏMMƏSLƏR

Əla, ey təhniyyətgah mədilət sultanı, xoş gəldin,
Xəyalım şəhrinin sərdari-valaşanı, xoş gəldin,
Gözüm, könlüm əzizi, sevgili cananı xoş gəldin,
Səvadi-Misri-camın Yusifi-Kənanı, xoş gəldin,
Münəvvər eylədin bu dideyi-giryanı, xoş gəldin.

Səni badi-səbamı eylədi agah halımdan,
Eşitdin, yoxsa bir səs naleyi-bietidalımdan?
Bu müddətdə xəyalin çıxmışdı xud xəyalımdan,
Deyim kim, ol sənə gətdi xəbər verdi məlalımdan,
Kim ərz etdi gətirmək dərdimə dərmanı, xoş gəldin.

Çəkib dil intizar, olmuşdu xəstə çeşmi-şəhla tək,
Pərişan idi fikrim türreyi-zülfi-səmənsa tək,
Cigər dönmüşdü qanə, rəgi-gülrüxsari-həmra tək,
Xəmi-əbrunu ta gördüm düzəldi qamətim ya tək,
Sənin tək beylə ceyranın olum qurbanı, xoş gəldin.

Şəha, lütfün füzun olsun ki, əltafi-ziyad etdin,
Bu gün Müştaqi-didarın olanı pürmurad etdin,
Əzəldən ha unutmuşdun sonra da ki, yad etdin,
Qədəm basdın səadətlə bizim şəhri abad etdin,
Şərəfli bəzmi iqbalın səri-tabanı, xoş gəldin.

## MOLLA PƏNAH VAQİFƏ CAVAB

Gəlmiş ol alicənabın qasidi, istər tüfəng,
Ey gözüm, nəzzarə qıl, bax hər yana, axtər tüfəng,
Eyləsin tap kim, görənlər söyləsin, behtər tüfəng,
Kamil olmuş cövhəri üstündə nəqşi zər tüfəng,
Neylər, aya, bilmənəm yarəb, o şuxü şər tüfəng?

Yox ikən zatı cahanda, qıldı Əflatun anı,
Gör nələr saldı xəlayiq içrə, tutsun xun anı,
Hər gələnlər ixtiyarən qıldılar əfzun anı,
Eyləmişlər qətli-nəfs üçün həmişə çün anı,
Anın üçün növhə salmış aləmə, ağlər tüfəng.

Yayı təşbih etdilər xubruların əbrusuna,
Tiri müjganə, dönüm ey gözlərin cadusuna,
Xəncər ilə nizə kimdir, düşələr qayğusuna,
Çərxə də dəysə başı, dəyməz anın pabusuna,
Hansı bir əndamı simin üzvinə bənzər tüfəng.

Sən Qarabağ içrə qurmuşsan tələb meydanını,
Tutmusan dildə olan vədü vəfa mizanını,
Görməyibsən əsbi-ehsanın məgər cövlanını,
Bir tüfəngin bu qədər sən çəkmisən hicranını,
Eylədim təslim Rafe çeşmi-pa bərsər tüfəng.

Şerinə əhsən ki, yetməz hiç bir əşar ona,
Hər kimin var isə həddi, söyləsin göftar ona,
Kimsə ləb tərpətməsin kim, gəlməz istisfar ona,
Eybdir Müştaqdən bu sözləri izhar ona,
Tutmasın nəzmi rəkakət, var isə kəmtər, tüfəng.

## QOŞMALAR

Badi-səba, apar mənim peyğamım,
Başın üçün o dildarə xəbər ver,
Yalvar, yapış, ağlı, sızla, ya dəxi
Ərzi-halım sitəmkarə xəbər ver.

Neysan təki çeşmim döndi yağına,
Rəhmin gəlsin sinəm üstə dağına,
Yetcək öpüb əlin, düş ayağına,
Dön başına varə-varə xəbər ver.

Çərxi-fələk xub durubdur qəsdimə,
Xudam, sən də bir əl yetir dəstimə,
Qəm ləşgəri hücum etdi üstümə,
Alişanə, o sərdarə xəbər ver.

Müştaqiyəm, ömrüm getdi talana,
Qarğamışam məni dərdə salana,
İllər ayrısına həsrət qalana,
Gözü yolda intizarə xəbər ver.

* * *

Qəmər əbrin görüb dil xəcil olmuş,
Günbəgün incəlmiş, hilalə düşmüş,
Günəş hüsnün müqabili olmayıb,
Şərməndə oluban zəvalə düşmüş.

Yoxdur ahu gözlüm sən tək dağ ara,
Qoyma əndəlibi getsin zağ ara,
Ərər qəddin görüb gəldim bağ ara,
Gözüm bir sən təki nihalə düşmüş.

Fərağın canıma saldı bir atəş,
Hicranından könül oldu əlatəş,
Dərdi-ğəm yükünə oldum bərakəş,
Görənlər eşitdi qəhalə düşmüş.

Gözü cəllad, qaşı fitnə əyağı,
Yeri vardır gözüm üstə əyağı.
Məni sevdiyimdən etdi a yağı
Gər gör ki, aşiqin nə halə düşmüş.

Müştaqiyəm qurtulmanam xiffətdən
Daim xali olman dərdü möhnətdən.
Can üzüldü arizuyi-firqətdən
Könül quşu qeyri xəyalə düşmüş.

* * *

Sevdim bir cavan on dörd yaşında,
O türfə çağına qurban olduğum.
Günəş tək aləmi qıldı münəvvər,
Cəbini ağına qurban olduğum.

Rəqibi görəndə eylədi pürxaş,
Dağıtdı hər tərəf manəndi-xaşxaş,
Səfheyi-ruxsara çəkəndə nəqqaş,
Qaşları tağına qurban olduğum.

Sinəm o gözəlin çarpaz dağıdır,
Məclisi eyş içrə türfə çağıdır,
Şux nazü qəmzəsi can almağıdır,
Müjgan sadağına qurban olduğum.

Ağ yüzdə xalları filfilə nisbət,
Can quşu bağında bülbülə nisbət,
Ləbləri çiy düşmüş bir gülə nisbət,
Əhmər yanağına qurban olduğum.

Sevdim canü dildən Müştağı oldum,
Həsrətin çəkməkdən üç dağı oldum,
O cəllad gözlərin qonağı oldum,
Bilmən nəsağına qurban olduğum.

## TƏCNİS

Ey əbrusi kaman, müjganı xədəng,
Durubsan qəsdimə yaraq ilə sən.
Rəvamıdır bu şikəstə könlümü,
Ğəmzən qılıcıiylən yara qılasan.

Həm söhbət bilirsən, həm dəm bilirsən,
Cigərim zəxminə həmdəm bilirsən,
Rəqibi özünə həmdəm bilirsən,
Haçan gələcəksən yar, ağıla sən.

Kim dinər hüsnünə sonam oduna,
Sənan tərsa sevdi girdi o duna,
Pərvanəni saldın hicrin oduna,
Bayqunun dilini yara qılasan.

Yüzü qaraları yüz ağ eyləmə,
Bülbülün həmdəmin Yüzaq eyləmə,
Aşiqi kuyindən yuzaq eyləmə,
Tərəhhüm çağıdır yara qılasan.

Tutma camalına hər ayinə sən,
Yetmə hər nakəsin hərayinə sən,
Öldürsən Müştaqi hər ay yenə sən,
Barı gəl üstünə yaraqilə sən.

## QƏZƏL

Həbibim, qəddi-mövzunun əlifdir dal arasında,
Vücudun həzrəti-həq saxlasın iqbal arasında.

İşim düşvardır hicran əlindən, xeyli müşküldür,
Məni-biçarəyə bir iltifat et, hal arasında.

Mənim qətlimdədir kafir, gəlin qoymun, müsəlmanlar,
Məgər yox aşiq ilə məşuqənin bir dal arasında.

Qaşın bir yanə səf çəkmiş, müjən bir yan, iki ləşgər,
Durubdur bir-biriylə cəng edərlər xal arasında.

Edərdim məsləhət mən bu iki xunrizə, Müştaqi
Dedi hatif mənə, yardırma başın qal arasında.

## ŞƏKİLİ NƏBİ

*XVIII əsrdə, Şəki xanı Hüseyn xan Müştaqın sarayında yaşamışdır. Tarixi mənzumələrində dövrün hadisə və şəxsiyyətləri haqqında kifayət qədər dürüst təsəvvür yarada bilmişdir. Həm əruz, həm də heca vəznində şeirlər yazmışdır.*

### QƏZƏL

Bu nə qaş, bu nə göz, qibləm bu nə şivə, nə iymadır,
Qapında məstü heyran, xəlqi-aləm xoşnümadır.

Bu nə xali-bəlacudur, bu nə qəddi-dilaradır,
Cahan içrə salıbsan bu nə fitnə, bu nə qovğadır?

Nəzər qılmazsan əhli-eşqə nazü qəmzə ilə sən,
Səni məğrur edibdir bu gözəllik, türfə dünyadır.

Dəhanın şərbəti ilə şəkərdən daxı şirindir,
Yanağın bərgi-güldən daxı əla, daxı zibadır.

Gəzən kuyində üryan hər zaman, ey Leyliyi-aləm,
Nəbi biçarədir bu, yoxsa kim, Məcnuni-şeydadır?

### QOŞMALAR

Bir gül yüzlü yarə həsbənd olmuşam,
Nəsrin buxağına qurban olduğum,
Zülmat könlümü qıldı münəvvər,
Alnı çırağına qurban olduğum.

Gülzari-hüsnündə aşiqi-bidil,
Ğönçələr görübən eylədi ğülğül,
Açılmış şükufə, qönçə, qızılgül,
Tilingin tağına qurban olduğum.

Sənsən fikrü zikrim, gözəl, nigarım,
Müsəlləmdir sənə var ixtiyarım,
Mən əsirəm sənin eşqində, yarım,
Duzna, duzağına qurban olduğum.

Xəlq eylədi anı ustadi-əzəl,
Gözəllikdə bibədəldir, bibədəl,
Dişləri sanki bir dürri-müseyqəl,
Ləl dodağına qurban olduğum.

Qoynu cənnət, bağü bustan mədəni,
Tər şamama, narınc, turunc məskəni,
Allah üçün, bağban, incitmə məni,
O bağın tağına qurban olduğum.

Utandırır yanağı, qızardır güli,
Pərişanhal etmiş saçı sünbüli,
Dadırmış ləbindən mən xəstə dili,
Kövsər bulağına qurban olduğum.

İncimən cövrindən çəksəm cəfasın,
Bulmuşam vəslində dərdim şəfasın,
Vəqti-tüluunda yırtmış yaxasın,
Köksünün ağına qurban olduğum.

Yüzi günəş, aləm içrə aşikar,
Zəvi kamil, hər tərəfə intişar,
Saxlamışam sinəm içrə yadigar,
Dügünü dağına qurban olduğum.

Siyəhdir başında kakil mükəhhəl,
Payi-busi üçün olmuş mütəvvəl,
Tökülmüş gərdanə zülfi-müsəlsəl,
Ənbər buxağına qurban olduğum.

Şikəstə Nəbiyəm, aşiqi-dər hal,
Eşqi-məcazidən etdim intiqal,
Gərdişi-devrandan görməsin zaval,
Nocavan çağına qurban olduğum.

* * *

Yar olub mənimlən həmdəm, olmadan,
Dərdimi yetirdin yüzə, sevdigim.
Səg rəqib gələndə deyübən gülər,
Mən gələndə çıxmaz yüzə sevdigim.

Heç yadımdan çıxmaz şirin sözlərin,
Aya, günə tənə edər yüzlərin,
Yağı əbrulərin, cəllad gözlərin,
İstər ki, canımı üzə sevdigim.

Padşahlıq yaraşır yarın şəstinə,
Əskəri-ğəm heç varmasın üstünə,
Qədəmin basıban didəm üstünə,
İstərəm seyr edəm, gəzə sevdigim.

Xəstə olan könlüm cananın istər,
Eşq oduna yanıb, oldum xakistər,
Tanrı üçün hər dəm çıxıban göstər,
Camali-eydini bizə sevdigim.

Qurban olum cana, qara qaşına,
Sirrini vergilən öz sirdaşına,
Nəbi bülbül tək dolanır başına,
Aşiqdir sən tək gül yüzə, sevdigim.

## MÜXƏMMƏSLƏR

Həmdülillah, fələyin gərdişi yar oldu yenə,
Bəhsi-nuşadi de kim eyşi-mədar oldu yenə,
Müddəilər yürəgi dərdi-qübar oldu yenə,
Xeyli-gümrahə siyasət nəki var, oldu yenə,
Mənzili-əhli-nifaq, əfsəli-nar oldu yenə.

Bir sitəmpeşə dəni feli-bəd adab qılıb,
Tutdu bütxanəyə üz, məbədi-mehrab qılıb,

Qırdı nahəq bəşəri daxili-seylab qılıb,
Tutdu lənət yuxusu, uydu zəhri-xab qılıb,
Bəstəri-xabgəhi xaki-məzar oldu yenə.

Bir pünər mədəni, novrəstə cavan oldu zühur,
Nəsli-övladi-şərəf, sahibi-idrak-şüur,
Oldu tənbihi-siyasətgəri-ərbaba fücur,
Qaldı canında həsudun ələmi ta dəmi-sur,
Düşmənin piçi-səri məskəni-mar oldu yenə.

Ər olan doğru gərək, bilmənəm əfsanə sözü,
Ərzi-sərdar edibən, söylədi mərdanə sözü,
Xəbəri-cürətini getdi Dağıstanə sözü,
Dedi sərkərdələrə aqilü fərzanə sözü,
Sülhü mişaq oluban qövlü qərar oldu yenə.

Çünki xan oldu Hüseyn ümməti-Şirvanə bu gün,
Gəldi münqad oluban cümləsi fərmanə bu gün,
Oldu gülzari-İrəm məmuri viranə bu gün,
Bülbülü qumri səda saldı gülüstanə bu gün,
Getdi əyyami-şita fəslü bahar oldu yenə.

Gör nə məhv oldu cahandan şəri-iblisü ləin,
Tabei cümlə xəcalət çəkibən oldu həzin,
Mürğizar oldu sərasər çəməni-ruyi-zəmin,
Çıxdı seyrinə əcəb huriyi-firdovsi-bərin,
Söhbəti-mehri-cəbin lalə üzar oldu yenə.

Düşdi dövrani-siyasət, deməsin kimsə xilaf,
Sözümün sidqinə şahid əsəri-“Nun” ilə “Kaf”,
Bu bəşarət açılıb getdi xəbər Qaf-bəqaf,
Ey dil, aşüftə bu dəm nuş edə gör badeyi-saf,
Mövsimi-tibü turab, məstü xumar oldu yenə.

Ey Nəbi, eylədi çərxin bizə dövranı vəfa,
Doğrudur bircə küdurətdən olur iki səfa,
Ayətin mənisi bu, təfsir edən həm Mustafa,
Baisi-rəhmət olub çəkdiyimiz cövrü cəfa,
Hicrü firqət ələmi vəsli-nigar oldu yenə.

* * *

Əzmi-cözm etdi Hüseyn xan xani-Şirvan Küngütə,
Yerbəyer tutdurdu rahi, getdi pünhan Küngütə,
Çəkdi malı Dost Məhəmməd, saldı talan Küngütə,
Yari-qəmxar olmadı hərgiz bir insan Küngütə,
Cövrü zülm oldu cəyazi-lütfü ehsan Küngütə.

Dövləti idbarə döndü, çün kələk yar olmadı,
Əhdü peyman tərk olundu, qədri-iqrar olmadı,
Cürm yox, düşmən qəvi, hakim havadar olmadı,
Ədli-divan hökm olub, təkbihi-bədkar olmadı,
Qeyrilər qıldı fəsadı, dəydi nöqsan Küngütə.

Mərdümi-əhli-inadın qövli olmaz istivar,
Məsləhət tövrini bilməz hər ləimi-nabəkar,
Yüz fəsadın babın örtər, bir həkimi-namidar,
Bir neçə müfsid Şəkini eylədi bietibar,
Sikkədən saldı Noxunu, Qıldı böhtan Küngütə.

Müddət idi bu arada bir məlalət yox idi,
Hər kişi həddin bilib, meyli-rəyasət yox idi,
Hakimin hökmündə bir tərki-ədalət yox idi,
Müddəilərin işində bu ədavət yox idi,
Saldı hər dəm fitnəni bir məkri-fəttan Küngütə.

Bəzi kəslər bu hekayətdən xəbərdar oldular,
Rəhmü sidqiyyət mətaindən səbəbkar oldular,
Qeyrəti pamal edib bəxti-nigünsar oldular,
Qonşu həqqin görməyib hərdəm günəhkar oldular,
Xar olub xiclət çəkərlər, düşsə dövran Küngütə.

Bəhsi-laf urmaq qədərdən kar hər nadan deyil,
Ta ki, həqdən olmadan bir qövlü fel imkan deyil,
Böylə yazılmış əzəldən əmri-bifərman deyil,
Doğru yoldan bu siyasət qüdrəti-insan deyil,
Gəldi təqdiri-qəzadən qəhri-yəzdan Küngütə.

Ey Nəbi, bir dəm təssüb şəhrin abad eylədim,
Hörməti-nanü nəməkdir, həqqini yad eylədim,
Ərzi-raz edib, əmirə dadü fəryad eylədim,
Çarəsiz qaldım, fərari xəlqə irşad eylədim,
Sülh olub, cəng olmayıb, ta düşməsin qan Küngütə.

* * *

Cavanlar sərvəri məqtul olubdur, xasü am ağlar,
Kəmali-cürətin yad eyləyib, əhli-kəlam ağlar,
Ədniyalər gülər gahi, əalilər müdam ağlar,
Həsudi şad olur hərdəm, mühibbi sübhü şam ağlar,
Təəssübdən yanar canı, bilən namusu nam, ağlar.

Müsəlləm oldu elmilə şücaət lütfü mövladən,
Sədayi-hilmi-xoşnudi bülənd oldu Məsihadən,
İmarət qıldı məscidlər, dönüb kafir kəlisadən,
Əcəb kani-ədalət, ey diriğa, getdi dünyadən,
Anınçün ol Məhəmməd, Mehdiyi-sahib-nizam ağlar.

Bilib məhrəm gətirdilər Qumuq xanını Şirvanə,
Vəli, iblisi-məlun tək fəsadı saldı gər yanə,
Ləvəndlik heyzü bidinlik bir ad oldu Dağıstanə,
Şəhid oldu gözəl canlar, xəlayiq düşdü əfğanə,
Yanar gög dudi-ahımdan, çəkər həsrət tamam ağlar.

Daxı ol pürdil, ey canlar, fəna xabindən ayılmaz,
Rəyasət gülşəni içrə anın tək bir gül açılmaz,
Bu mənini qanıb dərk eyləməz, hər bir yetən bilməz,
Məlalət bəzi əhyayə, nədəndir kim, sər qılmaz,
Məzaristani-aləmdə rəmim olmuş izam ağlar.

Xoş o günlər, anın dövründə xəlq andan əman oldu,
Vəli, mərhum olandan sonra, vəhşi tək rəman oldu,
Yetən fisqü fəsadə meyl edib, işlər yəman oldu,
Nişani-ruzi-məhşər faş olub, axırzəman oldu,
İbadətxanələr yalqız qalıb, beyt-ül həram ağlar.

Əmiri-sahibi-tədbir, mərdi-nadiri-dövran,
Olurmu bir vilayətdə, anın tək sərvəri-meydan,

Nəsib etdin xuda cənnət içində neməti-əlvan,
Əzizin ruhinə hər dəm bağışlar oxuyub Quran
Duayi-xeyr edər dildən, Nəbi kəmtər ğulam ağlar.

* * *

Ey bəyim, rəngin otağın bəzmi-ürfandır bu gün,
Nemətin nuşi-müsafir, quti-mehmandır bu gün,
Göftiguyi-rifətin bihəddü payandır bu gün,
Same olgil söyləyim mən, gör nə dastandır bu gün,
Şükri-həq etmək gərəkdir, yaxşı dövrandır bu gün.

Şah Nadir ki, gətirdi üstünə yüz min səvar,
Sən bərabər cəngə durdun, kimdə var bu ixtiyar.
Döndü getdi xiclətindən, axir oldu şərmisar,
Rəhnümadır ənbiya, nüsrət verən pərvərdigar,
Dəstgirin şahi-mərdan, şuri-yəzdandır bu gün.

Valilər cəngin yarağın qıldılar tədbir ilən,
Dər zaman saldın savaşı kafiri-bipir ilən,
Gör nə bərbad oldu bidin, hikməti-təqdir ilən,
Kimini tutdun diri, kəsdin kimin şəmşir ilən,
Zəxmidari-seyfi-müslüm kafiristandır bu gün.

Doğrudur çün etiqadın, ol xudadır rəhnümun,
Bu səfa keyfiyyətin fəhm edə bilməz hər cünun,
Sən özün kani-hücaət, dövlətin həddən bürun,
Oldu təqdiri-qəzadən günbəgün qədrin füzun,
Əzmigahi-payitəxtin səqfi-keyvandır bu gün.

Hasidü bədxah düşmən baş ikən pay oldular,
Dərdi-möhnət həmnişini fikrə həmtay oldular,
Bəxti pamal eyləyib, idbar ilən bay oldular,
Hər biri qəddin əyib, təzim üçün yay oldular,
Canü dildən xidmət eylər, bəndə fərmandır bu gün.
Çün xərab olmuş məhəllən oldu abadan sənin,

Sərbəsər tutdu cahanı, ədl ilən adın sənin,
Düşmənin yar-aşina oldu tamam yadın sənin,

Afərin Ağakişi, dilbəndi-övladın sənin,
Pəhləvanlar sərfərazı mərdi-meydandır bu gün.

Atı yelpa, zərbi heydər yaş ilən bir novcavan,
Tiği qate sükti yegrək, cəng içində kardan,
Köftüguyi bibədəldir, xülqi-xoyi binişan,
Azimi-dəccali-bidin, Mehdiyi-sahib-zaman,
Məzhəri-əmnü ədalət, əhdü peymandır bu gün.

Çünki Sədrəddin əfəndi qəmküsar oldu sana,
Bəhri-elmü mərifət tədbirə yar oldu sana,
Sidqü dildən həmdəmi-Leylü nəhar oldu sana,
Baisi-minqadi-aləm hər nə var oldu sana,
Mürşidi-ustadi-kamil, piri-Şirvandır bu gün.

Qasimi Mirzayi əzəmdir vəzirin, nikü nam,
Katibi-mişkin-rəqəm, kani-fəsahət, xoş əlam,
Pərdə-puşi eybi-miskin, iftixari-kasü am,
Sərvəri-dəsturi-aləm, münşiyi-aliməqam,
Hər sözü bir dürrü gövhər, ləlü mərcandır bu gün.

Yusif oğlu qulluğunda nazirindir bimisal,
Məsləhət binü xəlayiq, nöqtədanü xoşməqal,
Gəlməmiş ruyi-zəminə böylə mərdi-pürkəmal,
Anı lütfindən yaratmışdır xudayi-la-yəzal,
Sahibi-göftari-xəlvət, sirri-pünhandır bu gün.

Layiqi öz halıdır həq dönə, dövlət verməsə,
Bu əmanət sitvəsi layiq degil hər bir kəsə,
Əhli-ürfandır, bunu hər kim ki, idrak eyləsə,
Çün təmam oldu əzəl həmmam, məscid, mədrəsə,
Vəqti-divari-müzəyyən, nəqşi-eyvandır bu gün.

Mən Nəbiyəm, bəxti dun, ey lütfü ehsan mədəni,
Namurad olmaz cahanda, kim sevər candan səni,
Dövri-dərgah etmə, məhrum eyləyib bu bəndəni,
Bəxş qıl, təqsirü üzrəm, salma gözdən gəl bəni,
Xatirim dövran əlindən xeyli virandır bu gün.

# MÜNDƏRİCAT

SAİB TƏBRİZİ

Azərbaycanca şeirləri



Qəzəllər (*Farscadan çevirəni Balaş Azəroğlu*)

## QÖVSİ TƏBRİZİ

ŞAKİR ŞİRVANİ

## MƏHCUR ŞİRVANİ



## ARİF ŞİRVANİ



## AĞA MƏSİH ŞİRVANİ

SARI AŞIQ



MOLLA VƏLİ VİDADİ

MOLLA PƏNAH VAQİF

ŞƏKİLİ NƏBİ

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktor: | *Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Rəşad Həmidov* |
| Korrektor: | *Ceyran Abbasova* |

Yığılmağa verilmişdir 15.10.2004. Çapa imzalanmışdır 16.04.2005.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 28,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 81.

Kitab "PROMAT" mətbəəsində çap olunmuşdur.